**AZƏRBAYCAN RESPUBLİKASI**

---

**THE REPUBLIC OF AZERBAIJAN**

# ELMİ İŞ

**Beynəlxalq Elmi Jurnal**

**Xüsusi Buraxılış**

# SCIENTIFIC WORK

**International Scientific Journal**

**Special Issue**

**ELM**
**Gənclərin Sosial-İntellektual İnkişafına Dəstək**
**İctimai birliyinin təsis edilməsinin 10 illik yubileyinə həsr olunmuş**
**Gənc alim və tədqiqatçıların elmi əsərləri**

**10.04.2025**

**SCIENCE**
**Supporting the Social Intellectual Development of Youth Social Unity**
**dedicated to the 10 th anniversary of establishment**
**of Scientific Works of young scientists and researchers**

**10.04.2025**

**Bakı – Baku**
**2025**

## NATURAL SCIENCES



## MATHEMATICS AND MECHANICAL SCIENCES

ISSN: 2663-4619
e-ISSN: 2708-986X

**HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR**

**HUMANITIES AND SOCIAL SCIENCES**

DOI: https://doi.org/10.36719/2663-4619/113/9-18

**Aynurə Kərimova**
Azərbaycan Respublikası Ekologiya və Təbii Sərvətlər Nazirliyi
https://orcid.org/0009-0001-6246-0200
aynura.karimova@eco.gov.az

# Ətraf mühitin idarə edilməsinin qanunvericilik əsasları-qlobal çağrışlar fonunda hüquqi təminatda yeni yanaşmalar

**Xülasə**

Ətraf mühitlə insan cəmiyyəti arasında münasibətlərin tənzimlənməsi məqsədilə ekoloji qanunvericiliyin günün tələblərinə uyğunlaşdırılmasının zəruriliyi qlobal səviyyədə qəbul edilir və müasir çağrışlar fonunda bu sahədə yeni yanaşmalar tətbiq edilir.

Müasir dövrdə ayrılıqda bir dövlət üçün ekoloji təhlükəsizlik sisteminin yaradılması qeyri-mümkündür. Yalnız birgə səylər sayəsində müvafiq hüquqi rejim yaratmaqla, bugünkü və gələcək nəsillərin sağlam yaşayışını və inkişafını təmin etmək olar. Odur ki, ətraf mühitin qorunmasında və təbii ehtiyatların mühafizəsində beynəlxalq ekologiya hüququ həlledici rol oynamalıdır.

İqtisadiyyatın sürətli inkişafı ətraf mühitin modern və çevik idarə olunmasını zəruri etmişdir. Bu baxımdan idarəetmə prosesində qanunvericilik aktlarında yeni yanaşmaların tətbiqi ətraf mühitin mühafizəsi istiqamətində həyata keçirilən tədbirlərin səmərəliliyini artırmışdır.

***Açar sözlər:*** *müasir çağırışlar, qanunvericilik aktları, beynəlxalq hüquq, hüquqi rejim, normativ hüquqi aktlar, ekoloji menecment, dayanıqlılıq, ekoloji məsuliyyət, ekoloji hüquqpozmalar, təbiət hüququ, yaşıl iqtisadiyyat*

**Aynura Karimova**
Ministry of Ecology and Natural Resources of the Republic of Azerbaijan
https://orcid.org/0009-0001-6246-0200
aynura.karimova@eco.gov.az

# Legislative Foundations of Environmental Management - New Approaches to Legal Security Against the Background of Global Challenges

**Abstract**

The need to adapt environmental legislation to current requirements in order to regulate the relationship between the environment and human society is recognized globally. New approaches are being applied in this area against the backdrop of modern challenges.

In the modern era, it is impossible for a single state to create an ecological security system on its own. Only through joint efforts can the health and development of present and future generations be ensured by establishing an appropriate legal regime. Therefore, international ecological law should play a decisive role in environmental protection and the conservation of natural resources.

The rapid development of the economy has necessitated modern and flexible environmental management. In this regard, the implementation of new approaches in legislative acts has enhanced the effectiveness of measures taken to protect the environment.

***Keywords:*** *modern challenges, legislative acts, international law, legal regime, regulatory legal acts, environmental management, sustainability, environmental responsibility, environmental violations, natural law, green economy*

## Giriş

İqtisadiyyatın bütün sahələrinin, xüsusən sənayenin sürətli inkişafı ətraf mühitə mənfi təsirinin artması və təbii sərvətlərin həddindən artıq istismarı ilə nəticələnmiş, təbii ehtiyatlardan səmərəli istifadə, su, torpaq və atmosfer havasının çirklənmədən mühafizə edilməsi qlobal problemə çevrilmişdir.

İstehlakın kəskin artması, qlobal istiləşmə, gələcəkdə bərpası mümkün olmayacaq təbii ehtiyatların tükənməyə başlaması kimi narahatlıq doğuran məsələlər ətraf mühitlə bağlı fəaliyyətlərdə dəyişiklik zərurətini ortaya çıxartmışdır.

Ekoloji təhlükəsiz və iqtisadi baxımdan optimal modelin-davamlı inkişafın formalaşdırılması qlobal ekoloji böhran şəraitində iqtisadiyyat, cəmiyyət və ətraf mühit arasında zəruri balansın saxlanmasını təmin edəcəkdir.

Bu kontekstdə hal-hazırda əsas prioritet davamlı inkişafın məqsədlərinin reallaşdırılması üzrə qlobal, regional və milli alətlərin əlaqələndirilməsi və bir-birini tamamlamasıdır. Bununla yanaşı, ətraf mühitin mühafizəsi və ekoloji təhlükəsizliyin təmin edilməsi istiqamətlərində işlərin yeni keyfiyyət mərhələsinə keçməsi prioritet məsələ kimi ön plana çıxmalıdır (Sultan-zadə, 2015).

Ətraf mühitlə insan cəmiyyəti arasında münasibətlərin tənzimlənməsi məqsədilə ekoloji qanunvericiliyin günün tələblərinə uyğunlaşdırılmasının zəruriliyi qlobal səviyyədə qəbul edilir və müasir çağrışlar fonunda bu sahədə yeni yanaşmalar tətbiq edilir.

Azərbaycanda ətraf mühit problemlərinin həlli istiqamətində genişmiqyaslı işlərin görülməsi, ekoloji vəziyyətin yaxşılaşdırılmasına yönəlmiş dövlət siyasəti ölkənin uzunmüddətli inkişaf strategiyasının mühüm tərkib hissəsidir.

Bu istiqamətdə ətraf mühitin mühafizəsinə yönəlmiş qanunvericilik aktlarında zamanın tələblərinə, zərurətə uyğun davamlı şəkildə müvafiq dəyişikliklər edilir. Əhalinin maarifləndirilməsi, dövlət-özəl tərəfdaşlığı, insanların məsuliyyət səviyyəsinin artırılması, ətraf mühitin qorunması ilə bağlı öhdəliklərin müəyyənləşdirilməsi və s. sahələrdə fəaliyyətlərin qanunvericilik əsasları təkmilləşdirilir (Boreyko, 2001).

**Tədqiqat**

Qısamüddətli və ortamüddətli iqtisadi, ekoloji və sosial nəticələr və ehtimal edilən fəsadlar nəzərə alınmaqla qərarların qəbul edilməsi və bu prosesdə alternativ variantların nəzərə alınması, ətraf mühit sahəsində qərarlar hazırlanarkən bütün maraqlı tərəflərin cəlb edilməsi, ətraf mühitin hər hansı komponentinin bərpa olunmayan dərəcədə pozulmasına səbəb ola biləcək fəaliyyətin qarşısının alınması əsas prinsiplər kimi qəbul edilmişdir.

Əsas missiya insanların ekoloji təmiz mühitdə yaşamasını təmin etmək məqsədilə ekosistemlərin qorunması, təbii sərvətlərdən səmərəli istifadə olunması ilə dayanıqlı inkişafın təmin edilməsi, ətraf mühitə minimal zərərli təsir, onun ilkin vəziyyətinin bərpası və qorunmasından ibarətdir.

Strateji baxış ölkə ərazisində ətraf mühitlə bağlı mövcud problemlərin həll olunması ilə ekoloji vəziyyətin yaxşılaşdırılması, ətraf mühit komponentlərinin mühafizə edilməsi, əhalinin təbii ekoloji mühitdə yaşamaq hüququnun təmin edilməsi və təbii sərvətlərdən səmərəli istifadə olunmasına nail olmaqdır (Borisov, Belousova, Vinokurov, 1985).

Ölkədə təmiz ekoloji mühitin dəstəklənməsi, mövcud təbii resurslardan dayanıqlı və səmərəli istifadə ilə yanaşı, bərpa olunan enerji mənbələrinin dövriyyəyə cəlbi imkanlarının genişləndirilməsi, ətraf mühitin mühafizəsi, insanların ekoloji təbii mühitdə yaşamasının təmin edilməsi hazırda aparılan sosial-iqtisadi islahatlarda mühüm yer tutur.

Son illər Azərbaycanda ətraf mühitlə bağlı qəbul olunmuş dövlət proqramlarının icrasına diqqətin artırılması, mövcud ekoloji problemlərin daha səmərəli həll edilməsi məqsədilə müvafiq fərman və sərəncamların imzalanması bu sahənin ölkədə prioritet olduğunu göstərir.

Ölkəmizin sosial-iqtisadi islahatlara əsaslanan inkişaf konsepsiyasında yaşıl iqtisadiyyata keçid mühüm yer tutur. Ətraf mühitlə iqtisadiyyat arasında balanslaşdırılmış siyasətin aparılması, "yaşıl artım"la bağlı innovativ metodların tətbiqi, ətraf mühitə dost sənayeləşmənin təşviqi əsas hədəflərdəndir (Ivanov, 2003).

Yaşıl və dayanıqlı inkişaf konsepsiyasının tətbiqi, ətraf mühit məsuliyyəti və sosial məsuliyyətlilik hər bir şirkətdə idarəçiliyin təməl prinsiplərini təşkil etməlidir. Böyük sənaye müəssisələrinin

ISSN: 2663-4619
e-ISSN: 2708-986X

qurulması və digər irihəcmli layihələrə maliyyə vəsaitlərinin ayrılması zamanı ekoloji göstəricilərin nəzərə alınması zəruridir. Bu baxımdan ekoloji, sosial və idarəetmə məsələləri ilə bağlı prinsiplərin inkişafı ölkəmizdə diqqət mərkəzindədir.

Yaşıl iqtisadiyyata keçid mərhələsində resursa qənaət, xammaldan təkrar istifadə, kənd təsərrüfatında ekoloji təmiz istehsal prinsiplərinin, sənayedə ətraf mühitə dost texnologiyaların tətbiqi, su hövzələrinin, bioloji müxtəlifliyin və meşələrin qorunması kimi məsələlərdə daha məsuliyyətlə hərəkət etməli, beynəlxalq əməkdaşlığı gücləndirməli və ekoloji problemlərin həllinə gətirib çıxara biləcək bütün imkanlardan istifadə olunmalıdır (Primak, 2002).

Sosial-iqtisadi inkişafla əlaqədar ətraf mühitin artan təsirlərdən mühafizəsi və ekoloji vəziyyətin yaxşılaşdırılmasında bütün maraqlı tərəflər iştirak etməli, özəl sektor və vətəndaş cəmiyyəti institutları ilə səmərəli əməkdaşlıq qurulmalı, ətraf mühitin deqradasiyasına səbəb ola biləcək fəaliyyətlərin qarşısının alınması istiqamətində tədbirlər daha da gücləndirilməlidir.

"Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" sənədində yeni strateji mərhələdə iqtisadiyyatın davamlı və yüksək templərlə artması fonunda qlobal iqlim dəyişikliklərinə cavab verən və əhalinin sağlam mühitdə yaşamını təmin edəcək yüksək keyfiyyətli ətraf mühitin təmin olunması kimi mühüm vəzifə qarşıya qoyulmuşdur.

Milli Prioritetlər çərçivəsində Azərbaycan Respublikasının ümumi İnkişaf Konsepsiyasına uyğun olaraq ölkədə ətraf mühitin vəziyyəti, institusional dəyişikliklər, son illər ərzində həyata keçirilmiş tədbirlər və ekoloji vəziyyətin yaxşılaşdırılması istiqamətində əldə olunmuş nailiyyətlər analiz edilmişdir (Reimers, Shtilmark, 1978).

Eyni zamanda, Azərbaycanda mövcud ekoloji problemlər, yaranma səbəbləri və həlli yolları araşdırılmış, ətraf mühitin bütün sahələri üzrə kompleks şəkildə təhlil aparılmış və uzunmüddətli proqnoz göstəricilər müəyyənləşdirilmiş, prioritet istiqamətlər seçilmişdir.

Ətraf mühitin mühafizəsi istiqamətində müəyyən olunmuş təmiz ətraf mühit və "yaşıl artım" prioritetinin reallaşdırılması üçün iqtisadi inkişafla bərabər, ölkədə təbii sərvətlərdən səmərəli istifadə, su ehtiyatları və tullantıların idarə olunması, ekoloji dost texnologiyaların tətbiqi, atmosfer havasının mühafizəsi, ekoturizmin inkişafı, meşə və yaşıllıq ərazilərinin artırılması və digər sahələrdə müasir yanaşmaların tətbiqinə başlanılmışdır.

Dövlət müstəqilliyinin bərpasından ötən dövr ərzində aparılan uğurlu dövlət siyasəti nəticəsində ölkəmizin sosial-iqtisadi inkişafı və dünya iqtisadiyyatına inteqrasiyası sahəsində çox böyük nailiyyətlər əldə olunmuşdur. Müstəqil dövlət quruculuğu prosesində iqtisadi islahatların və inkişafın mahiyyət etibarı ilə yeni bir modeli yaranmış, makroiqtisadi sabitlik qorunub saxlanılmış və iqtisadi inkişafın dayanıqlılığı təmin edilmişdir (Chernykh, 2014).

İqtisadiyyatın diversifikasiyası genişləndirilməklə neft sektorundan asılılığın minimuma endirilməsi, innovativ iqtisadiyyata keçidin təmin edilməsi, aqrar sektorun inkişafında intensiv üsullara üstünlük verilməsi, həmçinin, ölkənin enerji, ərzaq və ekoloji təhlükəsizliyinin gücləndirilməsi üçün sistemli tədbirlər davam etdirilmişdir.

Ekoloji vəziyyətin yaxşılaşdırılması üzrə atılan addımlara baxmayaraq Ermənistan tərəfindən işğal dövründə təbiətə qarşı qeyri-humanist münasibət regionun ətraf mühitinə mühüm təhlükə yaratmışdır. Ermənistanın işğalçılıq siyasəti nəticəsində Azərbaycanın qiymətli meşə sahələrinin, flora və faunanın, o cümlədən təbiət abidələrinin məhv edilməsi, su resurslarının çirkləndirilməsi və təbii sərvətlərin talan edilməsi nəticəsində ekoloji tarazlıq pozulmuşdur.

Ermənistan beynəlxalq hüququn bütün prinsiplərini və ekoloji konvensiyaların müddəalarını kobud şəkildə pozmaqla 30 ilə yaxın bir müddət ərzində praktiki olaraq nəzarətsiz qalmış ərazilərdə ekoloji terror həyata keçirmişdir.

Müasir dövrdə ayrılıqda bir dövlət üçün ekoloji təhlükəsizlik sisteminin yaradılması qeyri-mümkündür. Yalnız birgə səylər sayəsində müvafiq hüquqi rejim yaratmaqla, bugünkü və gələcək nəsillərin sağlam yaşayışını və inkişafını təmin etmək olar. Odur ki, ətraf mühitin qorunmasında və təbii ehtiyatların mühafizəsində beynəlxalq ekologiya hüququ həlledici rol oynamalıdır.

Ətraf mühitin mühafizəsi sahəsində beynəlxalq təşkilatlarla, donor ölkələrlə əlaqələrin genişləndirilməsinə xüsusi əhəmiyyət verilir. Bununla bərabər müvafiq sazişlər əsasında inkişaf etmiş ölkələrlə ikitərəfli əməkdaşlıqlar qurulur (World Conservation Monitoring Centre, 1992).

Ətraf mühit sahəsində beynəlxalq müqavilələrə qoşulmağa da böyük diqqət yetirilir. Azərbaycan Respublikası bu günə kimi 20-dən artıq ekoloji konvensiyaya qoşulmuş, müvafiq protokollar imzalamış, bir sıra mühüm beynəlxalq tədbirlərin təşkilatçılığını həyata keçirir.

Azərbaycanda ekoloji qanunvericiliyin bazası Ulu Öndər Heydər Əliyevin ilk dəfə hakimiyyətə gəldiyi illərdə daha da gücləndirilmişdir. Məhz onun iradəsi ilə 1969-1982-ci illərdə ekologiya, ətraf mühitin mühafizəsi və təbii sərvətlərdən səmərəli istifadəyə dair çox mühum 8 qanun və 32 qərarı qəbul olunmuşdur.

Son illərdə Azərbaycanda qanunvericiliyin təkmilləşdirilməsi və mövcud normativ hüquqi aktların ölkənin qoşulduğu beynəlxalq müqavilələrin müddəalarına, həmçinin Avropa İttifaqının qanunvericiliyinə uyğunlaşdırılması istiqamətində tədbirlər görülmüşdür (Davey, 1998).

Ətraf mühitə dair qanunvericiliyin təkmilləşdirilməsi istiqamətində bir sıra yeni qanunlar qəbul edilmiş, mövcud qanunlara əlavə və dəyişikliklər edilmişdir. Qanunvericilik əsasən atmosfer havası, su ehtiyatları, məişət və istehsalat tullantıları, su bioresursları, biomüxtəlifliyin qorunması sahələrini əhatə etmişdir.

Yeni qanunların qəbul edilməsi, mövcud qanunlara əlavə və dəyişikliklərin edilməsi ilə bərabər, həmçinin onların icrasının təmin edilməsi məqsədilə müvafiq qaydalar hazırlanıb təsdiq olunmuşdur.

Dinamik inkişaf edən ölkəmizin beynəlxalq nüfuzu artmış, qloballaşan dünyanın bərabərhüquqlu subyekti kimi çıxış etməsinə möhkəm zəmin yaranmışdır. Ölkə iqtisadiyyatının sürətli inkişafı fonunda ekoloji vəziyyətin yaxşılaşdırılması, ətraf mühitin mühafizəsi və təbii sərvətlərdən səmərəli istifadə məsələləri həmişə prioritet olmuşdur (Ministry of Ecology and Natural Resources. Republic of Azerbaijan, 2008).

Azərbaycan Respublikasının BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasına-COP29 kimi mötəbər bir tədbirə ev sahibliyi etməsi ölkəmizə böyük hörmət və etimadın, eləcə də milli, regional və qlobal səviyyədə ətraf mühitin qorunması, iqlim dəyişmələrinin qarşısının alınması işinə verilən töhfənin təqdir olunmasının bariz nümunəsidir.

Azərbaycanda 2024-cü ilin "Yaşıl dünya naminə həmrəylik ili" kimi qeyd olunması ölkəmizdə ətraf mühitin mühafizəsi sahəsində birgə təşəbbüslərin reallaşdırılması üçün əlverişli fürsət olmuşdur.

Azərbaycan qlobal əhəmiyyət kəsb edən COP29 kimi yüksək səviyyəli tədbirin keçirilməsini öz öhdəsinə götürməklə, həmçinin 2024-cü ili - "Yaşıl dünya naminə həmrəylik ili" elan etməklə bütün dünyanı ətraf mühitin mühafizəsi istiqamətində birgə əməkdaşlıq etməyə çağırmışdır.

Səmərəli dövlət idarəçiliyi şəffaf və effektiv demokratik idarəetmə üçün ilkin şərtdir. Bu, dövlətin fəaliyyət göstərməsinin əsasını təşkil etməklə, rəqabətqabiliyyətliliyi və inkişafını təşviq etmək qabiliyyətini müəyyən edir (11).

Dövlət qurumları ölkənin iqtisadi və sənaye siyasətinin əsas təkanverici amilidir. Dövlət orqanları müxtəlif məqsəd və maraqların uyğunlaşdırılmasında və siyasət məqsədlərinə çatmaqda irəliləyişin qiymətləndirilməsində və onlara uyğunlaşdırılmasında da mühüm rol oynayır.

Bu, ekoloji menecment və iqtisadi artımın yaşıllaşdırılması ilə bağlı siyasətlər işləyib-hazırlayan və həyata keçirən qurumlara da şamil olunur. Onlar ətraf mühit siyasətinin iddialı, lakin real məqsədlərini və insan fəaliyyətinin ətraf mühitə və təbii ehtiyatlara təsirlərini minimuma endirən mexanizmlər hazırlayırlar.

Hazırda ətraf mühitin idarə edilməsi sahəsində mexanizmlərin təkmilləşdirilməsi, qanunvericiliyin tətbiqinə imkan verən və asanlaşdıran optimallaşdırılmış strukturun yaradılması istiqamətində davamlı tədbirlər görülür.

Ölkədə aparılan struktur islahatları çərçivəsində idarəetmədə çevikliyi və səmərəliliyi artırmaq, cəmiyyətdə formalaşan yeni çağırışlara və iqtisadiyyatda baş verən struktur dəyişikliklərə adekvat uyğunlaşmanı təmin etmək üçün ətraf mühitin mühafizəsi və ekoloji problemlərin həlli istiqamətində yeni yanaşmaların tətbiqi ilə bütün imkanlar nəzərdən keçirilir (12).

Bu istiqamətdə maraqlı qurumlara və vətəndaşlara ünvanlanmış xidmət və həll yönümlü çalışma, mərkəzi və yerli idarəetmə orqanlarına ətraf mühitlə əlaqədar planlaşdırma və icra məsələlərində liderlik və rəhbərlik, həyata keçirəcəyi iş və əməliyyatlarda etibarlılıq və dayanıqlılıq, təbii ehtiyatların qorunması və onlardan səmərəli istifadə, ətraf mühit məsələlərini əhatə edən proseslərdə iştirakçılıq, planlaşdırma, layihələndirmə və icra prosesində yenilikçilik, təsirli monitorinq və qiymətlən-

dirmə sistemi qurmaqla məhsuldarlığı təmin edən iş sisteminin tətbiqi, hər bir səviyyədə icra edilən xidmət və işlərdə məlumatları paylaşma, açıqlıq və şəffaflıq, vəzifə və funksiyalarının həyata keçirilməsinə peşəkar yanaşma, tərəfdaş konvensiyalardan irəli gələn müasir çağrışlara uyğunluq və s. əsas prinsiplərdir.

Lakin bütün bu fəaliyyətlərin bazasında qanunvericilik bazasının təkmilliyi, günün tələblərinə cavab verməsi, qlobal çağrışlar fonunda hüquqi təminatın mükəmməlliyi dayanır.

Ölkədə ətraf mühitin mühafizəsinə dair bir sıra qanunlar və bundan irəli gələrək qəbul olunmuş Azərbaycan Respublikası Prezidentinin fərman və sərəncamları, Nazirlər Kabinetinin normativ hüquqi aktları mövcuddur. Son illərdə Azərbaycanda qanunvericiliyin təkmilləşdirilməsi və mövcud normativ hüquqi aktların ölkənin qoşulduğu beynəlxalq müqavilələrin (konvensiya və s.) müddəalarına, həmçinin Avropa İttifaqının qanunvericiliyinə uyğunlaşdırılması istiqamətində müvafiq tədbirlər görülmüşdür (13).

İqtisadiyyatın sürətli inkişafı ətraf mühitin modern və çevik idarə olunmasını zəruri etmişdir. Bu baxımdan idarəetmə prosesində qanunvericilik aktlarında yeni yanaşmaların tətbiqi ətraf mühitin mühafizəsi istiqamətində həyata keçirilən tədbirlərin səmərəliliyini artırmışdır.

Hazırda ölkədə iqtisadi inkişafla əlaqədar iri həcmli infrastruktur layihələri həyata keçirilir ki, bu da öz növbəsində ətraf mühitə təsirin qiymətləndirilməsi prosesinin tətbiqini zəruri edir. Buna görə son illərdə normativ-hüquqi aktlarda edilmiş məqsədyönlü dəyişikliklər qurumlararası razılaşdırma prosesinin operativliyi və şəffaflığı baxımından mühüm əhəmiyyət kəsb edir.

Ətraf mühitin mühafizəsi dövlət nəzarəti, ətraf mühitin mühafizəsi sahəsində normativ hüquqi aktların pozulmasına görə məsuliyyət, habelə ətraf mühitə zərər vurulmasının qarşısının alınması və vurulan zərərin qiymətləndirilməsi prinsiplərinə əsaslanır. Konstitusiyamızda, eləcə də digər aidiyyəti qanunvericilik sənədlərində ekoloji məsuliyyəti müəyyənləşdirən ətraf mühitlə bağlı normalar müəyyən edilmişdir.

Ekoloji məsuliyyətin əsasında ekoloji hüquqpozmalar durur. Bu məsuliyyət hər hansı bir hüquq normasının pozulması nəticəsində meydana çıxır və ictimai həyatımızın bütün sahələrində özünü biruzə verir (14).

Ekoloji hüquqpozmalar xüsusi ilə meşə və qeyri-meşə fondu torpaqlarında, yaşayış məntəqələrində yaşıllıqların məhv edilməsi, yanğın təhlükəsizlik qaydalarına əməl edilməməsi, tullantıların düzgün idarə olunmaması, təbii sərvətlərin istismarı zamanı təbiətə və insanların sağlamlığına təhlükə yaradan fəaliyyətlərə yol verilməsi, su obyektlərinin çirkləndirilməsi, su təsərrüfatı sahəsində nəzarətdənkənar qoşulmaların olması və s. sahələrdə daha xarakterik müşahidə edilir.

Ekoloji hüquqpozmaların qarşısının alınması məqsədilə ətraf mühitin mühafizəsi sahəsində həyata keçirilmiş ciddi nəzarət tədbirləri, hüquq mühafizə orqanları tərəfindən qanun pozucuları barəsində tətbiq edilən sərt cəzalar, eyni zamanda davamlı olaraq birgə aparılan maarifləndirmə və təbliğat işləri nəticəsində əvvəlki illərlə müqayisədə son dövrlərdə ekoloji cinayətlərin baş verməsi ilə bağlı faktların sayında azalmalar müşahidə edilir.

Ekoloji münasibətləri tənzimləyən qanunvericiliyin təkmilləşdirilməsi, təbiətə vurulmuş ziyanın ödənilməsi və nəticələrinin aradan qaldırılması, ekoloji hüquqpozmalarla bağlı mütəmadi olaraq kütləvi informasiya vasitələrində maarifləndirmə işlərinin təşkil edilməsi və s. sahələrdə qarşılıqlı fəaliyyətin daha effektiv metodlardan istifadə etməklə gücləndirilməsi məqsədəuyğun hesab edilir.

Bu gün müasir dünya daha operativ və novator yanaşma tələb edir. Ölkəmizdə vətəndaş cəmiyyəti quruculuğunun genişləndiyi dövrdə cəmiyyətimizdə gedən proseslərin reallığı əks etdirəcək şəkildə qiymətləndirilməsi, ətraf mühitin mühafizəsi sahəsində həyata keçirilən dövlət siyasətinin siyasətin hər bir Azərbaycan vətəndaşı tərəfindən düzgün və dərindən dərk edilməsi zərurətə çevrilmişdir. Bununla əlaqədar hüquqi maarifləndirmə sahəsində iş, xüsusilə bu işin həlledici sahəsi olan təbliğat işinin gücləndirilməsi və səmərəliliyinin artırılması son dərəcə böyük əhəmiyyət kəsb edir (15).

Ətraf mühitin mühafizəsi sahəsində normativ-hüquqi aktlar insanla təbiət arasında münasibətlərin qanunvericilik əsasında tənzimləyicisi rolunda çıxış edir.

Bəzi hallarda insanların ekoloji qanunvericilik barədə az məlumatlı olması bu istiqamətdə müəyyən anlaşılmazlıqlara yol aça bilir. Ən çox rastlaşılan hallardan biri kimi əhali tərəfindən açıq ərazilərdə qeyri-qanuni yaşıllaşdırma işlərinin aparılmasıdır. Bu da həmin sahələrin qanuni mülkiy-

yətçilərinin əmlak hüquqlarının pozulmasına gətirib çıxarır, yaxud sözügedən ərazilərdə torpağın qanuni sahiblərinin tikinti və yaxud digər fəaliyyət növü ilə məşğul olmaq istəyi yaşıllıqların qırılması adı ilə hallanır.

Təbiətlə cəmiyyətin münasibətləri yalnız birtərəfli qaydada istəklərin təmin olunması deyil. Təbiəti sevmək onun qoynunda istirahət etmək, sərvətlərindən yararlanmaq deyil, onun təbii vəziyyətinin saxlanılması üçün malik olduğu status çərçivəsində verə biləcəyi töhfədir.

Təbiətlə insan arasında münasibətlərin zərər verməmək, müdaxilə etməmək, alicənab olmaq, təbiət hüquqlarına hörmətlə yanaşmaq və vurulmuş zərəri kompensasiya etmək kimi etik prinsiplərə və davranış qaydalarına əsaslandığı vurğulanır (16).

Ekologiya və təbii sərvətlərin mühafizəsi sahəsində qüvvədə olan qanunvericiliyin müddəalarının yerinə yetirilməsi istiqamətində təbiətə münasibətdə düşüncə tərzinin dəyişdirilməsi və onun mühafizəsində bütün təbəqələrdən olan vətəndaşların iştirakına nail olunması, ictimai qınaq mexanizminin formalaşdırılması, vətəndaş məmnunluğunun artırılması mühüm əhəmiyyət kəsb edir.

Bu sahədə əsas strateji baxış ekoloji təfəkkürün inkişafı, yeni nəslin nümayəndələrinin daha geniş ekoloji biliklər əldə etməsi, ölkəmizin ekoloji siyasəti haqqında məlumatlılığın artırılması nəticəsində mövcud problemlərin tədricən aradan qaldırılması, qanunvericiliyin tələblərinin pozulmasında məsuliyyətin artırılması, indiki və gələcək nəsillərin tələbatını ödəmək məqsədilə təbii ehtiyatlardan səmərəli və qənaətlə istifadə edilməsinə nail olmaq, bu istiqamətdə dünyanın çağırışlarına uyğunlaşmaqdan ibarətdir.

İnsanların sağlam ətraf mühitdə yaşamaq hüququnun təmin edilməsi istiqamətində atılan addımların təbliğ edilməsi sahəsində ideoloji maarifləndirmə işinin təşkili, insanlarda ekoloji təfəkkürün artırılması və onlara təbiətə münasibətdə humanizm ideyalarının aşılanması, ətraf mühitlə bağlı atılan addımların beynəlxalq miqyasda təbliği, ətraf mühitin idarə olunmasında dövlət, akademik, qeyri-hökumət və özəl sektorun, həmçinin cəmiyyətin aktiv təbəqələrinin (könüllülər, bloggerlər, yazarlar, tanınmış ictimai xadimlər və s.) və medianın koordinasiya olunmuş fəaliyyətinin təmin edilməsi, açıq hökumətin təşviqi, vətəndaş məmnunluğunun təmin edilməsi və s. əsas istiqamətlərdən olmuşdur (17).

İdarəetmə alətlərindən istifadə etməklə ətraf mühitin mühafizəsi sahəsində fəaliyyət göstərən əməkdaşların peşəkarlıq səviyyəsinin artırılması, vətəndaşlarda ölkənin ekoloji vəziyyəti ilə bağlı məsuliyyət hissinin aşılanması, ekoloji şüur səviyyəsinin artırılması üçün insan-təbiət münasibətlərinə yeni yanaşmalar, maarifləndirici təşəbbüslər tətbiq etməklə ekoloji dünyagörüşün, eləcə də tədris-tərbiyə müəssisələrində ekoloji tərbiyənin inkişafını təmin etmək, yüksək keyfiyyətli ekoloji mühitin formalaşması, ekoloji mühitin dayanıqlı mühafizəsinə nail olmaq üçün vətəndaşların maarifləndirilməsində təlimçi-müəllimlər, jurnalist, blogger, nüfuzlu ictimaiyyət nümayəndələrinin və s. səylərindən istifadə etmək əsas missiyalardan olmuşdur və bu istiqamətdə çoxşaxəli tədbirlər həyata keçirilir.

Qlobal ekoloji çağırışlara adekvat olaraq cəmiyyət-təbiət münasibətlərinin humanizm prinsipləri əsasında formalaşdırılması, insanlarda ekoloji şüurun artırılması məqsədilə maarifləndirməyə xüsusi diqqət yetirilir.

İctimai qınaq mexanizminin yaranması, vətəndaş mövqeyinin nümayiş etdirilməsi və insanların təbiətlə münasibətində hiss edilən müsbət dəyişikliklər ekoloji durumun yaxşılaşdırılması istiqamətində öz bəhrəsini verir (18).

Qüvvədə olan qanunvericiliyə görə məişət tullantılarının tutumlardan (urnalardan) kənar yerlərə atılmasına görə fiziki şəxslər üç yüz manat məbləğində, vəzifəli şəxslər min manat məbləğində, hüquqi şəxslər dörd min manat məbləğində cərimə edilirlər. Digər ölkələrin qanunvericiliyinə nəzər salsaq eyni əmələ görə kifayət qədər sərt cəzalar müəyyənləşdirib.

Avropa ölkələrində heç kəs adıçəkilən hərəkətləri etmir və orada, ümumiyyətlə, belə şeylərə dözümlük yoxdur. Almaniyada buna görə çox ciddi cəzalar var. Yaponiyada isə tullantı probleminə görə hətta cinayət işi də açıla bilər.

Məsələn, Almaniyada siqaret kötüyünün ictimai yerə atılmasına görə Kölndə 150 avroya qədər cərimə, Berlində 120 avroya qədər cərimə, Essendə 100 avroya qədər cərimə müəyyən edilib. Latviyada yolların və onların komponentlərinin tullantılarla çirkləndirilməsi faktları ilə bağlı fiziki şəxslər

üçün 70 – 350 avro, hüquqi şəxslər üçün isə 700 – 2900 avro cərimə nəzərdə tutulur. İsveçdə ictimaiyyətə açıq olan yerlərdə tullantı atılması cərimə və 1 ilə qədər həbs nəzərdə tutulub. Bu səbəbdən milli qanunvericilikdə də sanksiyaların sərtləşdirilməsi labüd idi.

Həmçinin ağırlaşdırıcı halların əlavə edilməsi insanları daha da məsuliyyətləndirəcək, ətraf mühitin qorunmasında, təmizliyin bərpasında mühüm rol oynayacaqdır. Bu cərimələrin müəyyənləşməsində əsas hədəf və məqsəd insanları bu cür əməllərdən çəkindirməkdir. Yəni, insanlar çalışmalıdırlar ki, bu cür əməllərdən uzaq olsunlar.

Təcrübə onu göstərir ki, cərimələr aşağı olanda insanlar daha rahat şəkildə davranırlar. Bu cərimələrin artırılmasında məqsəd həmin o inzibati pozulmaların qarşısının alınması, yəni ətraf mühitə atılan tullantıların miqdarının azaldılması olmuşdur.

Hazırda Milli Məclisədə bir sıra ekoloji qanun layihələri müzakirə edilməkdədir. Paytaxtımızın iqlimi əsasən mülayim isti və quru subtropikdir. Müasir Bakının iqlimi yaşıllıqların sayəsində xeyli mülayimləşir. Bu baxımdan yaşlllıq faizinin artırılması olduqca vacibdir.

Bununla əlqədar yaşıllıqların qanunsuz götürülməsi (kəsilməsi) ilə bağlı mövcud qanunvericilikdə mülki, inzibati və cinayət məsuliyyəti nəzərdə tutan hüquq normalarının effektiv tətbiq edilməsi mexanizminin müəyyən edilməsi məqsədilə Azərbaycan Respublikasının bir sıra qanunlarında, Prezidentin fərmanlarında dəyişikliklər edilmişdir. Qanunvericiliyin ədalətlilik prinsipi nöqteyi nəzərindən Azərbaycan Respublikasının Cinayət Məcəlləsinin 259-cu maddəsini sanksiyasında olan cərimə cəzaları manatla deyil, yaşıllıqların məhvinə görə təbiətə dəymiş ziyanın misli miqdarda müəyyən edilmişdir.

Bununla yanaşı heyvanlarla bağlı yanaşma da diqqət mərkəzində saxlanılmışdır. Qeyd edək ki, inkişaf etmiş ölkələrdə itlərin zəncirdə saxlanılması, şirlərin sirkdə istifadə olunması, it və pişik balalarının zoomağazalarda cansıxıcı qəfəslərdə saxlanılması cinayət məsuliyyətinə cəlb olunmaq üçün əsasdır.

İspaniya, Fransa, Xorvatiya, Kanada, Finlandiya, Litva, Ukrayna, Latviya, Rusiya, Gürcüstan, Qazaxıstan, Qırğızıstan və digər ölkələrdə bu cür əməllərə görə həmin ölkələrin cinayət məcəllələrində cəzalar nəzərdə tutulub. Məsələn, qonşu Gürcüstanda heyvanlarla amansız davranışa görə 1 ilədək islah işləri cəzası müəyyən olunub. Rusiyada analoji cinayətə görə 1 ilədək islah işləri və ya 6 ayadək azadlıqdan məhrumetmə cəzası və iri məbləğdə cərimə tətbiq edilir.

Türkiyədə heyvanlara işgəncəyə, amansız rəftara görə 6 aydan 3 ilədək, qəsdən öldürüldükdə 6 aydan 4 ilədək, döyüşdürənlərə 3 aydan 2 ilədək, nəsli təhlükə altında olan bir heyvanı öldürənə 1 ildən 5 ilədək, bir heyvanın nəslinin kəsilməsinə görə 5 ildən 10 ilədək azadlıqdan məhrumetmə cəzası verilir.

İndiyədək heyvanlarla rəhmsiz rəftar edilməsi halı eyni qaydada ümumi formada nəzərdə tutulmuş və inzibati tənbeh növünün ağırlıq dərəcəsi və bu dərəcələrə uyğun sanksiyalar fərqləndirilməmişdir. Qanunvericiliyə edilmiş dəyişiklik nəticəsində belə bir fərqləndirilmənin mövcudluğu heyvanlarla rəhmsizcəsinə davranış, bu davranışı özündə əks etdirən materialların əyləncə və ya kommersiya məqsədləri üçün istifadə edilməsi hərəkətinin (hərəkətsizlik) fərqləndirilməsi gələcəkdə eyni inzibati xətanın törədilməsinin qarşısının alınmasında təsirli olacaqdır.

Yeni dəyişikliyə görə heyvanlarla rəhmsiz rəftar edilməsinə, yəni onlara ağrı, əzab, işgəncə verilməsinə, onların döyülməsinə və ya döyüşdürülməsi, bu əməlin heyvanın şikəst edilməsinə səbəb olması, o cümlədən heyvanların tələf edilməsinə səbəb olmaqla törədilməsi hərəkətləri müəyyən edilməklə sanksiyaları diferensiasiya edilmişdir.

Eyni zamanda, digər təklif olaraq heyvanlarla rəhmsiz rəftarın təbliğ edilməsi və ya heyvanlarla rəhmsiz rəftara açıq çağırışlar edilməsi, bu cür rəftarı özündə əks etdirən materialların kommersiya məqsədləri üçün istifadə edilməsi məsuliyyət yaratmış olacaqdır.

Beləliklə, İnzibati Xətalar Məcəlləsində bir sıra maddələr dövrün tələbinə görə təkmil olmadığı üçün təkmilləşdirilməsi, ağırlaşdırıcı halların nəzərdə tutulması, eyni zamanda praktika zamanı ortaya çıxan və məcəllədə nəzərdə tutulmayan halların hüquqi tənzimlənməsinə şərait yaradan yeni müddəaların layihədə göstərilməsi hüquqi tənzimləmədə effektivliyin daha da artırılmasında əhəmmiyyətli rol oynayacaq və praktikada hüquqi tənzimləmənin müsbət yönümlü inkişafına şərait yaradacaqdır.

Hazırda qlobal səviyyədə ətraf mühiti çirkləndirən əsas faktorlardan biri də plastik tullantılarıdır. Heç kəsə sirr deyildir ki, plastik tullantılar təbiətdə yüz illər ərzində parçalanmır, miqdarı isə ilbəil artır. Araşdırmalar göstərir ki, bu tullantılar düzgün idarə olunmadığından ətraf mühiti və sututarları çirkləndirir, kənd təsərrüfatı torpaqlarının dərin qatlarına keçərək bitkilərin normal inkişafını ləngidir və məhsuldarlığın aşağı düşməsinə səbəb olur.

Bir çox inkişaf etmiş ölkələrdə plastik qablaşdırıcılardan istifadənin azaldılması istiqamətində müvafiq qanunvericilik bazası yaradılır, onların toplanması və təkrar emalı sistemi təkmilləşdirilir. Avropa ölkələrinin bir çoxunda əsas tədbir kimi plastik torbaların ödənişli olması və ya onlara ekoloji vergi tətbiqi kimi üsullardan istifadə edilir.

Bununla yanaşı, dəfələrlə istifadə oluna bilən parça torbalardan, bakteriyaların və ya digər canlı orqanizmlərin parçalaya biləcəyi çantalardan istifadənin təşviqi də görülən tədbirlər sırasındadır. Ümumilikdə isə, 40 ölkədə plastik məhsulların istifadəsi məhdudlaşdırılıb.

Tullantıların (tikinti tullantılarının, tibbi tullantıların, plastik tullantıların) idarə olunması sahəsində qanunvericiliyin təkmilləşdirilməsi istiqamətində işlər aparılır. Qeyd olunan idarəetmə sahəsində yeni mexanizmlərin tətbiqi tullantılara münasibətin dəyişdirilməsi, onların dövri iqtisadiyyata cəlb olunması, təbii ehtiyatlardan səmərəli istifadə ilə ətraf mühitin çirklənməsinin qarşısını almaq hədəflənir.

Qeyd etdiyimiz kimi ətraf mühitlə bağlı problemlər dünyanın son dövrlər üzləşdiyi və təbii fəlakətlərlə nəticələnən potensial təhlükələrdən hesab olunur. Məsələnin əhəmiyyəti, təcililiyi və əhatə dairəsi nəzərə alınaraq 1992-ci ildə Braziliyanın Rio şəhərində keçirilmiş Yer Sammitində iqlim dəyişmələri ilə mübarizə, səhralaşmanın və torpaq deqradasiyasının qarşısının alınması və bioloji müxtəlifliyin qorunmasını ehtiva edən 3 çoxtərəfli ekoloji saziş (konvensiya) irəli sürülmüşdür. Azərbaycan Respublikası hər 3 konvensiyanın tərəf ölkəsidir və konvensiyalar çərçivəsində müvafiq fəaliyyətlərin həyata keçirmə öhdəlikləri vardır.

Meşələr qeyd olunan konvensiyaların məqsədlərinin kəsişdiyi unikal ekosistemlərdir. Belə ki, meşələr mühüm təbii resurs olmaqla iqlim dəyişmələrinin təsirlərinin azaldılmasında, biomüxtəlifliyin və torpaqların qorunmasında xüsusi əhəmiyyət kəsb edir.

Azərbaycan Respublikası Prezidentinin 2022-ci il 22 iyul tarixli 3378 nömrəli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasının 2022-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası"nda "Təmiz ətraf mühit və yaşıl artım ölkəsi" üzrə strateji çərçivəsində ölkə üzrə ümumi ərazidə yaşıllığın payının 12 faizdən 12,3 faizə çatdırılması, meşə fondunun 65%-nin inventarlaşdırılmasının təmin olunacağı hədəf olaraq müəyyən edilmişdir.

"Azərbaycan Respublikasının 2022–2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası"nın icrasını təmin etmək məqsədilə ölkə başçısının 2022-ci il 16 noyabr tarixli 3587 nömrəli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasının işğaldan azad edilmiş ərazilərinə Böyük Qayıdışa dair I Dövlət Proqramı"nda meşə fondunun inventarlaşdırılması və qiymətləndirilməsi, məhv olmuş meşə sahələrinin bərpası və artırılması məqsədilə 1150 hektar sahədə meşəbərpa və meşəsalma işlərinin aparılması, ərazinin bərpasında lazım olan əkin materialına tələbatın ödənilməsi, meşəçi mütəxəssislərə ixtisası üzrə təlimlərin keçilməsi, meşəçilik sahəsində müasir, qapalı kök sistemli tingliyin, toxum genbankının yaradılması, meşə əkinləri və yaşıllıq sahələrinin salınması üçün tinglərin yetişdirilməsi məqsədilə Cəbrayıl rayonunda "Azərbaycan – Türkiyə Beynəlxalq Meşəçilik Təlim Mərkəzi"nin, "Ağıllı Tinglik Təsərrüfatı"nın və "Dostluq meşəsi"nin yaradılması kimi tədbirlər nəzərdə tutulmuşdur.

Meşələr torpaq, su və biomüxtəlifliyin qorunması ilə yanaşı iqlim dəyişikliyinin təsirlərinin yumşaldılması və uyğunlaşmasına, təbii fəlakətlərin, o cümlədən daşqın, sürüşmə, quraqlıq riskinin azaldılmasına qədər geniş spektri əhatə edir. Ölkədə meşə ehtiyatlarının artırılması və ondan rasional istifadə sahəsində davamlı inkişafın təmin olunması, potensial imkanlardan səmərəli istifadə edilməsi, dövlət dəstəyinin gücləndirilməsi və investisiyaların cəlb edilməsi, həmçinin meşə sektoruna hərtərəfli marağın artırılması məqsədilə hazırda "Azərbaycan Respublikasında meşələrin davamlı inkişafına dair 2025 – 2030-cu illər üçün Dövlət Proqramı" hazırlanmaqdadır.

Ətraf mühitin mühafizəsi ilə bağlı "Balıqçılıq haqqında", "Heyvanlar aləmi haqqında", "Ətraf mühitin mühafizəsi haqqında" və "Ovçuluq haqqında" Azərbaycan Respublikasının qanunlarında və

s. normativ hüquqi aktlarda dəyişikliklər edilmiş, həmçinin "Yer təkinin istifadəyə verilməsi üzrə hərrac (auksion və müsabiqə) predmetinin başlanğıc qiymətinin və hərracda iştirak haqqı məbləğinin hesablanması Metodikası", "Təhlükəli və təbii fəlakət törədə bilən təhlükəli hidrometeoroloji hadisələrin təsnifatı və meyarları haqqında Təlimat" təsdiq edilmişdir.

Eyni zamanda, "Qablaşdırma və qablaşdırma tullantılarının dövriyyəsi haqqında", "Heyvanlarla məsuliyyətli davranış haqqında", "Atmosfer havasına atılan istixana qazlarının idarə edilməsi haqqında", "Yerin təki haqqında" Azərbaycan Respublikasının yeni qanun layihələri hazırlanmışdır.

Ətraf mühitin mühafizəsi sahəsində qanunvericilikdə edilmiş yeni yanaşmalar qlobal çağrışlara uyğunlaşdırılır. Xüsusi ilə ətraf mühitə əsaslı şəkildə mənfi təsir göstərən istehsalat müəssisələrinin fəaliyyətinin qanunvericiliyin tələblərinə uyğulaşdırılması ən vacib məqamlardan hesab olunur.

Ətraf mühitin mühafizəsi sahəsində istehsal müəssisələrin əsas vəzifələri öz fəaliyyətini ölkənin ekoloji qanunvericiliyinə uyğun olaraq həyata keçirməsindən, enerji və təbii ehtiyatların istehlakını azaldan, ətraf mühitə dost texnologiyaların tətbiq edilməsindən ibarətdir.

İstehsalat müəssiələri də davamlı inkişafın təmin olunması üçün öz fəaliyyətlərində müvafiq addımlar atmalıdırlar. Sənaye müəssisələrində innovasiya yönümlü texnologiyaların və elmi-texniki nailiyyətlərin tətbiqi diqqət mərkəzində saxlanılmalıdır.

Hazırki iqtisadi inkişaf şəraitində cəmiyyətdə bu məsələlərə hüquqi vəzifədən daha çox məsuliyyət kimi yanaşılması vacibdir. Davamlı inkişaf üçün istehsalat sahələrində sağlamlıq, əməyin təhlükəsizliyi və ətraf mühitin mühafizəsi (SƏTƏM) sisteminin inkişafı vacib şərtdir.

Ekoloji təhlükəsizliyin təmin edilməsinə nail olmaq məqsədilə müəssisələr istehsalat fəaliyyətində qəzaların insanlara və ətraf mühitə ciddi zərərli təsirinin qarşısının alınması üzrə rasional, ekoloji və iqtisadi cəhətdən məqsədəuyğun tədbirlər görməlidirlər.

Müəssisələrin ekoloji səmərəli innovasiyaların tətbiq etməsi həm də istehsal xərclərinin azalmasına, xammal və enerji səmərəliliyinin artmasına, tullantıların azaldılması ilə iqtisadi üstünlük əldə etməyə imkan verir.

## Nəticə

Ekoloji məsələlər getdikcə daha çox strateji idarəetmənin vacib elementi kimi nəzərdən keçirilməli, yaşıl və dayanıqlı inkişaf konsepsiyasının tətbiqi, ətraf mühit məsuliyyəti və sosial məsuliyyətlilik hər bir şirkətdə idarəçiliyin təməl prinsiplərini təşkil etməlidir.

Sosial-iqtisadi inkişafla əlaqədar ətraf mühitin artan təsirlərdən mühafizəsi və ekoloji vəziyyətin yaxşılaşdırılmasında bütün maraqlı tərəflər iştirak etməli, özəl sektor və vətəndaş cəmiyyəti institutları ilə səmərəli əməkdaşlıq qurulmalı, ətraf mühitin deqradasiyasına səbəb ola biləcək fəaliyyətlərin qarşısının alınması istiqamətində tədbirlər daha da gücləndirilməlidir.

## Ədəbiyyat

1. Boreyko, V. (2001). Three ideologies of the modern order case. *Humanitarian Ecole Journal*, 3(1), 33-42.
2. Borisov, V., Belousova, L., Vinokurov, A. (1985). *Protected natural territories of the world*. M. "Agropromizdat", 309.
3. Chernykh, D. (2014). *Specially protected natural territories and foundations of territorial nature protection. Uchebnoye posobiye*. Barnaul: Altai University, 227.
4. Davey, A. G. (1998). *National System Planning for Protected Areas*. Best Practice Protected Area Guidance Series № 1/ World Commission on Protected Areas/IUCN, 71.
5. Ivanov, A. (2003). Chizhova V. *Protected natural territories. Uchebnoye posobiye*. Moscow: Moscow University Press, 119.
6. Ministry of Ecology and Natural Resources. Republic of Azerbaijan. (2008). *Protected areas in Azerbaijan*. Baku: "Sistem Ofset".
7. Reimers, R., Shtilmark, F. (1978). *Specially protected natural territories*. M.: "Mysl", 298.
8. Sultan-zadə, F. (2015). *Biomüxtəliflik və onun mühafizəsi*. Ali məktəblər üçün dərslik. Bakı: "Çaşıoğlu", 240.

9. Primak, B. (2002). *Basic principles of preservation of biodiversity* (per.engl.) (Yakinenko, O.S., Zimov'evoi, O. Moscow: Nauchnogo-Metodicheskogo tsentra, 256.
10. World Conservation Monitoring Centre. (1992). *Global Biodiversity: Status of the Earth's Living Resources.* London: Chaptman and Hall, 594.
11. www.eco.gov.az
12. www.preslib.az
13. www.president.az
14. www.science.az
15. www.iucnredlist.org
16. www.iucn.org
17. www.protectedplanet.net
18. www.cbd.int

DOI: https://doi.org/10.36719/2663-4619/113/19-26

**Cavanşir Hüseynzadə**
Xəzər Universiteti
https://orcid.org/0009-0003-9988-4837
jaoneshir@gmail.com

# Fiziki aktivliyin insanlarda depressiya və təşviş pozuntularının azaldılmasında rolu

**Xülasə**

Fiziki aktivlik insan sağlamlığına yalnız fiziki deyil, eyni zamanda psixoloji cəhətdən də müsbət təsir göstərir. Müxtəlif araşdırmalar göstərir ki, müntəzəm idman və fiziki fəaliyyət depressiya və təşviş (anxiety) pozuntularının azalmasına kömək edir. Fiziki fəaliyyət zamanı beyində endorfin, serotonin və dopamin kimi "xoşbəxtlik hormonları" ifraz olunur. Bu maddələr insanın əhvalını yaxşılaşdırır və stresin azalmasına səbəb olur. Eyni zamanda, stress hormonu olan kortizolun səviyyəsi azalır ki, bu da təşviş pozuntularının qarşısını almağa kömək edir. Daimi fiziki aktivlik insanın bədən görünüşünü və özünə inamını yaxşılaşdıraraq, psixoloji problemlərin azalmasına səbəb olur. Bununla yanaşı, idman və fiziki fəaliyyət yuxu keyfiyyətini artıraraq, depressiya və təşvişin əsas səbəblərindən biri olan yuxusuzluğun qarşısını alır. Fiziki aktivlik sosial əlaqələrin qurulmasına da şərait yaradır. İdman qruplarında və ya açıq havada edilən məşqlər insanların bir-biri ilə ünsiyyətini artıraraq, onların sosial dəstək hiss etməsinə kömək edir. Bu da depressiya və təşviş pozuntularının azalmasına müsbət təsir göstərir. Araşdırmalar göstərir ki, mütəmadi olaraq orta və yüksək intensivlikli fiziki fəaliyyətlə məşğul olan insanlarda depressiya və təşviş səviyyəsi daha aşağı olur. Gündəlik gəzinti, qaçış, üzgüçülük, velosiped sürmə və yoga kimi fəaliyyətlər psixi sağlamlığın qorunmasına və yaxşılaşmasına mühüm töhfə verir. Fiziki aktivliyin təsiri fərqli yaş qruplarında və müxtəlif sosial statusa malik insanlarda eyni dərəcədə müşahidə olunur. Uşaqlarda və yeniyetmələrdə fiziki fəaliyyət stressin azalmasına, akademik göstəricilərin yaxşılaşmasına və sosial bacarıqların inkişafına kömək edir. Yetkin insanlarda isə fiziki aktivlik gündəlik iş və şəxsi həyatla bağlı yaranan gərginliyi azaltmağa, emosional stabilliyi qorumağa və zehni çevikliyi artırmağa imkan yaradır. Yaşlı insanlarda müntəzəm idman hərəkətləri depressiyanın qarşısını alır, yaddaşı və kognitiv funksiyaları gücləndirir. Fiziki aktivlik növləri arasında fərqlər olsa da, onların hər biri psixi sağlamlığa müsbət təsir göstərir. Aerobik məşqlər (qaçış, üzgüçülük, rəqs, velosiped sürmə) ürək-damar sistemini gücləndirərək beyin qan dövranını artırır və bunun nəticəsində emosional vəziyyətə müsbət təsir edir. Güc məşqləri (ağırlıq qaldırma, müqavimət məşqləri) isə insanın özünəinamını artırır və stressi idarə etməyə kömək edir. Yoga və meditasiya tərkibli idman növləri isə həm bədənə, həm də zehni vəziyyətə sakitləşdirici təsir göstərir, diqqətin artırılmasına və təşvişin azaldılmasına kömək edir.

***Açar sözlər:*** *depressiya, təşviş pozuntusu, dopamin, psixi sağlamlıq, meditasiya*

**Javanshir Huseynzadeh**
Khazar University
https://orcid.org/0009-0003-9988-4837
jaoneshir@gmail.com

# The Role of Physical Activity in Reducing Depression and Anxiety Disorders in Humans

**Abstract**

Physical activity has a positive effect on human health not only physically, but also psychologically. Various studies show that regular exercise and physical activity help reduce depression and anxiety disorders. During physical activity, the brain releases "happiness hormones" such as endorphins, serotonin, and dopamine. These substances improve a person's mood and reduce stress. At the same time,

the level of the stress hormone cortisol decreases, which helps prevent anxiety disorders. Regular physical activity improves a person's body image and self-confidence, leading to a decrease in psychological problems. In addition, exercise and physical activity improve sleep quality and prevent insomnia, which is one of the main causes of depression and anxiety. Physical activity also creates conditions for building social relationships. Exercise in sports groups or outdoors helps people feel socially supported by increasing their communication with each other. This has a positive effect on reducing depression and anxiety disorders. Studies show that people who regularly engage in moderate to high-intensity physical activity have lower levels of depression and anxiety. Activities such as daily walking, running, swimming, cycling and yoga make a significant contribution to maintaining and improving mental health. The effects of physical activity are observed equally in different age groups and people of different social status. In children and adolescents, physical activity helps reduce stress, improve academic performance and develop social skills. In adults, physical activity helps reduce the tension associated with daily work and personal life, maintain emotional stability and increase mental flexibility. Regular exercise in older people prevents depression and strengthens memory and cognitive functions. Although there are differences between types of physical activity, each of them has a positive effect on mental health. Aerobic exercises (running, swimming, dancing, cycling) strengthen the cardiovascular system and increase blood circulation to the brain, which in turn has a positive effect on emotional well-being. Strength training (weight lifting, resistance training) increases self-confidence and helps manage stress. Exercises that include yoga and meditation have a calming effect on both the body and mind, helping to increase focus and reduce anxiety.

***Keywords:*** *depression, anxiety disorder, dopamine, mental health, meditation*

## Giriş

İnsan sağlamlığı həm fiziki, həm də psixoloji aspektlərdən ibarətdir və bu iki sahə bir-biri ilə sıx əlaqəlidir. Günümüzdə depressiya və təşviş pozuntuları geniş yayılmış problemlərdən biridir və bu hallar insanın ümumi həyat keyfiyyətinə mənfi təsir göstərir. Araşdırmalar göstərir ki, psixi sağlamlığı qorumaq və yaxşılaşdırmaq üçün fiziki aktivlik mühüm rol oynayır. Müntəzəm fiziki fəaliyyət beyində neyrokimyəvi prosesləri tənzimləyir, stressi azaldır və emosional sabitliyə töhfə verir. Bundan əlavə, fiziki aktivlik insanın özünəinamını artırır, yuxu keyfiyyətini yaxşılaşdırır və sosial münasibətləri gücləndirir. Bu səbəbdən fiziki fəaliyyətin depressiya və təşviş pozuntularının qarşısının alınmasında və onların idarə olunmasında təsiri geniş tədqiqatların mövzusuna çevrilmişdir. Fiziki aktivliyin insanın psixi sağlamlığına təsiri müxtəlif mexanizmlərlə izah olunur. Hərəkət zamanı bədəndə hormonal dəyişikliklər baş verir, stress səviyyəsi azalır və beyində pozitiv duyğular yaradan maddələrin ifrazı artır (Əhmədov, 2019, s. 468). Bu proseslər emosional vəziyyətin sabitləşməsinə və psixoloji gərginliyin azalmasına kömək edir. Müxtəlif növ fiziki fəaliyyətlər fərqli yollarla depressiya və təşviş pozuntularının qarşısını alır. Dinamik hərəkətlər, məsələn, qaçış və üzgüçülük qan dövranını sürətləndirərək beynin oksigen təminatını artırır. Bu, kognitiv funksiyaların güclənməsinə və düşüncə aydınlığının yaranmasına səbəb olur. Güc məşqləri isə insanın öz bədəninə nəzarət hissini artıraraq, psixoloji dayanıqlığın formalaşmasına yardım edir. Yoga və nəfəs texnikalarına əsaslanan fəaliyyətlər isə zehni sakitləşdirir və təşviş hissini azaldır. Fiziki aktivliyin psixoloji faydalarından biri də sosial dəstək imkanlarının genişlənməsidir. Qrup halında idmanla məşğul olmaq insanlar arasında əlaqələri gücləndirir, tək qalma hissini azaldır və emosional bağlılıq yaradır. Bu faktorlar depressiya və təşviş pozuntularının inkişaf riskini minimuma endirir. Bütün bu müsbət təsirlərə baxmayaraq, fiziki aktivliyin effektiv olması üçün onun müntəzəm və uyğun şəkildə həyata keçirilməsi vacibdir. Həddindən artıq yorucu məşqlər əks təsir göstərə bilər, buna görə də balanslı və fərdi ehtiyaclara uyğun fiziki fəaliyyət seçmək önəmlidir. Həkimlər və psixoloqlar bu prosesdə fərdi yanaşmanın əhəmiyyətini vurğulayır, çünki hər kəsin bədən və psixoloji durumu eyni deyil. Müasir dövrdə idmanın təkcə bədən sağlamlığı üçün deyil, eyni zamanda emosional rifahın qorunması üçün də güclü vasitə olduğu qəbul edilir. Fiziki aktivliyi gündəlik həyatın ayrılmaz hissəsinə çevirmək, depressiya və təşviş pozuntularının qarşısını almaq üçün təbii və effektiv üsullardan biri hesab olunur (Coulehan, Schulberg, Block, Madonia, & Rodriguez, 1997, p. 218).

**Tədqiqat**

Hər bir modelin tənzimləmə səmərəliliyi, risklərin azaldılması və iqtisadi inkişafın stimullaşdırılması baxımından üstünlükləri və çatışmazlıqları var. Mərkəzləşdirilmiş tənzimləmə investorların hüquqlarını qorumağa və bazar sabitliyini təmin etməyə kömək etsə də, bəzi hallarda sərt qaydalar bazarın çevikliyini azalda bilər. Digər tərəfdən, qeyri-mərkəzləşdirilmiş yanaşma bazar iştirakçılarının sərbəstliyini artırsa da, spekulyasiya və manipulyasiya risklərini də artıra bilər.

Bu məqalənin məqsədi, tənzimləmə nəzarəti və bazar elastikliyini tarazlayan, bazarın şəffaf və səmərəli fəaliyyət göstərməsinə imkan verən optimal maliyyə bazarı idarəetmə mexanizminin əsaslandırılmasını araşdırmaqdır. İdeal maliyyə bazarı idarəetmə modeli həm investorların hüquqlarını qorumağı, həm də bazar iştirakçılarının sərbəst fəaliyyət göstərməsini təmin etməlidir. Bu, uzunmüddətli iqtisadi inkişaf və maliyyə sabitliyinin əsas amillərindən biridir.

Səmərəlilik hibrid modelin əsas üstünlüklərindən biridir. Bu model bazar qüvvələrinin qiymətləri müəyyən etməsinə imkan verərkən, bazar manipulyasiyasının və qeyri-qanuni fəaliyyətlərin qarşısını almaq üçün tənzimləyici nəzarəti qoruyur. Bazarın sərbəst fəaliyyətini təmin etməklə yanaşı, tənzimləyici qurumlar spekulyativ və manipulyativ halların qarşısını alır ki, bu da bazarın sabitliyini və uzunmüddətli inkişafını dəstəkləyir.

Şəffaflıq tənzimləmə çərçivələrinin mühüm elementlərindən biridir. Məlumat açıqlığının təmin edilməsi investor etibarını artırır və bazar iştirakçılarının daha düzgün qərarlar qəbul etməsinə kömək edir. Bu proses bazar şəffaflığını yüksəltməklə yanaşı, spekulyasiya və maliyyə fırıldaqlarının da qarşısını alır (White, 2021).

Risklərin idarə edilməsi hibrid modelin vacib funksiyalarından biridir. Maliyyə böhranlarının təsirini minimuma endirmək üçün bu model sistem risklərinin erkən aşkarlanmasını və onların qarşısının alınmasını təmin edir. Xüsusilə, bank sektoru və digər maliyyə institutlarında stabil inkişafın qorunmasına töhfə verir.

Texnoloji inkişafın inteqrasiyası hibrid modelin çevikliyini artırır. Fintex (fintech) və rəqəmsal ticarətin genişlənməsi bazar innovasiyalarını tələb edir. Hibrid model bu yeniliklərə uyğunlaşa bilən çevik strukturlar yaradaraq, maliyyə qanunvericiliyinin tələblərinə riayət olunmasını təmin edir. Blokçeyn texnologiyasının və süni intellektin bazarlarda istifadəsi sayəsində tənzimləmə prosesləri daha effektiv həyata keçirilir.

Uyğunlaşma və çeviklik hibrid yanaşmanın əsas xüsusiyyətlərindən biridir. Qlobal iqtisadi böhranlar, pandemiyalar və geosiyasi hadisələr kimi fövqəladə hallarda, bu model bazarın daha çevik reaksiya verməsini təmin edir. Bunun nəticəsində bazar iştirakçıları daha az risklə qarşılaşır və iqtisadi mühit daha sabit olur.

**4. Praktiki Nümunələr və Tətbiqlər Praktiki Nümunələr və Tətbiqlər** Müxtəlif ölkələr maliyyə bazarlarını idarə etmək üçün fərqli təşkilati strukturlar qəbul etmişdir. Bu ölkələrin təcrübələri maliyyə bazarlarının idarə edilməsinin müxtəlif modellərini və onların iqtisadi nəticələrini göstərir.

**ABŞ nümunəsi** ABŞ hibrid maliyyə bazarı idarəetmə modelindən istifadə edir. Burada **Qiymətli Kağızlar və Birja Komissiyası (SEC)**, **Federal Ehtiyat Sistemi (FED)** və **Maliyyə Sənayesi Tənzimləmə Təşkilatı (FINRA)** kimi qurumlar bazara nəzarət edir. Mərkəzləşdirilmiş tənzimləmə bazar manipulyasiyasının və fırıldaqçılığın qarşısını almağa kömək edir, eyni zamanda, qeyri-mərkəzləşdirilmiş bazar infrastrukturu investorların və şirkətlərin sərbəst fəaliyyət göstərməsinə imkan verir. Bu yanaşma investor etimadını artırır və maliyyə bazarlarında şəffaflığı təmin edir. Bununla yanaşı, ABŞ-da fintech sektoru üçün daha açıq siyasət yürüdülür ki, bu da innovasiyaların inkişafını sürətləndirir.

**Avropa İttifaqı nümunəsi** Avropa İttifaqı (Aİ) daha sərt və koordinasiyalı mərkəzləşdirilmiş tənzimləmə modelindən istifadə edir. **Avropa Mərkəzi Bankı (ECB)** və **Avropa Qiymətli Kağızlar və Bazarlara Nəzarət Təşkilatı (ESMA)** maliyyə bazarlarının sabitliyini təmin edən əsas qurumlardır. Aİ-də hər bir üzv dövlətin öz maliyyə tənzimləmə qurumları olsa da, bu qurumlar Aİ səviyyəsində tənzimlənən vahid bazar qaydalarına uyğun fəaliyyət göstərirlər. Bu model böhran dövrlərində maliyyə sabitliyini təmin etməkdə təsirli olmuşdur, lakin bəzi mütəxəssislər bu yanaşmanın bazar iştirakçılarının operativliyini azalda biləcəyini iddia edirlər.

**İnkişaf etməkdə olan ölkələrdə vəziyyət** Daha az tənzimlənən bəzi inkişaf etməkdə olan iqtisadiyyatlar qeyri-mərkəzləşdirilmiş bazar modellərini seçmişlər. Məsələn, bəzi Asiya və Afrika ölkələrində maliyyə bazarlarına dövlət müdaxiləsi zəifdir, tənzimləyici orqanlar isə az təsir gücünə malikdirlər. Bunun nəticəsində bu ölkələrdə bazar spekulyasiyası və qeyri-sabitlik daha çox müşahidə olunur. Eyni zamanda, zəif tənzimləmə səbəbindən investisiya mühiti risklidir və xarici sərmayələrin axını məhdudlaşır. Green & Williams (2022) araşdırmalarına görə, inkişaf etməkdə olan ölkələrdə maliyyə bazarlarının effektiv işləməsi üçün müəyyən dərəcədə mərkəzləşdirilmiş tənzimləmə tələb olunur.

## Nəticə

Effektiv maliyyə bazarı idarəetmə strukturunun əsaslandırılması tənzimləmə və bazar müstəqilliyi arasında balans yaratmağa əsaslanır. Hibrid yanaşma bazar səmərəliliyini, şəffaflığı və risklərin azaldılmasını təmin edərkən texnoloji inkişaflara da şərait yaradır. Bu araşdırma süni intellektin maliyyə tənzimləməsinə inteqrasiyasını daha da tədqiq etməyi tövsiyə edir. Yaxşı qurulmuş maliyyə bazarı idarəetmə mexanizmi iqtisadi sabitlik və davamlı inkişaf üçün vacibdir.

## Ədəbiyyat

1. Adams, R., & Lee, T. (2017). *Financial Market Regulations and Crisis Management*. Oxford University Press.
2. Davis, P. (2020). *Transparency and Efficiency in Financial Markets*. Cambridge University Press.
3. Fama, E. (1970). *Efficient Capital Markets: A Review of Theory and Empirical Work*. Journal of Finance, 25(2), 383-417.
4. Green, J., & Williams, L. (2022). *Global Financial Market Structures and Their Impact on Economic Stability*. Harvard Business Review.
5. Jones, M., & Brown, K. (2018). *Regulatory Approaches in Financial Market Oversight*. MIT Press.
6. Miller, S. (2019). *Decentralized Financial Markets: Opportunities and Risks*. Financial Studies Journal, 45(3), 215-230.
7. Smith, J., White, R., & Taylor, B. (2020). *The Role of Technology in Modern Financial Markets*. Economic Policy Review, 28(1), 99-122.
8. White, R. (2021). *Market Efficiency and Regulatory Challenges*. Stanford Economic Review.

DOI: https://doi.org/10.36719/2663-4619/113/101-106

**Sevinc Pəniyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
magistrant
https://orcid.org/0009-0000-5279-762X
veliyevasevinc1502@gmail.com

# Biologiyanın tədrisində differensial yanaşmanın elmi-psixoloji əsasları

**Xülasə**

Məqalədə biologiya dərslərində bütün şagirdlərin ehtiyaclarını qarşılamaq üçün – şagirdlərin nə öyrəndiyinə (məzmun), informasiyanı necə mənimsədiklərinə (informasiyanın emalı), bilik və bacarıqlarını necə nümayiş etdirmələrinə (nəticə) və tədrisin harda və kiminlə baş tutmasına (təlim mühiti) dəyişiklik etməklə hazırlanmış öyrətmə metodu differensiasiya haqqında məlumat verilmişdir. Differensial təlim hər bir şagirdin fərdi xüsusiyyətlərini təlimdə və qiymətləndirmədə nəzərə alaraq öyrənmə prosesini artırır. Differensial təlim bütün uşaqlara eyni təlim materialını fərdi bacarıqlar əsasında biçilmiş metodla qavramasına imkan verir.

***Açar sözlər:*** *differensial, təlim, yanaşma, keyfiyyət, məzmun, proses, məhsul, öyrənmə mühiti*

**Sevinj Paniyeva**
Azerbaijan State Pedagogical University
Master student
https://orcid.org/0009-0000-5279-762X
veliyevasevinc1502@gmail.com

# Scientific-Psychological Basis of Differential Approach in Biology Teaching

**Abstract**

In the article, differentiation is a teaching method designed to meet the needs of all students in biology classes - by changing what students learn (content), how they absorb information (information processing), how they demonstrate knowledge and skills (outcome), and where and with whom teaching takes place (learning environment). was informed about. Differentiated learning increases the learning process by taking into account the individual characteristics of each student in teaching and assessment. Differentiated learning allows all children to grasp the same learning material in a method tailored to their individual abilities.

***Keywords:*** *differential, training, approach, quality, content, process, product, learning environment*

## Giriş

"Təhsilə ehtiyac hər bir insanın daxilindədir; insanlar təhsili sevir və axtarır, necə sevir və nəfəs almaq üçün hava axtarır"- L.Tolstoy. İndiki dövrdə gəncləri və cavanları istər məktəbdə, istərsə də məktəbdən kənarda müəllim kimi tanıyan və bilən yoxdur, müəllim istər-istəməz onların maraq dairələrindən və istəklərindən xəbərdardır.

Diferensiasiya nədir? Diferensiasiya dedikdə nə başa düşürük? Latın dilindən dilimizə tərcümədə "diferensasiya"- bütövün müxtəlif hissələrə, formalara, pillələrə bölünməsi, təbəqələşməsi mənasına gəlir. Təlimin təşkili zamanı diferensiallaşdırma və diferensial yanaşma öyrənməni daha səmərəli və əlçatan edir. Sinifdə olan eyni yaşlı uşaqların ümumi cəhətləri ilə bərabər, onların hər birinin özünəməxsus xüsusiyyətləri də vardır: birinin görmə hafizəsi qüvvətlidir, biri sürətlə fikirləşir, o biri nisbətən zəif fikirləşir, biri təlimin çətinliklərindən qorxur, o biri isə çətinliklərə can atır, biri diqqətini nisbətən uzun müddət bir işin üzərində saxlaya bilir, o biri isə bunu bacarmır və s.

 

Şagirdlərdə təsadüf edilən belə fərdi fərqlər bir tərəfdən onların sinir sistemi və temperament xüsusiyyətləri ilə, digər tərəfdən təlim-tərbiyə ilə, yaşadıqları mikromühitlə əlaqədardır. Diferensial yanaşma, adətən, eyni məkanda müxtəlif öyrənmə xüsusiyyətlərinə və tələblərinə görə fərqlənən qrupların (heterogen sinif) olduğu mühitdə tətbiq edilir.

Diferensial yanaşma- məktəb daxilində eyni sinif və ya təlim şəraitində öyrənməsinə, intel-lelektinə, təlim nailiyyətlərinə, qavramasına, təfəkkürünə, xarakterinə, dilinə, dininə və s. başqa fərdi xüsusiyyətlərinə görə bir-birindən fərqlənən şagirdlərlə müxtəlif metod və üsulların köməyilə işləmək və keçirilən dərslərin və mövzuların hər qrupa daxil olan şagirdə uyğun olaraq planlaşdırılması və tədris olunmasıdır. Eyni məkanda müxtəlif öyrənmə xüsusiyyətlərinə və tələblərinə görə bir-birindən seçilən qruplara- heterogen sinif deyirik və diferensial yanaşmanı bu mühitdə tətbiq etmək mümkündür.

Əvvəllər diferensial yanaşmanın tətbiqi deyildikdə, bunun ancaq zəif və ya pis oxuyan şagirdlərə yönəlmiş proses olduğu düşünülürdü. Həmçinin, ən güclü oxuyan və ya istedadlı şagirdlərə də. Diferensial yanaşmanın tətbiqində əsas vəzifə və öncəlik bir-birindən maraq, meyl, qabiliyyət, bacarıq, dərketmə və idrak etməsinə görə fərqlənən təhsilalanlara təhsilin əlçatan və maksimum səviyyədə əhatəliliyini təmin etməkdir. Bunu elə təşkil etmək lazımdır ki, təhsil mühitində ən zəif oxuyan şagirddə belə oxumağa həvəs yaransın, fənn üzrə öz bilik və bacarıqlarını nümayiş etdirə bilsin.

Müəllimin ən başlıca vəzifəsi və qayəsi ondan ibarətdir ki, o, dərs keçdiyi şagirdlərin maraqlarına, istəklərinə, bilik, bacarıq və vərdişlərinə uyğun öyrənmə şəraiti yaratsın. Həmçinin şagirdlərin müxtəlif səviyyələr üzrə inkişafını həyata keçirmək üçün düzgün seçilmiş planlaşdırma və təlim müəllimin əsas vəzifələrindən biridir.

Diferensial yanaşmanın tətbiqi imkanları bir neçə əsas prinsiplərdən asılır:

-fikrin əsas məzmun, anlayış və bacarıqlara yönəldilməsi;

-problemin həllinə dair tənqidi və yaradıcı düşüncə tərzi (təfəkkür) üçün imkanlar;

-öyrənmə prosesinin davamlı qiymətləndirilməsi;

-qruplaşdırılmış siniflər və adi siniflər arasında balans;

-təlim məqsədləri və təlim nəticələri haqqında məlumatı olan, fəal öyrənmə bacarıqlarlarına malik şagirdlərin müəyyən edilməsi;

-birgə əməkdaşlıq mühitində təlim (kooperativ təlim);

-çətin, lakin nail olunması mümkün hədəflər;

-motivasiyaedici və maraqlı təlim tapşırıqları;

-dəstəkləyici və həvəsləndirici təlim mühiti;

-sinifdə öyrənməyə dəstək olan köməkçi vasitələrdən səmərəli istifadə.

Aydındır ki, şəxsiyyət həmişə dəyişir, inkişaf edir, onda başqalarında mövcud olmayan yeni-yeni keyfiyyətlər əmələ gəlir. Təlimin səmərəli təşkili üçün şagirdlərin qeyd etdiyimiz xüsusiyyətlərini bilmək, bu xüsusiyyətlərin mənbəyindən baş çıxarmaq,onların əmələ gəlmə səbəblərini öyrənmək tələb olunur. Diferensial təlim vasitəsilə şagirdlərin təlim fəaliyyətindəki çatızmazlıqlar aradan qaldırılır, onlarda yeni-yeni keyfiyyətlər yaratmaq olur ki, bu keyfiyyətlər hər bir şagirdin sonraki təlim fəaliyyətində həlledici rol oynayır.

Görkəmli rus pedaqoqu K.D.Uşinski göstərirdi ki, bilavasitə təlim-tərbiyə işi ilə məşğul olan müəllim uşağı, onun inkişaf xüsusiyyətlərini, keçirdiyi həyat şəraitini yaxşı öyrənməlidir. "Əgər pedaqogika insanı hər cəhətdən tərbiyə etmək istəyirsə, o, əvvəlcə insanı hər cəhətdən də öyrənməlidir" müddəası Uşinskinin yaradıcılığında başlıca yerlərdən birini tutur.

Ən yaradıcı və müasir metodlardan istifadə dərsin maraqlı keçəcəyinə zəmanət deyil. Təcrübəli pedaqoqlar dərsi elə təşkil edirlər ki, dərs şagirdlər üçün şəxsi məna kəsb etsin və hər bir şagird özünü təlim fəaliyyətinin bərabərhüquqlu iştirakçısı kimi hiss edə bilsin. Diferensial təlim vasitəsilə müəllimin uşaqlara şəxsiyyət kimi yanaşmasında bir sıra üsullar təsvir edilir:

✓ Bir şagirdin müvəffəqiyyətini göylərə qaldırmaq, digərinin uğursuzluğunu kiçiltmək kimi qaydalardan uzaqlaşmaq arzuediləndir;

✓ Uşaqları bir-birinə qarşı qoymaqdan çəkinmək təlimin müvəffəqiyyət əldə etməsinin xeyrinə olardı;

- ✓ Sinifdə kimsəyə “ ağır sözlər” demək, auditoriya qarşısında onu təhqir etmək ənənəvi təhsildə olduğu kimi lazımi tərbiyəvi təsir göstərmir. Münasibətlərə soyuqluq gətirir;
- ✓ “Zəif” şagirdlərin kiçik müvəffəqiyyətlərini qiymətləndirmək, ancaq onu gözləməmək kimi bir mövqeyin nümayişinə imkan vermək;
- ✓ Göstərmək lazımdır ki, sinifdəki münasibətləri yalnız intellektuallıq deyil, qabiliyyətlilik, insanın başqalarına etdiiyi xeyirxahlıq, səmimi münasibətlər müəyyən edir. Təlimə qabillik-intellekt insan şəxsiyyətinin mühüm keyfiyyətlərindən, spesifik cəhətlərindən biridir, hamısı deyil. Bunu bütün sinfin dərk etməsinə şərait yaratmaq;
- ✓ Tez-tez özünəqapalı, “qeyri-maraqlı” uşaqlarla söhbət aparılarsa, digər uşaqlar müəllimin onlarla ünsiyyət qurmayan uşaqla maraqla söhbət apardığını görürlərsə, onlarda da həmin şagirdə qarşı müəyyən maraq yaranacaqdır. Bu isə həmin uşağın “şəxsiyyətlərarası münasibətlərə daxil” olunmasına şərait yaradacaqdır;
- ✓ Uşaqlarda qorxu və cəzalanma şəraiti yaradan vəziyyətlərdən uzaqlaşmaq tələb olunur;
- ✓ Şagirdlərin hər hansı məsələnin həllində səhv etmək hüququnu qəbul etmək və “fikri fəaliyyətdə” cəzasızlıq mühiti yaratmaq;
- ✓ Şagirdin təsəvvürlərinə, dünyagörüşünə, inkişaf səviyyəsinə və s. Görə ona fərdi yanaşmaq, onun fərdi psixoloji xüsusiyyətlərini nəzərə almaq;

Diferensiallaşma şagirdlərin əvvəlki bilik və bacarıqlarının qiymətləndirilməsindən və fərdi təlim məqsədlərinin müəyyən edilməsindən başlayır. Differensial təlim şagirdləri materialı öz maraqlarına və unikal öyrənmə üslublarına uyğun şəkildə öyrənməyə həvəsləndirir.

Sinifdə diferensal təlimi reallaşdırmaq üçün müxtəlif yanaşmalar mövcuddur. İstənilən halda diferensiallaşma zamanı şagirdlərin aşağıda göstərilən xüsusiyyətləri nəzərə alınır:

1. Şagirdlərin marağı – şagirdləri maraqlandıran sahə və mövzuların müəyyənləşdirilməsi
2. Hazırlıq səviyyəsi – şagirdlər nə öyrəniblər və nə öyrənməlidirlər
3. Öyrənmə tərzləri – şagirdlərin məzmunu hansı yolla daha yaxşı öyrənməsi

Biologiya müəllimləri şagird hazırlığına, marağına və ya öyrənmə tərzlərinə əsasən ən azı dörd təlim komponentini fərqləndirə bilər:




**Məzmun** – biologiya dərsi zamanı tədris olunan məzmun məzmun standartlarının tələblərinə uyğun olmalıdır. Lakin tədris zamanı sinifdə olan şagirdlərin bəziləri məzmunu tamamilə anlamaya bilər, bəziləri qismən mənimsəmiş ola bilər və bəziləri isə daha yaxşı qavraya bilərlər. Bunun üçün nə etməliyik? Şagirdlər üçün tapşırıq hazırlayarkən diqqət yetirmək lazımdır ki, bu tapşırıqlar Blum

taksonomiyasının mərhələlərinə (xatırlamaq, anlamaq, tətbiq etmək, təhlil etmək, dəyərləndirmək, yaratmaq) uyğun olsun. Sinifdə öyrənmə çətinlikləri olan şagirdlər xatırlamaq və anlamaq mərhələlərinə uyğun tapşırıqları, müəyyən qədər anlayışa sahib şagirdlər üçün tətbiq və təhlil etmək mərhələlərinə uyğun məzmunu əhatə edən tapşırıq, yüksək təfəkkür səviyyəsinə malik şagirdlər üçün isə dəyərləndirmək və yaratmaq mərhələlərinə uyğun sual və tapşırıqlar vermək məqsədəuyğundur.

**Proses** –hər bir şagirdin özünəməxsus öyrənmə tərzi vardır və uğurlu differensial təlim özündə məzmunun müxtəlif yollarla çatdırmağı ehtiva edir: vizual, eşidərək öyrənmə, kinestetik və oxuyub-yazaraq öyrənmə. Differensial təlimə görə bütün şagirdlər eyni dərəcədə müəllimin köməyinə ehtiyac duymur. Bəzi şagirdlər fərdi, bəziləri cütlərlə, bəziləri də qrupla işləməyi seçə bilərlər. Bəzi şagirdlər müəllim ilə fərdi şəkildə inkişaf elədiyi halda, bəziləri məzmunu qarşılıqlı əlaqə ilə daha effektiv mənimsəyirlər.

**Məhsul** - şagirdlər üçün tapşırıqların hazırlanması, şagirdlərə öz öyrənmə tərzlərinə uyğun məhsul hazırlamağa, nəticə hasil etməyə imkan yaratmaq lazımdır.

**Öyrənmə mühiti** - optimal öyrənmə üçün həm fiziki, həm də psixoloji elementlərin olması şərtdir. Fiziki amil sinifdə quruluşun və maddi texniki təminatın olmasını nəzərdə tutur. Psixoloji baxımdan isə müəllimlər təhlükəsiz və dəstəkləyici öyrənmə mühitini formalaşdıran sinif idarəetmə üsullarından istifadə etməlidirlər.

Aşağıdakı cədvəl diferensiallaşmanın komponentlərinin strategiyalarını anlamağa daha da yaxşı kömək edəcək:

**Cədvəl 1.** Biologiyanın tədrisində ənənəvi və diferensial yanaşmalarda differensiallaşma komponentlərinin nümunələri.




**Məzmun.**

Ənənəvi yanaşma: Müəllim Biologiya dərsində bütün şagirdlərə eyni bir əlavə məlumatı oxumağı tapşırıb onun ətrafında müzakirələr aparmağı planlaşdırır.

Differensial yanaşma: Müəllim şagirdlərin marağına və qavrama səviyyəsini nəzərə alaraq eyni mövzuya aid olan bir neçə əlavə məlumat müəyyənləşdirir. Bu məlumatlar oxunandan sonra müzakirə aparılacaq. Sonra müəllim Blum taksonomiyasına əsaslanaraq şagirdləri qavrama və təlim nailiyyəti baxımından necə qruplaşdıracağını, uyğun fəaliyyət növlərini və tapşırıqları müəyyən edir. Məsələn, bəzi şagirdlər müstəqil, bəziləri müəllimlə, bəziləri fərdi, bəziləri qrupda və s. işləyirlər.

**Proses.**

Ənənəvi yanaşma: Biologiya dərsində bütün şagirdlər fərdi şəkildə ardıcıllıqla aşağıdakı fəaliyyətləri yerinə yetirirlər: mövzunu müəyyənləşdirirlər, tənqidi yanaşırlar və mövzuya aid esse yazıb portfolioya qoyurlar.

Differensial yanaşma: Fəaliyyətlər şagirdlərin öyrənmə tərzləri nəzərə alınaraq müəyyənləşdirilir və sərbəst seçim imkanı verilir. Tapşırıqların birlikdə və ya fərdi, bəzilərinin sinifdə və ya evdə icrasına icazə verilir.

**Məhsul.**

Ənənəvi yanaşma: Biologiya tədrisində şagirdlər arqumentlər gətirməklə mühakimə xarakterli esse yazırlar. Bu zaman onlar müxtəlif mənbələrdən istifadə edə bilərlər.

Differensial yanaşma: Şagirdlər müxtəlif mənbələrdən istifadə etməklə mühakimə xarakterli mətni istəklərinə uyğun olaraq esse şəklində, şifahi təqdimat şəklində, qısametrajlı film şəklində təqdim edə bilərlər.

**Öyrənmə mühiti.**

Ənənəvi yanaşma: Biologiya dərsində müəllim daha çox qrup işlərinə üstünlük verir. Digər digər iş formalarından demək olar ki, istifadə etmir.

Differensial yanaşma: Müəllim sinifdə şagirdlərin malik olduğu müxtəlif şəxsiyyət tiplərini nəzərə alaraq müxtəlif iş formalarından aktiv isitifadə edir. Bu fərdi və ya ünsiyyətlə öyrənməyə üstünlük verən şagirdlər üçün uyğun psixoloji və mənəvi mühitin yaranmasını təmin edir.

Biologiyanın tədrisində differensial təlimin bir sıra üstünlükləri və çatışmazlıqları vardır.

Üstünlüklər:

• Tədqiqatlar göstərir ki, differensial təlim yüksək qabiliyyətli şagirdlərlə yanaşı əlilliyi olan şagirdlər üçün də effektivdir.

• Şagirdlərə materialı necə öyrənə biləcəklərinə dair daha çox seçim veridikdə, onlar öz öyrənmələri üçün daha çox məsuliyyət götürürlər.

• Müəllimlər öyrənmə prosesini şagirdlərin təlim ehtiyaclarına görə etdiyindən siniflərdə daha az nizam-intizam problemlərinin olduğu müşahidə edilir, əvəzində şagirdlərin öyrənmə ilə daha çox məşğul olduğu görünür.

Çatışmazlıqlar:

• Diferensial təlim biologiya dərsinin planlaşdırılması zamanı daha çox iş tələb edir və bir çox müəllimlər əlavə vaxt tapmaqda çətinlik çəkirlər.

• Bəzi məktəblərdə maddi-texniki təminat və resurs çatışmazlığı ola bilər.

“Məncə, differensial təlim əslində sadəcə uşaq nəzərə alınmaqla öyrətməkdir” deyə diferensial təlimdə qabaqcıl hesab edilən müəllif və müəllim Carol Ann Tomlinson yazır. O, təcrübəni - “öyrənmə haqqında düşünmə üsuludur ki, bu, bizə çox aydın, çox əhəmiyyətli olan öyrənmə məqsədləri qoymağımızı və sonra şagirdlərə nəzər salaraq öyrətməyimizi təklif edir”.

**Nəticə**

“Akademik cəhətdən müxtəlif siniflərdə təlimi necə fərqləndirmək olar” adlı kitabında o, belə izah edir: “Eyni yaşda olan uşaqların ölçüləri, hobbiləri, şəxsiyyətləri və ya şəxsiyyətlərarası münasibətlər baxımından bir-birinə bənzədiklərindən daha çox öyrənməyə gəldikdə, onların hamısı eyni deyil. Az və ya heç bir şəkildə fərqləndirilməmiş bir sinifdə yalnız şagird oxşarlıqları mərkəzi yer tutur. Fərqləndirilmiş sinifdə ümumi cəhətlər qəbul edilir , şagird fərqləri təlim və öyrənmədə mühüm elementlərə çevrilir”.

**Ədəbiyyat**

1. Allahyarova, S. (2000). *Differensial yanaşma təlimdə geridə qalmanın aradan qaldırılması yolu kimi*. Bakı, (2), 48-51.
2. Azərbaycan Respublikasının Ümumtəhsil Məktəbləri üçün Biologiya fənni üzrə Təhsil Proqramı (kurikulum). (2013). Ə. Urxan (tərt. ed.). Bakı: Azərbaycan Respublikası Təhsil Nazirliyi, 7.
3. Azərbaycan Respublikasında Ümumi Təhsilin Konsepsiyası (Milli Kurikulumu). (2010). *Azərbaycan məktəbi*, (2), 5.
4. Səfərova, E. F. (2022). Ali məktəblərdə tədris olunan bioloji qanunların fəal təlim metodları ilə tədrisi imkanları. *Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri*, (4), 176.
5. Səfərova, E. F. (2015). Biologiyanın tədrisində şagirdlərə İKT bacarıqlarının aşılanması. *Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun Elmi əsərləri*, (2), 105-108.
6. Riza Mae, S. S., Genelita, S. G., & Josephine, E. T. (2020). Differentiated teaching strategies of selected topics in biology. *Ioer International Multidisciplinary Research Journal*, 2(3), 155.
7. Tomlinson, C. A. (1996). Good teaching for one and all: Does gifted education have an instructional identity? *Journal for the Education of the Gifted*, 19(2), 155–174.
8. Tomlinson, C. A. (1995). *Deciding to differentiate instruction in middle school: One school's journey*. Alexandria, VA: ASCD, 77-87.
9. Tomlinson, C. A. (1996). *Differentiating instruction for mixed-ability classrooms* [An ASCD professional inquiry kit]. Alexandria, VA: ASCD, 155-174.

10. Tomlinson, C. A. (1997). *Differentiating instruction: Facilitator's guide*. Alexandria, VA: ASCD.
11. Tomlinson, C. A. (1999). *The differentiated classroom: Responding to the needs of all learners*. Alexandria, VA: ASCD, 101-105
12. Tomlinson, C. A. (1995). *How to differentiate instruction in mixed ability classrooms*. Alexandria, VA: ASCD, 52-60.
13. UNICEF. (2014). *Vebinar 11, Əlçatan məktəb və təlim mühiti – Universal Öyrənmə Dizaynı*. Texniki məlumat kitabçası. Nyu-York: UNICEF.
14. UNICEF. (2014). Vebinar 12, Müəllim, inklüziv və uşaqyönümlü təlim və pedaqogika. *Texniki məlumat kitabçası*. Nyu-York: UNICEF.

DOI: https://doi.org/10.36719/2663-4619/113/107-111

**Xədicə Hidayətova**
Bakı Dövlət Universiteti
https://orcid.org/0009-0000-7185-4183
khadijahidayatova@gmail.com

# Respublika iqtisadiyyatı məhsuldarlığının xərclər-buraxılış modelinin birbaşa xərclər əmsalları matrisinin məxsusi qiymətləri vasitəsilə dəyərləndirilməsi

**Xülasə**

İqtisadiyyatda əmək məhsuldarlığı firma və müəssisələrin istehsal fəaliyyətində mühüm amildir. Nəzərdən keçirilən işdə Xərclər-Buraxılış cədvəli əsasında ölkənin məhsuldarlığı birbaşa məsrəf əmsalları matrisinin məxsusi qiymətləri vasitəsilə qiymətləndirilmişdir. Bunun üçün Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi tərəfindən tərtib edilmiş 2016-cı il üzrə sahələrarası balans hesabatlarından istifadə edilmişdir. Sahələrarası balans cədvəlinin tərtibi və müvafiq modelin işlənməsi və realizasiyası üzrə tədqiqatların aparılması aktual məsələlərdən hesab olunur. Bu mübadilənin təhlili, iqtisadi planların tərtib olunması, sahə göstəricilərinin dəyişənlərdən asılılığının müəyyənləşdirilməsi zərurəti meydana çıxır. Bu məqalədə excel cədvəl prosessoru vasitəsilə Sahələrarası balans tənlikləri həll edilmiş, məxsusi ədədlər Mathlab riyazi proqram paketi vasitəsilə tədqiq edilmiş, simulyasiya modeli qurulmuş, multiplikativ effektlər dəyərləndirilmiş, alınan nəticələr təhlil edilmiş və müəyyən təkliflər verilmişdir.

***Açar sözlər:*** *xərclər-buraxılış modeli, məxsusi ədədlər, sahələrarası balans tənlikləri, neft və qeyri-neft sektorları, ölkə iqtisadiyyatı*

**Khadija Hidayatova**
Baku State University
https://orcid.org/0009-0000-7185-4183
khadijahidayatova@gmail.com

# Evaluation of National Economic Productivity Based on the Eigenvalues of the Direct Cost Coefficient Matrix Within the Input-Output Model

**Abstract**

In the economy, labor productivity is an important factor in the production activity of firms and enterprises. In the work under review, on the basis of the İnput-Output table, the productivity of the country was evaluated directly through the specific values of the matrix of cost coefficients. For this, inter-sectoral balance reports for 2016 compiled by the State Statistics Committee of the Republic of Azerbaijan were used. Compilation of the intersectoral balance sheet and conducting research on the development and implementation of the corresponding model are considered urgent issues. There is a need to analyze this exchange, draw up economic plans, and determine the dependence of field indicators on variables. In this article, intersectoral balance equations were solved using the Excel table processor, specific numbers were studied using the Mathlab mathematical software package, a simulation model was built, multiplicative effects were evaluated, the obtained results were analyzed and certain suggestions were given.

***Keywords:*** *input-output model, eigenvalues, interfield balance equations, oil and non-oil sectors, country's economy*

## Giriş

Məhsuldarlıq - istehsal xərcləri ilə istehsalın həcmi arasındakı əlaqəni xarakterizə edən göstəricidir (Hüseynli, 2020).

 

Məhsuldarlığının tədqiqində zəruri olan məsələlərdən biri də bu göstəricinin ölçülməsidir. Ümumilikdə ölçmə hər hansı bir obyektin vəziyyətini tədqiq və təhlil etməyə, ona təsir etməyə və s. imkan verir. Əmək məhsuldarlığının iqtisadiyyatın zəruri səmərəlilik göstəricilərindən biri olduğunu nəzərə aldıqda istər bütövlükdə ölkə iqtisadiyyatı, istərsə də müəssisə və.s üçün əmək məhsuldarlığının səviyyəsinin, onun artım templərinin dəqiq müəyyənləşməsinin əhəmiyyəti öz-özlüyündə aydınlaşır. Ölkədə neft sektorunda gəlirlərin artması fonunda qeyri – neft sektorunun inkişaf etdirilməsi hazırki dövrdə müasir problemlərdən sayılır. Belə vəziyyətdə iqtisadi sahələrin bir-birilə əlaqələrinin təhlili olmadan neftdən əldə edilən gəlirlərin səmərəli istifadə olunmasının ədədi xarakteristikalarının qiymətləndirilməsi qeyri-mümkündür. Bu baxımdan, məqalədə sahələrarası balans cədvəli neft və qeyri-neft sektorları üzrə qruplaşdırılmış və bu sektorlar üzrə əlaqəsini əks etdirən ölkə iqtisadiyyatının qiymətləndirilməsi birbaşa xərc əmsalları matrisinin məhsuldarlığının yoxlanması ilə həyata keçirilmişdir.

**Tədqiqat**

Məhsuldarlığın qiymətləndirilməsi üçün Xərclər-Buraxılış üsuluən ideal vasitə hesab olunur (Həsənli, 2012). Bunun üçün sahələrarası balans tənlikləri

$$a_{ij} = \frac{x_{ij}}{X_j} \quad i,j=1,2,...,n \qquad (1)$$

şəklində ifadə olunur. Burada - $X_i$ (i=1,2,...,n) i-ci sahənin məhsul və xidmətlərin buraxılış həcmini, $x_{ij}$ (i,j=1,2,...,n) - $i$-ci sahənin məhsul istehsalı üçün $j$-ci sahəyə göndərdiyiməhsulun (aralıq tələb, aralıq məhsul) miqdarını A – birbaşa tələbatlar matrisi (birbaşa xərclər əmsallarından ibarət kvadrat matris) ifadə edir. Başqa cür desək, A matrisi özündə istehsal texnologiyasını əks etdirməsi baxımından texnoloji matris adlanır. A matrisindən istifadə edərək məhsuldarlığın qiymətləndirilməsinə baxaq. Matrisin məhsuldarlığının qiymətləndirilməsi üçünbir neçə üsul mövcuddur. Bunlar-dan biridə məxsusi ədədlərlə qiymətləndirmə metodudur. İstənilən 0-dan fərqli x vektoru üçün aşağıdakı

$$Ax=\lambda x \, , x \neq 0 \qquad (2)$$

münasibət ödənərsə, onda $x$ vektoruna A matrisinin məxsusi vektoru deyilir. λ skalyarına isə A matrisinin $x$ məxsusi vektoruna uyğun məxsusi ədədi deyilir. Burada A n×n ölçülü kvadrat matrisidir. Buradan çıxan xassələrə əsasən göstərəbilərik ki, kvadratik forma yalnız o zaman müsbət müəyyən olunur ki, A matrisinin bütün məxsusi ədədləri üçün

$\lambda_j>0 \quad \boldsymbol{j = \overline{1,n}}$ olsun (İsgəndərov, Həsənli, Sadıqova, 2012).

Beləliklə, ölkə iqtisadiyyatının məhsuldarlığını qiymətləndirmək üçün biz ilk öncə Azərbaycan iqtisadiyyatının sahələrarası əlaqələrini özündə əks etdirən sahələrarası balans cədvəlinin birbaşa xərc əmsalları matrisini hesablayacağıq. Daha sonra isə alınmış matrisin məxsusi ədədlərini tapmaqla onun müsbət müəyyən matris olub olmamasını müəyyən etməklə iqtisadiyyatın məhsuldarlığı haqqında nəticəyə gələcəyik.

Azərbaycanda 2016-cı il Sahələrarası balans tənliklərinə əsasən məxsusi ədədlər vasitəsilə ölkə məhsuldarlığının qiymətləndirilməsi.

Tədqiqatın məlumat bazası kimi Azərbaycanın sonuncu mövcud olan 2016-cı ilə aid sahələrarası balans cədvəlindən istifadə edilmişdir (Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi, 2016). Məhsuldarlığının hesablanması üçün ilk öncə 96x96 sahəlik sahələrarası balans cədvəli qruplaşdıraraq, 2x2 sahəlik yəni neft və qeyri-neft sektorlarından ibarət sahələrarası balans cədvəlinə gətirilmişdir. Alınmış 2 sahəlik sahələrarası balans cədvəli Cədvəl 1-də əks olunmuşdur.

**Cədvəl 1: 2016-cı ilə aid Azərbaycanın neft və qeyri-neft sektorları üzrə sahələrarası balans cədvəli.**

| Sahələr | Neft | | Qeyri-neft | Aralıq istehlaka sərf olunan cəmi ehtiyatlar | Son Məhsul | Əsas qiymətlərlə cəmi istifadə edilmiş yerli məhsul |
|---|---|---|---|---|---|---|
| Neft | | 14122 | 2358949 | 3771151 | 18567340 | 21201118 |
| Qeyri-neft | | 11406 | 25050530 | 26191134 | 36936479 | 66514162 |
| Xalis vergilər | | 80972. | 2168203 | 2249176 | 55503819 | 4921381 |
| Cəmi aralıq istehlak | | 26337 | 29577683 | 32211461 | | 92636661 |
| Əsas kapitalın istehlakı | | 61237 | 3385125 | 3997500 | | |
| Əsas qiymətlərlə əlavə dəyər | | 18567 | 36936479 | 55503819 | | |
| Əsas qiymətlərlə ümumi buraxılış | | 21201 | 66514162 | 87715280 | | |

**Mənbə: Müəllifin hesablamaları**

Yuxarıda qeyd etdiyimiz kimi məhsuldarlığın qiymətləndirilməsi üçün birbaşa xərc əmsalları matrisindən istifadə olunur. Ona görə də tədqiqatda ikinci addım olaraq birbaşa xərc əmsalları hesablanmışdır. Bunun üçün də Excel proqramından istifadə edilmişdir.

Bunun üçün 2 sahəyə gətirilən sahələrarası matrisdəki aralıq istehlakın qeyd olunmuş qiymətlərinin hər biri müvafiq sütunun altındakı buraxılış rəqəminə bölünür. Və çıxış rəqəmini düsturda $ işarəsi ilə fiks etməklə, düsturu sürüşməsini məhdudlaşdırırıq və beləliklə sütun dəyəri dəyişmir (Əliyev, & Əliyeva, 2011). Sonra düsturu sağa və aşağıya doğru sürüşdürərək birbaşa xərc əmsalları matrisi olan A matrisini almış oluruq.

**Cədvəl 2: 2016-cı ilə aid Azərbaycanın neft və qeyri-neft sektorlarının texnoloji matrisi, milyon manat.**

| Sahələr | | Neft | Qeyri-neft | Aralıq istehlaka sərf olunan cəmi ehtiyatlar | Son Məhsul | Əsas qiymətlərlə cəmi istifadə edilmiş yerli məhsul |
|---|---|---|---|---|---|---|
| Neft | | 0.06660 | 0.03546 | 3771151 | 18567340 | 21201118 |
| Qeyri-neft | | 0.05379 | 0.37661 | 26191134 | 36936479 | 66514162 |
| Xalis vergilər | | 80972 | 2168203 | 2249176 | 55503819 | 4921381 |
| Cəmi aralıq istehlak | | 26337 | 29577683 | 32211461 | | 92636661 |
| Əsas kapitalın istehlakı | | 61237 | 3385125 | 3997500 | | |
| Əsas qiymətlərlə əlavə dəyər | | 18567 | 36936479 | 55503819 | | |
| Əsas qiymətlərlə ümumi buraxılış | | 21201 | 66514162 | 87715280 | | |

**Mənbə:** Müəllifin hesablamaları

Qiymətləndirmə Mathlab riyazi proqramlaşdırma aləti və Excel cədvəl prosessorunun OLE

texnologiyası vasitəsilə cari göstəricilərinin əlaqələndirilməsi ilə aparılır. Proqrama Excel işçi vərəqini >>xlsread()komandası ilə çağırıb, daha sonra >>eig() komandası vasitəsilə məxsusi ədədlər hesablanır (Rüstəmov, Məmmədova, 2019)

```
>>clc
>>clear all
>>xlsread("Amat.xlsx")
ans =

0.0666          0.0355
0.0538          0.3766
>>>eig(ans)ans =
0.0606
0.3827
```

Beləliklə, 2016-cı sahələrarası balans cədvəli üçün baxılan sahələr üzrə məxsusi ədədləri 0.06 və 0.38 tapdıq. Göründüyü kimi hər iki məxsusi ədəd müsbət müəyyənləşib. Bu da o deməkdir ki, ölkə iqtisadiyyatı məhsuldardır. Bu məhsuldarlığı multivlikativ effekt ilə şərh edək. Beləki neft və ya qeyri-neft sektorlarına investisiyanın qoyulması ilə onun ümumi buraxılışa təsirini aydın şəkildə görmək olar**.**

**Cədvəl 3: Neft sektoruna qoyulan 1milyon manat investisiyanın multiplikativ effektləri.**

| Sahə adı | Ümumi buraxılışın dəyişməsi | Ümumi buraxılışın dəyişməsi | Əlavə dəyərin (ÜDM) dəyişməsi | Multipikator |
|---|---|---|---|---|
| | faizlə | mln man | mln man | |
| Neft | 5.06 | 107.4 | 9413 | 1.16 |
| Qeyri-neft | 1.39 | 9276 | 2956 | |
| Cəmi | | 1167 | 9709 | |

**Mənbə**: Müəllifin hesablamaları

Neft sektoru üzrə dövlət xərclərinin 10 mln manatlıq artımının Ümumi buraxılışın həcminə 107,4 milyon manatlıq artım yaradır. Qeyri-Neft sektorunda isə bu rəqəm 160.94-dir. 2016-cı il statistikasına əsasən Neft sektoruna qoyulan 10 milyon manatlıq investisiya Ümumi buraxılış həcmini Neft (6,8,9) sektoru üzrə-31,9 mln manat, Qeyri-neft sektoru üzrə isə-67,7 mln manat, Ümumi buraxılışın cəmi həcmini isə 99,3 mln manat dəyişmişdir (United Nations, 1999).

**Cədvəl 4: Qeyri-Neft sektoruna qoyulan 1milyon manat investisiyanın multiplikativ effektləri.**

| Sahə adı | Ümumi buraxılışın dəyişməsi | Ümumi buraxılışın dəyişməsi | Əlavə dəyərin (ÜDM) dəyişməsi | Multipikator |
|---|---|---|---|---|
| | faizlə | mln man | mln man | |
| Neft | 0.0028 | 611.5 | 535.5 | |
| Qeyri-neft | 0.0242 | 160.94 | 5130.0 | 1.67 |

| | | | | |
|---|---|---|---|---|
| Cəmi | | 167.05 | 5665.5 | |

**Mənbə**: Müəllifin hesablamaları

2016-cı il statistikasına əsasən Qeyri-neft sektoruna qoyulan 10 milyon manatlıq investisiya Ümumi buraxılış həcmini Neft (6,8,9) sektoru üzrə-21,2 mln manat, Qeyri-neft sektoru üzrə isə-66,5 mln manat, Ümumi buraxılışın cəmi həcmini isə 87,7 mln manat dəyişmişdir. Buradan da öz növbəsində Qeyri-Neft sektoruna yatırılan investisiyanın daha çox multiplikativ effekt yaratdığını görmək olar (Tinbergen, 1956).

## Nəticə

Baxılan işdə məhsuldarlıq məxsusi ədədlər vasitəsilə qiymətləndirildi. Alınan ədədlərin müsbət olması bizə ölkə iqtisadiyyatının məhsuldarlığından xəbərverir. Daha sonra neft və qeyri neft sektotlarına qoyulan investisiyaların multiplikativ effektləri qiymətləndirildi. Xərclər Buraxılış modeli vasitəsilə modelin nəticəsinə görə Neft sektoruna yatırılan 10 milyon investisiya 21.2 milyon manat ümumi buraxılışı artırır, Qeyri-neftə qoyulan investisiya isə 87.7 milyon manat artım verir. Görünür ki Qeyri-neftə qoyulan investisiya Ümumi buraxılışı daha çox artırır. Amma hər iki sektorüçün multiplikativ effekt vahiddən böyükdür. Neft sektoru üzrə bu rəqəm 1.16, Qeyri-Neft sektoru üzrə isə 1.67-dir. Bu da ölkə iqtisadiyyatının məhsuldarlığını bir daha təsdiq edir.

Dövlətin investisiya siyasəti və ölkənin iqtisadi vəziyyəti nəzərə alınaraq qəbul edilən qərarlar müxtəlif modellər vasitəsilə daha effektiv şəkildə yönəldilə bilər. Bu modellər, xüsusilə investisiyaların hansı sektorlar üçün daha səmərəli və məhsuldar olacağını müəyyənləşdirmək baxımından əhəmiyyətli rol oynayır. Belə modellər vasitəsilə investisiya sahələrinin prioritetliyi təhlil edilir, potensial risklər qiymətləndirilir və resursların optimal bölgüsü təmin olunur. Nəticə etibarilə, dövlətin qəbul etdiyi qərarlar daha əsaslı və məqsədyönlü olur ki, bu da iqtisadi artımın davamlılığını və dayanıqlığını təmin edir. Bu yanaşma, həmçinin uzunmüddətli strateji planlamada düzgün istiqamətlərin seçilməsinə kömək edir və iqtisadi siyasətin ümumi effektivliyini artırır.

## Ədəbiyyat

1. Əliyev, Ə., & Əliyeva, R. (2011). *İqtisadi inkişafın modelləşdirilməsi problemləri*. Azərbaycan Milli Elmlər Akademiyası İqtisadiyyat İnstitutu, Bakı.
2. İsgəndərov, A. D., Həsənli, Y. H., & Sadıqova, A. T. (2012). *Optimallaşdırma üsullarının iqtisadi məsələlərə tətbiqi*, 38-41.
1. Hüseynli, İ. (2020). Əmək məhsuldarlığı səmərəliliyin vacib amili kimi: artırılması və hesablanması yolları. *İpək Yolu*, (4), 20–28.
3. Həsənli, Y. (2012). *Azərbaycan iqtisadiyyatının sahələrarası əlaqələrinin modelləşdirilməsi*. Bakı: Elm.
4. Rüstəmov, Q. Ə., & Məmmədova, A. T. (2015). *MATLAB/Simulinkdə modelləşdirmə,* 78-79.
5. Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi. (2016). https://www.stat.gov.az/
6. United Nations. (1999). *Handbook of input-output table: Compilation and analysis*. New York: United Nations.
7. Tinbergen, J. (1956). *Economic policy: Principles and design*. Amsterdam: North-Holland Publishing.

DOI: https://doi.org/10.36719/2663-4619/113/112-117

**İsmayıl Şəfaqətov**
Azərbaycan Dövlət İqtisad Universiteti
magistrant
https://orcid.org/0009-0009-3167-7966
ismayilshefagetov@gmail.com

# İnsan kapitalının idarə edilməsində innovasiya

**Xülasə**

İnnovativ insan kapitalının idarə edilməsi kiçik və orta müəssisələrin (KOB) əməliyyatlarına və böyüməsinə mühüm təsir göstərir, onların rəqabət qabiliyyətini, uyğunlaşma potensialını və davamlılığını artırır. İstedadların cəlb edilməsi, saxlanılması və inkişafı üçün müasir yanaşmalardan istifadə etməklə, KOB-lar innovasiya və səmərəliliyi təşviq edən ixtisaslı mütəxəssisləri cəlbetmə qabiliyyətlərini gücləndirirlər. İşə qəbul prosesində texnologiyadan yararlanmaq, işçilərin ixtisas səviyyəsini yüksəltməyə sərmayə yatırmaq və fasiləsiz öyrənmə mədəniyyətini inkişaf etdirmək kimi əsas strategiyalar KOB-lara işçi qüvvəsinin potensialından maksimum istifadə etməyə şərait yaradır. Çevik iş modelləri və inklüziv idarəetmə siyasətləri işçilərin məmnuniyyətini və məhsuldarlığını artıraraq, eyni zamanda dövriyyə nisbətlərini və əməliyyat pozuntularını minimuma endirir.

İnsan kapitalının idarə edilməsində tətbiq olunan innovativ yanaşmalar işçilərin fərdi məqsədlərinin təşkilatın ümumi hədəfləri ilə daha yaxşı uyğunlaşmasını təmin edir. Məsələn, performansa əsaslanan həvəsləndirmə sistemləri və fərdiləşdirilmiş təlim proqramları işçiləri biznes nəticələrinin yaxşılaşdırılmasına fəal şəkildə töhfə verməyə sövq edir. Bununla yanaşı, insan kapitalının inkişafına strateji diqqət yetirən KOB-lar bazar dəyişikliklərinə daha çevik reaksiya verə bilir, çünki bacarıqlı və uyğunlaşa bilən işçi qüvvəsi iqtisadi qeyri-müəyyənliklər şəraitində dayanıqlığın qorunmasına imkan yaradır.

Rəqabətli biznes mühitində uğurlu insan kapitalı strategiyaları KOB-lara daha möhkəm müştəri münasibətləri qurmağa, xidmət keyfiyyətini yüksəltməyə və uzunmüddətli inkişaf perspektivlərini genişləndirməyə kömək edərək, onları fərqləndirir. Nəticə etibarilə, innovativ insan kapitalının idarə edilməsi KOB-ları dəyişən iqtisadi şəraitdə çevik və dinamik təşkilatlara çevirərək, onların davamlı inkişafını təmin edir.

***Açar sözlər:*** *insan kapitalı, innovativ insan kapitalı, insan kapitalının idarə edilməsi, KOB, biznes fəaliyyəti*

**Ismayil Shafagatov**
Azerbaijan State University of Economics
Master student
https://orcid.org/0009-0009-3167-7966
ismayilshefagetov@gmail.com

# Innovation in Human Capital Management

**Abstract**

Innovative human capital management has a profound impact on the operations and expansion of small and medium-sized enterprises (SMEs), strengthening their competitiveness, adaptability, and long-term sustainability. By implementing contemporary strategies for talent acquisition, retention, and development, SMEs improve their capacity to attract highly skilled professionals who play a crucial role in fostering innovation and enhancing efficiency.

Fundamental strategies such as utilizing technology in the hiring process, investing in workforce upskilling, and cultivating a culture of continuous learning enable SMEs to maximize their human capital potential.

Additionally, flexible work arrangements and inclusive workplace policies contribute to increased employee satisfaction and productivity while simultaneously reducing turnover rates and minimizing operational disruptions.

The integration of innovation into human capital management ensures a stronger alignment between employees' personal objectives and the broader goals of the organization. For example, performance-driven incentive structures and customized training programs motivate employees to take an active role in improving business outcomes.

Moreover, SMEs that prioritize human capital innovation are better positioned to adapt to market fluctuations, as a proficient and flexible workforce provides resilience during periods of economic uncertainty. In an increasingly competitive business environment, well-structured human capital strategies empower SMEs to distinguish themselves by fostering stronger customer relationships, enhancing service quality, and securing sustainable long-term growth.

Ultimately, the application of innovative human capital management transforms SMEs into agile and forward-thinking organizations, equipping them with the necessary tools to thrive in an ever-evolving economic landscape.

***Keywords:*** *human capital, innovative human capital, human capital management, SME, business activity*

## Giriş

İnsan kapitalının idarə edilməsində innovasiya bir sıra əsas amillərə görə yüksək aktuallıq kəsb edir. Belə ki, bildiyimiz kimi KOB-lar iqtisadiyyatın dayağı hesab edilir və məşğulluğa, ÜDM-ə və innovasiyaya əhəmiyyətli töhfə verir. Onların bazar şərtlərinə uyğunlaşma və rəqabət qabiliyyəti insan kapitalının səmərəli idarə olunmasından birbaşa asılıdır.

Rəqəmsal transformasiya və Sənaye 4.0-ın inkişafı iş dünyasının xarakterini və tələb olunan bacarıqları dəyişdirib. İnnovativ HCM yanaşmaları KOB-ların bu dəyişikliklərə adaptasiya olmasına, işçi qüvvələrini kritik rəqəmsal və yumşaq bacarıqlarla təmin etməsinə kömək edir. Rəqabətli bazar mühitində yüksək ixtisaslı mütəxəssislərin cəlb edilməsi və saxlanması, resurs məhdudiyyətləri səbəbindən, çox vaxt iri korporasiyalarla müqayisədə KOB-lar üçün daha çətin olur. Çevik iş modelləri, fərdiləşdirilmiş karyera inkişafı imkanları və işçilərin motivasiyaedici təşəbbüsləri kimi innovativ HCM strategiyaları KOB-ların cəlbedici iş mühiti formalaşdırmasına töhfə verir.

**Tədqiqat**

Effektiv insan kapitalının idarə edilməsi KOB-ların rəqabətədavamlı olmasını təmin edən məhsuldarlığı və innovasiyanı gücləndirir. İşçi qüvvəsinin təlimi, inkişafı və səlahiyyətlərinin artırılmasına yönəlmiş sərmayələr KOB-ların əməliyyat səmərəliliyini artırmasına və problemlərin yaradıcı həll yollarını tapmasına imkan yaradır. Müasir işçi qüvvəsi yaş, mədəniyyət və fərqli gözləntilər baxımından getdikcə daha çox müxtəliflik nümayiş etdirir. İnnovativ HCM yanaşmaları KOB-ların bu müxtəliflikdən inklüzivliyi, əməkdaşlığı və çarpaz funksional öyrənməni təşviq etməklə faydalanmasına imkan verir (Hitt, & Ireland, 2020).

Bundan əlavə, KOB-lar bacarıq çatışmazlığı və yüksək işçi dövriyyəsi kimi əmək bazarı problemləri ilə üzləşirlər. Məlumata əsaslanan işə qəbul strategiyaları və işçi qüvvəsi analitikası kimi innovativ həllər KOB-lara bu problemləri daha yaxşı anlamaq və effektiv həll yolları tapmaq imkanı verir. Bir çox KOB-lar biznes strategiyalarına davamlılıq prinsiplərini inteqrasiya edir. Yenilikçi HCM insan resurslarını davamlılıq və korporativ sosial məsuliyyət məqsədləri ilə uyğunlaşdırmaqla şirkətin nüfuzunu və maraqlı tərəflərin etibarını artırır.

Bundan əlavə, qlobal pandemiyalar və iqtisadi tənəzzüllər kimi qeyri-müəyyən və böhran vəziyyətlərində innovativ HCM yanaşmaları KOB-ların dayanıqlılığını artırır. Belə idarəetmə modelləri motivasiyalı və yeni çağırışlara uyğunlaşa bilən işçi qüvvəsinin formalaşmasına kömək edir. Bütün bu amilləri nəzərə alaraq, innovativ insan kapitalının idarə edilməsi yalnız KOB-ların inkişafını və rəqabətədavamlılığını təmin etmir, eyni zamanda daha geniş iqtisadi və sosial faydalar yaradır. Bu kontekstdə, KOB sektorunda qabaqcıl insan kapitalı strategiyalarının öyrənilməsi və tətbiq olunması böyük əhəmiyyət daşıyır.

Tədqiqatın məqsədi innovativ insan kapitalının idarə edilməsinin kiçik və orta biznesin fəaliyyətinə təsirini araşdırmaqdır.

Bu tədqiqat işində təhlil, sintez, tarixi və müqayisəli metodlardan istifadə olunmuşdur. Elmi nəticələrə nail olmaq üçün sistemli, proses, resurs və effektiv yanaşmalara əsaslanılmışdır.

Tədqiqatçılar və ekspertlər mövzu ilə bağlı müxtəlif baxışlara malik olduqları üçün optimal yanaşma ilə bağlı konsensusun olmaması müşahidə edilir. Bu fikir ayrılığı tədqiqat nəticələrinin ümumiləşdirilməsini və onların praktiki tətbiq imkanlarını məhdudlaşdırır.

**İnnovativ insan kapitalının idarə edilməsi**

Sürətlə dəyişən biznes mühitində insan kapitalının idarə edilməsində Data-Driven Decision Making (DDDM) inqilabi strategiya kimi meydana çıxmış və təşkilatlara işçi qüvvəsini daha effektiv şəkildə idarə etmək imkanı vermişdir. İnsan resursları analitikasından yararlanmaqla şirkətlər istedadların cəlb edilməsi, işçilərin inkişafı və onların saxlanılması istiqamətində məlumat əsaslı qərarlar qəbul edə bilərlər. HR analitikasının ən mühüm tətbiq sahələrindən biri performans qiymətləndirməsidir. Ənənəvi performans dəyərləndirmələri çox vaxt subyektiv yanaşmalara söykənirdi, lakin məlumat əsaslı yanaşmalar təşkilatlara işçilərin fəaliyyətini obyektiv göstəricilər əsasında qiymətləndirməyə imkan yaradır. Bu göstəricilər arasında satış həcmi, layihələrin tamamlanma nisbətləri və ya müştəri məmnuniyyəti skorları yer ala bilər. Bu yanaşma performans qiymətləndirmələrinin ardıcıl, ölçülə bilən meyarlara əsaslanmasını təmin etməklə yanaşı, subyektivliyi aradan qaldırır və qiymətləndirmələrin dəqiqliyini artırır (Kaufman, 2014, p. 100).

Bundan başqa, HR analitikası işçi qüvvəsi trendlərini təhlil edərək və bacarıq boşluqlarını aşkar edərək istedad tələbatını proqnozlaşdırmağa yardımçı olur. Məsələn, işçi dövriyyəsi və əməkdaşların karyera inkişaf trayektoriyasını izləməklə, təşkilatlar yaxın dövrlərdə hansı vəzifələrə yeni istedadların lazım olacağını öncədən müəyyən edə bilərlər. Bu proqnozlaşdırma qabiliyyəti HR komandasına potensial çatışmazlıqları vaxtında müəyyənləşdirib aradan qaldırmaq imkanı yaradır, nəticədə biznes inkişaf və dəyişikliklərə daha hazırlıqlı olur.

HR analitikasının digər vacib istiqamətlərindən biri işçilərin məşğulluq səviyyəsinin, işdə qalma müddətinin və məhsuldarlığının ölçülməsidir. Sorğular, rəy toplama vasitələri və işçi performansı göstəriciləri vasitəsilə şirkətlər əməkdaşlarının məmnuniyyət səviyyəsini qiymətləndirə və onların işdən ayrılmasına səbəb olan əsas amilləri müəyyən edə bilərlər. Dövriyyə və məhsuldarlıqla bağlı problemlərin əsas köklərini aşkar etməklə, HR bölmələri iş mühitinin yaxşılaşdırılması, fərdiləşdirilmiş inkişaf proqramlarının tətbiqi və ya əməkhaqqı siyasətinin yenilənməsi kimi konkret həllər həyata keçirə bilər (Noe, Hollenbeck, Gerhart, & Wright, 2020).

Nəticə etibarilə, insan kapitalının idarə edilməsində məlumat əsaslı qərarların qəbul edilməsi təşkilatlara işçi qüvvəsinin idarə olunmasına daha strateji yanaşmaq imkanı yaradır. Bu yanaşma yalnız biznes məqsədlərinə uyğun qərarların qəbul edilməsini təmin etmir, eyni zamanda fasiləsiz təkmilləşmə və innovasiya mədəniyyətini formalaşdıraraq işçilərin məmnuniyyətini, iş yerində qalma səviyyəsini və ümumi təşkilati nəticələri artırır.

Müasir insan kapitalının idarə edilməsində işçi təcrübəsi əsas diqqət mərkəzində dayanaraq, ənənəvi işçi məmnuniyyəti konsepsiyasından daha geniş yanaşmaya doğru irəliləyir. Bu dəyişiklik işçilərin özlərini dəyərli, dəstəklənmiş və motivasiyalı hiss etdikləri bir mühitin yaradılmasının vacibliyini vurğulayır. Şirkətlər dərk edirlər ki, əməkdaşların rifahı, iş-həyat balansı və müsbət korporativ mədəniyyətin formalaşdırılması onların məhsuldarlığının artırılmasında və iş yerində uzun müddət qalmalarında mühüm rol oynayır.

İşçi təcrübəsini yaxşılaşdırmağın əsas aspektlərindən biri iş yerində çevikliyin təmin edilməsidir. İşçilərə iş qrafiklərini sərbəst idarə etmək imkanı verməklə, onların məmnunluğunu artırmaq və stress səviyyələrini azaltmaq mümkündür. Bundan əlavə, əməkdaşlıq, tanınma və aidiyyət hissi ilə xarakterizə olunan müsbət iş mədəniyyətinin təşviqi işçilərin motivasiyasına və şirkətə bağlılığına birbaşa təsir göstərir.

İnnovativ insan kapitalının idarə edilməsində digər əsas istiqamət fərdiləşdirilmiş təlim və inkişaf strategiyalarıdır. Əvvəllər tətbiq olunan universal təlim proqramlarının effektivliyi azalmışdır. Bunun əvəzinə, təşkilatlar hər bir işçinin fərdi bacarıq və karyera hədəflərini nəzərə alan fərdiləşdirilmiş inkişaf planlarına üstünlük verirlər.

ması, avtomatlaşdırılması və süni intellekt texnologiyalarının tətbiqi üzrə mühüm bir model olmuşdur. Bu texnoparkın infrastrukturu elmi-tədqiqat institutları, universitetlər və sənaye müəssisələrinin sıx əməkdaşlığını təmin etmək üçün qurulmuş, bu da texnologiyaların transferini və yeni məhsulların istehsalını daha sürətli və səmərəli şəkildə həyata keçirmişdir. Bu yanaşma göstərir ki, sənaye məhəllələrinin inkişafında texnoloji və innovativ yanaşmalar əsas rol oynayır və müvafiq sahələrin dayanıqlı inkişafını təmin edir (Nam, 2017).

Almaniyada sənaye məhəllələrinin təşkili zamanı "Cluster" modeli tətbiq edilmişdir ki, bu da regional ixtisaslaşma və müxtəlif sektorlar arasında əməkdaşlığın inkişafını stimullaşdırır. Bavariya regionundakı "Aerospace Cluster" nümunəsi, aerokosmik texnologiyalar sahəsində fəaliyyət göstərən müəssisələri bir araya gətirərək resursların optimal istifadəsini təmin etmişdir. Bu model çərçivəsində elmi-tədqiqat fəaliyyətləri ilə məşğul olan universitetlər, dövlət qurumları və özəl sektor arasında sıx əlaqələr qurulmuşdur. Sənaye məhəllələrində fəaliyyət göstərən müəssisələr üçün xüsusi vergi güzəştləri, kreditlər və subsidiyalar tətbiq edilmiş, bu da onların fəaliyyətini daha da gücləndirmişdir. Həmçinin, ekoloji dayanıqlıq məsələsi xüsusi diqqətdə saxlanılmış, sənaye proseslərinin ətraf mühitə mənfi təsirini minimuma endirmək üçün müasir texnologiyaların tətbiqinə üstünlük verilmişdir (Kyriazis, Metaxas, 2023).

Çin Xalq Respublikasında isə sənaye məhəllələrinin yaradılması iqtisadiyyatın strukturunun şaxələndirilməsi və dünya bazarında rəqabətqabiliyyətli məhsulların istehsalını təmin etmək məqsədilə həyata keçirilmişdir. Çindəki sənaye məhəllələri "Special Economic Zones" (Xüsusi İqtisadi Zonalar) adlanır və bu zonalar iqtisadi islahatların həyata keçirildiyi mühüm ərazilər hesab edilir. Shenzhen zonası bu sahədə dünya miqyasında tanınan uğurlu nümunələrdən biridir. Burada texnologiya sahəsində fəaliyyət göstərən minlərlə müəssisə yerləşmiş, xarici investisiyaların cəlb edilməsi üçün xüsusi güzəştlər tətbiq olunmuşdur. Shenzhen-də yerləşən müəssisələrə dövlət tərəfindən vergi güzəştləri, gömrük rüsumlarının azaldılması və yüksək texnologiyalı məhsulların istehsalı üçün maliyyə dəstəyi verilmişdir. Bu yanaşma nəticəsində Shenzhen qısa müddət ərzində yüksək texnologiyalı məhsulların istehsal mərkəzinə çevrilmişdir (Wu, Liu & Huang, 2021).

Kiçir və orta müəssisələrin (KOM) iqtisadiyyatdakı rolu yalnız inkişaf etmiş ölkələrdə deyil, həm də inkişaf etməkdə olan dövlətlərdə əsas diqqət mərkəzində olmuşdur. Bu müəssisələr, istihdam yaratma potensialı, iqtisadi dayanıqlılığın təmin edilməsi və yerli bazarlara dinamik təsiri ilə xüsusi əhəmiyyət kəsb edir. Araşdırmalar göstərir ki, dövlət tərəfindən təqdim olunan dəstək və təşviqlərə baxmayaraq, KOM-ların əksəriyyəti bu imkanlardan səmərəli istifadə edə bilmir. Bu vəziyyət, bu müəssisələrin inkişafına mane olan çətinliklərin mövcudluğunu göstərir və onların həlli üçün daha effektiv yanaşmaların tətbiqini zəruri edir. Əlavə olaraq, beynəlxalq təcrübə göstərir ki, KOM-ların rəqabət qabiliyyətinin artırılması üçün innovasiya fəaliyyətlərinin təşviqi və texnologiyanın tətbiqi vacib amillərdəndir (Abacı, 2015).

Azərbaycan şəraitində bu təcrübələrin tətbiqi üçün ilk növbədə mövcud problemlərin həlli istiqamətində kompleks tədbirlər həyata keçirilməlidir. İlk növbədə, sənaye məhəllələrinin yaradılması üçün uyğun ərazilərin seçilməsi və həmin ərazilərdə müasir infrastrukturların qurulması zərurəti mövcuddur. Bu prosesdə dövlət-özəl sektor tərəfdaşlığının inkişaf etdirilməsi, xüsusilə kiçik və orta sahibkarların iştirakını stimullaşdırmaq üçün hüquqi və maliyyə dəstəyinin artırılması vacibdir (Arslan, 2018). Bundan əlavə, sənaye məhəllələrində fəaliyyət göstərəcək müəssisələr üçün xüsusi güzəştlərin tətbiqi, həmçinin onların beynəlxalq ticarət əlaqələrinə inteqrasiyasının təmin olunması istiqamətində işlər görülməlidir.

Həmçinin, sənaye məhəllələrinin fəaliyyətinin ekoloji dayanıqlıq prinsiplərinə əsaslanması xüsusi əhəmiyyət kəsb edir. Bu baxımdan, beynəlxalq təcrübədən yararlanaraq sənaye məhəllələrində yaşıl texnologiyaların tətbiqi, tullantıların minimuma endirilməsi və təkrar emal sistemlərinin qurulması ilə bağlı tədbirlər həyata keçirilməlidir. İqlim dəyişikliyi ilə mübarizə və ətraf mühitin qorunması sahəsində Cənubi Koreya və Almaniya təcrübələri Azərbaycan üçün bir model olacaq.

Son olaraq, sənaye məhəllələrinin inkişafını təmin etmək üçün bu sahədə elmi tədqiqatların və təhsil proqramlarının inkişaf etdirilməsi vacibdir. Bunun üçün universitetlər və elmi-tədqiqat institutlarının sənaye məhəllələri ilə əməkdaşlığı gücləndirilməli, yeni texnologiyaların tətbiqi üçün elmi potensialdan maksimum istifadə edilməlidir. Bu yanaşma beynəlxalq təcrübələrin uğurla yerli şəraitə

inteqrasiyasını təmin edərək sənaye məhəllələrinin uzunmüddətli və dayanıqlı inkişafını təmin edəcək.

## Nəticə

Tədqiqat nəticəsində müəyyən edilmişdir ki, sənaye məhəllələrinin inkişafında beynəlxalq təcrübələrdən, xüsusilə Almaniyanın "Cluster" modeli, Cənubi Koreyanın "Techno Parks" sistemi və Çinin xüsusi iqtisadi zonalarından öyrənilən yanaşmalar Azərbaycanın iqtisadiyyatında innovativ və dayanıqlı həllərin tətbiqi üçün mühüm baza yaradır. Bu yanaşmaların tətbiqi yalnız iqtisadi səmərəliliyi artırmaqla kifayətlənməyib, həm də regional inkişaf strategiyalarının reallaşdırılmasına dəstək olmuşdur.

Coğrafi yerləşmə, infrastruktur təminatı və ekoloji dayanıqlılıq prinsipləri sənaye məhəllələrinin səmərəli fəaliyyətinin təmin edilməsi üçün əsas şərtlərdən biri kimi qəbul olunmuşdur. İnnovasiya yönümlü idarəetmə və dövlət-özəl sektor əməkdaşlığının genişləndirilməsi milli iqtisadiyyatın şaxələndirilməsinə və regional inkişafın sürətlənməsinə töhfə verəcək.

Tədqiqat zamanı yaşıl texnologiyaların tətbiqinin və tullantıların minimuma endirilməsinin əhəmiyyəti xüsusi vurğulanmışdır. Bununla yanaşı, sənaye məhəllələri ilə elmi-tədqiqat institutlarının inteqrasiyası innovasiya potensialını artırmaq və rəqabət qabiliyyətini gücləndirmək üçün vacib bir amil kimi qiymətləndirilmişdir.

Təklif olunan yanaşmalar Azərbaycanın sənaye sektorunun beynəlxalq standartlara uyğunlaşdırılmasına və iqtisadi səmərəliliyinin artırılmasına xidmət edir. Bu yanaşmaların həyata keçirilməsi ölkənin iqtisadi inkişafında yeni imkanlar yaradaraq, regional və qlobal səviyyədə rəqabət qabiliyyətinin yüksəlməsinə şərait yaradacaq.

## Ədəbiyyat

1. Abacı, H. (2015). *KOBİ-lərin Türkiyədə inkişafi və yeri, KOBİ-lərə verilən təşviq və dəstəyin məhsul keyfiyyətinə, məhsul innovasiyasına və gəlirliliyinə təsirlərinin araşdırılması: Afyonkarahisar kiçik sənaye sahəsi nümunəsi* (Magistrlik dissertasiyası, İstanbul Arel Universiteti Sosial Elmlər İnstitutu), 278.
2. Arslan, F. (2018). Türkiyədə davamlı istehsalda mütəşəkkil sənaye zonalarının rolu: Manisa mütəşəkkil sənaye zonası (MOSB) nümunəsi. *Marmara Coğrafiya Jurnalı*, (37), 167-182.
3. Əliyeva, Z. (2024, fevral 14). "Sənaye məhəllələri regionların iqtisadi statusunu dəyişir". *Azərbaycan jurnalı*, № 33, 10.
4. Kyriazis, V., & Metaxas, T. (2023). Markusen's Typology with a "European" Twist, the Examples of the French Aerospace Valley Cluster and the Andalucia Aerospace Cluster. *World*, 4(1), 185-201.
5. Qəhrəmanov, M. T. (2019). "Azərbaycanda sənaye istehsalının ərazi üzrə təşkilinin təkmilləşdirilməsi istiqamətləri", *Azərbaycan Dövlət İqtisad Universiteti*, 95.
6. Nam, J. G. (2017). A Study on the Evolutionary Process of Techno-Parks in South Korea. *Journal of the Korean association of regional geographers*, 23(2), 239-256.
7. Sarı, E. B. (2018). Evaluating the performance of organized industrial zones using data envelope analysis. *Journal of Economic Sciences*, 10(2), 17-32.
8. Vəliyev, F. A. (2018). *Azərbaycan regionlarında sənaye məhəllələrinin təşkili istiqamətləri.* Azərbaycan Dövlət İqtisad Universiteti, 85.
9. Wu, M., Liu, C., & Huang, J. (2021). The special economic zones and innovation: Evidence from China. *China Economic Quarterly International*, 1(4), 319-330.

DOI: https://doi.org/10.36719/2663-4619/113/143-147

**Sevinc Pəniyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
magistrant
https://orcid.org/0009-0000-5279-762X
veliyevasevinc1502@gmail.com

# İstedadlı şagirdlərlə işin təşkili

**Xülasə**

İstedadlı və bacarıqlı şagirdlərlə işləmək, onların aşkara çıxarılması və inkişafı məktəb fəaliyyətinin ən vacib aspektlərindən birinə çevrilmişdir. İstedadlı şagirdlərlə iş sahəsində pedaqoji fəaliyyət prinsipləri vardır. Bu prinsiplərdən biri şəxsi inkişaf üçün nəzərdə tutulan imkanların maksimum müxtəlifliyidir. Həmçinin məktəbdənkənar fəaliyyətlərin rolunun artırılması və təhsilin fərdiləşdirilməsi və fərqləndirilməsi əsas prinsiplərdəndir. Müəllimlərin minimal iştirakı ilə şagirdlərin birgə işi üçün şərait yaratmaq da bura daxildir. Biologiyanın tədrisində istedadlı şagirdlərlə işləmək məqsədilə müasir diaqnostik metodlardan, psixometrik vasitələrdən, xüsusi təlim metodologiyasından istifadə zəruridir.

***Açar sözlər:*** *fərdi yanaşma, qabiliyyət, tədqiqatçılıq, intellektual,metod*

**Sevinj Paniyeva**
Azerbaijan State Pedagogical University
Master student
https://orcid.org/0009-0000-5279-762X
veliyevasevinc1502@gmail.com

# Organization of Work with Talented Students

**Abstract**

Working with gifted and talented students, their identification and development has become one of the most important aspects of school activities. There are principles of pedagogical activity in the field of working with gifted students. One of these principles is the maximum variety of opportunities for personal development. Also, increasing the role of extracurricular activities and individualization and differentiation of education are among the main principles. This also includes creating conditions for joint work of students with minimal participation of teachers. In order to work with gifted students in teaching biology, it is necessary to use modern diagnostic methods, psychometric tools, and special teaching methodologies.

***Keywords:*** *individual approach, ability, research, intellectual, method*

## Giriş

Levis Terman şagirdlərdə istedad və zəka ilə bağlı böyük miqyaslı araşdırmalar aparmışdır və o, belə qənaətə gəlmişdir ki, İQ səviyyəsi 140 və ondan yuxarı olan şagirdlər “ dahidir ”.

Amerikalı psixoloq Hovard Qardnerin çoxlu intellekt nəzəriyyəsi ilk dəfə iyirmi ildən çox əvvəl özünün “Ağıl çərçivələri: Çoxlu intellektlər nəzəriyyəsi” kitabında dərc edilmiş, təhsil prosesini fərdiləşdirməyin mümkün bir yolunu ortaya qoyur, intellektli zəka nəzəriyyəsi pedaqoqların hər gün nə ilə məşğul olduğunu təsdiqləyir: insanlar müxtəlif yollarla düşünür və öyrənirlər və bu nəzəriyyə Harvard Universitetinin professoru Hovard Qardner tərəfindən hələ 1983-cü ildə əsaslandırılmışdır (Səfərova, 2018).

Hovard Qardner hesab edir ki, həyatımızı zənginləşdirə biləcək və ətrafımızdakı dünya ilə səmərəli qarşılıqlı əlaqədə olmağımıza kömək edən bir çox başqa bilik və istedadlar var və o, hər bir insanın müxtəlif dərəcələrdə ifadə olunan ən azı doqquz növ zəkaya malik olduğunu iddia edir,

 

intellektli zəka modelləri biologiya dərs fəaliyyətlərinin təşkilinə kömək edəcək (Azərbaycan Respublikası Təhsil Nazirliyi, 2016).

**Tədqiqat**

İntellekt növlərinə və öyrənmə üsullarına nəzər salaq (Cədvəl 1):

**Cədvəl 1**.

| **Hovard Qardnerin "Çoxlu intellektlər nəzəriyyəsi"** | | |
|---|---|---|
| **№** | **Nəzəriyyə** | **Şərhi** |
| **1** | **Verbal-linqvistik intellekt (linguistic)–söz ə önəlik** | Hadisələrə, şifahi nitq zamanı intonasiyaya, sözlərin düzgün düzülüşünə həssasdır. Güclü şifahi-linqvistik intellektə malik uşaqlar oxumağı, yaz-mağı və hekayələr danışmağı sevirlər. Onlar yaxşı şifahi yaddaşa malik-dirlər və zəngin söz ehtiyatına malikdirlər. Belə şagirdlərlə biologiyanın tədrisində diferensial yanaşmanı tətbiq etmək üçün öyrənilən mövzuyla bağlı yaradıcılıq tapşırıqları təklif olunur. |
| **2** | **Məntiqi-riyazi intellekt (logical-mathematical)** | Bu tip zəkaya malik şagirdlər güclü analitik və problem həll etmə kompetensiyalarına malikdirlər. Yaxşı düşünürlər və məntiqli suallar verirlər. Materialın təqdim edilməsinin aşağıdakı üsulları optimaldır: riyazi oyun-lar, verilənlərin təhlili, məntiqdən istifadə, praktiki təcrübələrin qurulma-sında köməklik, nəticələrin proqnozlaşdırılmasından istifadə, problemlə-rin həlli ilə deduktiv metodların əlaqələndirilməsi, cədvəllərin tərtib edil-məsi və qrafiklər, faktları məntiqi ardıcıllıqla qurmaq, təklif olunan mate-rialda uyğunsuzluqları və səhvləri müəyyən etmək [54] . |
| **3** | **Vizual-məkan intellekti (visual-spatial)-fəza təsvirli** | Dünyanı vizual və məkan olaraq göstərmək qabiliyyətini əhatə edir. Təlim prosesinin daha məhsuldar keçməsi üçün videokasetlərə baxmaq , kompüter qrafikası, maketlərin hazırlanması, müxtəlif vizual məhsullardan istifadə məqsədəuyğundur. |
| **4** | **Bədən-kinestetik (bodily-kinesthetic)-fiziki hərəkətlər edərək** | Belə şagirdlər daim hərəkətli olurlar, bədən hərəkətləri vasitəsilə müəyyən fikir və emosiyalar yaradaraq onları qarşısındakına çatdırmağı bacarırlar. Bu tip intellektə sahib şagirdlərlə diferensial yanaşmanın tətbiqi üçün gəzintilər, ekskursiyalar və dərsdənkənar fəaliyyətlər təşkil etməli, təlim prosesində rollu oyunlardan istifadə etməli, sözlərlə fiziki məşqlər etməli, şagirdləri həvəsləndirməlidirlər. |
| **5** | **Fərdlərarası (interpersonal)- sosial, cəmiyyətə yönəlik** | Belə intellektə sahib şagirdlərin güclü yumor hissi olur, sözdən və bədən dilindən mükəmməl istifadə edir, insanları yönəltməyi bacarır, liderlik xüsusiyyətlərinə malik olurlar. |
| **6** | **Fərddaxili (intrapersonal)–özünə yönəlik** | İnsanın özünü, o cümlədən duyğu və düşüncələrini dərk etmək qabiliyyətinə aiddir. Belə şagirdlər müəyyən fəaliyyətlə bağlı xoşuna gələn və gəlməyən cəhətləri açıq şəkildə ifadə edə bilirlər. Özlərinin güclü və zəif cəhətlərindən xəbərdardırlar, bacarıqlarına inanırlar, qarşılarına müəy-yən məqsədlər qoyurlar, diqqətlərini hislərinə, arzularına yönəldirlər, ori-jinal olmağı sevirlər. |
| **7** | **Musiqi-ritmik (musical- intelligence) ritma yönəlik** | Səslərin səviyyəsinə, intonasiyasına, tembrinə və ritminə həssaslıq, mu-siqiyə emosional həssaslıq daxildir. Uşaqlar melodiyaları və musiqi şəkillərini xatırlayır, diapazonu və ritmi tanıyır və ən inkişaf etmiş musiqi zəkasına malikdirlər. |

| | | |
|---|---|---|
| | | Sual yaranır: müasir məktəbdə onlara ümumiyyətlə nəyisə necə öyrətmək olar? Mümkündür və kifayət qədər uğurludur. |
| **8** | **Naturalist (naturalist)– təbiətə yönəlik** | Flora və faunanı, təbii dünyanı öyrənmək qabiliyyətini və ovçuluq, əkinçilik və ya biologiya elmləri kimi məhsuldar fəaliyyətlərə meyli əhatə edir. Təbii intellektə malik olan uşaqlar müxtəlif ölkələrdəki yaşayış şəraitindəki fərqləri müşahidə etməyi və müəyyən etməyi sevir, xalq adət-ənənələri ilə maraqlanır, bəşər tarixinin öyrənilməsi və təbiət hadisələrinin inkişafı ilə bağlı layihə tapşırıqlarını yerinə yetirməkdən zövq alırlar. |
| **9** | **Ekzistensial intellekt-fəlsəfi düşünmək** | Onlar erkən yaşlarından yüksək səviyyəli düşüncələri ilə fərqlənirlər. Hislərini anlayır və onları idarə edə bilirlər. Onlar sağlam düşünür və nəticə çıxara bilirlər. Erkən yaşlarından onları insanın yaradılışı, varlığı, həyatın mənası və ölümlə bağlı mövzular maraqlandırır. |

İstər biologiyanın, istərsə də digər fənlərin tədrisi zamanı şagird öz təlim fəaliyyətində digər yoldaşlarından öndə gedirsə, onu istedadlı adlandırmaq olar. Hər bir ümumtəhsil məktəblərində çalışan biologiya müəllimlərinin vəzifəsi belə istedadlı şagirdlərin hərtərəfli yüksəlməsini və fənn üzrə bilik, bacarıq və vərdişlərinin gücləndirilməsinə və möhkəmlənməsinə şərait yaratmaqdır. Biologiya müəllim yüksək yaradıcılıq qabiliyyətinə malik şagirdlərlə çalışan zaman bir neçə metod, üsul və priyomlardan istifadə edir ki, onlara aşağıda göstərdiklərimizi misal göstərmək olar (Azərbaycan Respublikası Təhsil Qanunu, 2009):

- tədqiqatçılıq
- qismən axtarıcılıq
- problemli təlim
- layihələr metodu və s.

İstedadlı şagirdlərlə düzgün təlim prosesinin təşkili üçün intellektual marafonlardan, müxtəlif müsabiqə və viktorinalardan, şifahi, rollu oyunlardan istifadə zəruridir. Bütün bunlar imkan verir ki, istedadlı şagirdlər əlverişli yaradıcılıq növü seçə və öz potensial imkanlarını göstərə bilsinlər. Bu, onların gələcək inkişafına stimul verir. İstedadlı uşaqlarda aşağıdakı xüsusiyyətlər özünü göstərir (Əliyev, Əliyeva, Cabbarov, 2011):

- yüksək yaradıcı təfəkkür;
- uyğunlaşma bacarığı;
- proqnozlaşdırma bacarığı;
- diqqətin yüksək dayanıqlılığı.

Hər bir müəllim diferensial yanaşmanın köməyi ilə bu xüsusiyyətləri inkişaf etdirməlidir. İstedadlı uşaqlarla işləyərkən bunları bilmək vacibdir (The differentiated classroom: responding to the needs of all learners):

- tədris proqramını zənginləşdirmək, təlimin məzmununu yeniləşdirmək və genişləndirmək;
- şagirdlərin qavrama qabiliyyətlərini inkişaf etdirmək;
- diferensiasiya əsasında işləyərək şagirdlərə fərdi yanaşmaq;
- özünün və bütün sinfin təlim-tərbiyə prosesini təhlil etmək;
- pedaqoji-psixoloji məzmunlu qərarlar qəbul etmək;
- kollektiv yaradıcılıq fəaliyyəti üçün material hazırlamaq.

Ümumtəhsil məktəblərində biologiya fənnini tədris edən hər bir biologiya müəllimi yüksək yaradıcı təfəkkürə və sinfə, kollektivə asanlıqla uyğunlaşma, proqnozlaşdırma bacarığına qabil istedadlı şagirdlərlə xüsusi yollarla – diferensial yanaşmanın köməyilə işləməyi bacarmalıdır (Tomlinson, Carol, 1996). Müəllim, bu işi təşkil edən zaman, fərdi, cütlərlə, kiçik və böyük qruplarla iş formasından, mürəkkəblik dərəcəsi digərlərindən daha artıq olan çalışma və tapşırıqlar, eyni zamanda diskussiyalardan da istifadənin hüdudlarını genişləndirməlidir və o bu proses aşağıda

sadaladıqlarımızı bilməlidir (İnklüziv sinifdə təlimin təşkili mövzusunda ixtisasartırma proqramının; Tomlinson, Carol, 1999):

- Fənnin, xüsusilə də biologiya fənninin tədris proqramını və təlimin məzmununu genişləndirməlidir, tərəqqiyə sövq etməlidir.
- Müəllim istedadlı şagirdlərin biologiya fənninə dair material və məlumatların, bilik və bacarıqların qavrama qabiliyyətlərini yüksəltmək üçün pedaqoji əmək sərf etməli, səy göstərməlidir;
- Əlbəttə ki, hər bir müəllim, xüsusən də biologiya müəllimləri istedadlı şagirdlərə əsasında fərdi yanaşma duran diferensial yanaşma ilə yaxınlaşmalı, təlim prosesini məqsədəuyğun və qənaətbəxş təşkil etməlidir;
- Bütün bunlarla yanaşı, nəticədə biologiya müəllimi öz işini dəyərləndirməlidir, pedaqoji fəaliyyəti zamanı özünün və sinfin təlim-tərbiyə prosesini təhlil etməli və onu qiymətləndirməlidir;
- Hər hansı bir vəziyyətdə şagirdin gələcəyi haqqında düzgün pedaqoji-psixoloji xarakterli qərarlar qəbul etməyi bacarmalıdır;

Məktəblərdə istedadlı–bacarıqlı–intellektli şagirdlərlə müəllim bir çox formalarda təlim prosesini təşkil edə bilər, burda əsas məqsəd onun şagird şəxsiyyətinin hərtərəfli və geniş inkişafına yönəlməlidir (Tomlinson, Carol, 1995):

✓ Hər bir müəllim sinif daxilində təhsil alan şagirdlərdən istedadlı uşaqları ayırd etməlidir və bundan sonra “istedadlı şagirdlərin bankı” yaradılmalıdır. “Bank” yaradıldıqdan sonra onun daxilində intellektlər özlərinin meyil, maraq, hədəf, məqsəd və vəzifələrinə görə müəyyən qruplara ayrılmalıdır.

✓ Bu mərhələni də uğurla başa çatdırdıqdan sonra artıq növbəti mərhələyə keçmək olar – bildiyimiz kimi, istedadlı şagirdlər özləri də bilik, bacarıq, kompetensiyalarına görə bir -birilərindən seçilirlər. Bu məqsədlə “xüsusi istedadlı şagirdlər” qrupu yaradılır. Belə şagirdlərin intellektləri nəinki biologiya fənni üzrə, həmçinin bir neçə fənn üzrə də yüksək ola bilər, məsələn, əgər şagirdin biologiyaya həvəsi varsa, onu dərindən öyrənir və bilirsə, bu o demək deyilki, həmin şagird çox yüksək səviyyədə rəsm çəkməli və ya şeir danışmağı bacarmalıdır, təcrübələr onu göstərir ki, istedad və qabiliyyəti hərtərəfli və yüksək səviyyədə inkişaf etmiş şagirdlərin olması mümkünsüz olar (İnklüziv siniflərdə təlimin təşkili, 2018; Tomlinson, Carol, 1996).

✓ İstər biologiya müəllimi, istərsə də məktəbin direktoru, məktəbin psixoloqu və sinif rəhbəri müəyyən sahədə öz istedadını nümayiş etdirən şagirdlərin həm məktəbdaxilində, həm də məktəbdənkənarda və məktəblərarası viktorinalarda, billik yarışmalarında, bunlarla yanaşı, fənn olimpiadalarında iştirakını təmin və təşkil etməlidir, bu sahədə görülən işlər istedadlı şagirdlərin inkişafının hüdudlarını genişləndirir, dünyagörüşünün artmasının və müəyyən bacarıqlarının qazanılmasına zəmin yaradır (Tomlinson, Carol, 1996).

✓ AMEA-nın İnstitutlarının öndə gedən tədqiqat işçilərini, elmi işçilərini, alimlərini və professorlarını, müəllimlərini məktəblərə çağıraraq, onların belə şagirdlərə dərs keçmələrinə və şagirdlərin onları fəal dinləmələrinə şərait yaratmaq istedadlı şagirdlərə diferensial yanaşmanın tətbiqini asanlaşdırır və bu sahədə görülən işləri təkmilləşdirir.

✓ Respublikamızda istedadlı şagirdlərdən ibarət birliklər, dərnəklər yaradılmalı, yaradılmış dərnək və birliklərdə müxtəlif istiqamətlərdə tədbirlər və görüşlər keçirilməlidir, bu tədbirlər əsasında xüsusi istedadlı şagirdlərin seçilərək istər ölkədaxili, istərsə də ölkəxarici olimpiadalar və müsabiqələrdə iştirakı reallaşdırılmalıdır (Tomlinson, Carol, 1995).

## Nəticə

Təlim prosesində qarşıya qoyulmuş məqsəd üzrə-istedadlı şagirdlərə diferensial yanaşma aparılmış iş məqsədəuyğun şəkildə həyata keçirilərsə, bir çox effektiv nəticələr əldə olunar. Bunlara misal olaraq aşağıdakıları göstərmək mümkündür:

✓ Aparılan işin – diferensial yanaşmanın tətbiqi uğurlu olması üçün müəllim nəinki tək fəaliyyət göstərməli, eyni zamanda məktəb kollektivi ilə, ailə mühiti ilə, həmçinin digər şagird yoldaşları ilə, məktəb psixoloqu ilə paralel münasibət qurmalı, bu tip şagirdlərin tezliklə aşkar olunması üçün əlindən gələni etməlidir.

✓ İstedadlı şagirdlərlə iş apararkən müəllim onlarda elmə maraq, diqqət, həvəs və istəyin artması məqsədilə müxtəlif ölkələrin beynəlxalq təcrübələrinə əsaslanmalı, respublikamızın təhsil sistemi ilə digər dövlətlərin qabaqcıl təhsil sistemləri arasında inteqrasiya və istinad yaratmalıdır. Bu zaman işin səmərəsi yüksək olacaqdır və müəllimin peşəkarlıq səviyyəsi yüksələcəkdir. Həmçinin, sinif daxilində və xaricində digər şagirdlərə motivasiya mənbəyi və qaynağı olacaqdır.

✓ Belə şagirdlərlə işin təşkili zamanı tədris proqramı çoxyönümlü olmalıdır, şagirdin intellektual səviyyəsinə uyğunlaşmalıdır və özündə yaradıcı və inkişafetdirici aspektləri ehtiva etməlidir. Belə olduğu halda, şagirdlər daha çox aktiv və fəal, digər şagirdlərdən daha çox çalışqan olur, ətrafda və xarici mühitdə baş verən hadisələrə tənqidi və yaradıcı yanaşır, məzmunu və məğzini başa düşməyə can atır, mövzu və ya hadisə barədə səthi məlumatlarla kifayətlənmir, daim yenilikçilik və tədqiqatçılıq axtarışında olurlar. Dərsi oxumaq və öyrənmək, təcrübələr aparmaq belə şagirdlərə zövq verir, təlim prosesindən yorulmur, müstəqil işlərə və ya layihələrə, əlavə dərslərə biganə yanaşmırlar.

✓ Biologiyanın tədrisində istedadlı şagirdlərə diferensial yanaşmanı təmin etmək məqsədilə müasir diaqnostik metodlardan, psixometrik vasitələrdən, xüsusi təlim metodologiyasından istifadə zəruridir.

✓ Proses zamanı xüsusi inkişaf proqramlarından, fərdi tədris planlarından istifadə olunmalıdır, təhsil ocaqları yüksək səviyyədə ixtisaslaşmış müəllimlər, pedaqoq və psixoloq heyəti ilə təmin olunmalıdır.

Hazırki dövrdə istedad və yaradıcılıq potensialı cəmiyyətin milli sərvəti və strateji ehtiyatıdır. Bu potensialın aşkarlanaraq dəstəklənməsi, inkişaf etdirilib səmərəli şəkildə cəmiyyətin xeyrinə gerçəkləşdirilməsi hər bir müstəqil dövlətin milli strateji probleminə çevrilmişdir. Son illər Azərbaycanda istedadlı uşaq və gənclərin səmərəli təhsil almasını təmin etmək məqsədilə yeni tipli tədris müəssisələrinin şəbəkəsi xeyli genişləndirilmiş, lisey və gimnaziyalarda təhsilin məzmununun müasir tələblərə uyğunlaşması məqsədi ilə yeni tədris plan və proqramları hazırlanaraq tətbiq edilməyə başlamış, pedaqoji kadr heyətinin tərkibi ilbəil yaxşılaşdırılmışdır.

## Ədəbiyyat


1. Azərbaycan Respublikası Təhsil Nazirliyi. (2016). *Xüsusi istedada malik uşaqların (gənclərin) yaradıcılıq potensialının inkişafı üzrə dövlət proqramı (2006-2010-cu illər).* Bakı: Təhsil, 48.
2. Azərbaycan Respublikası Təhsil Qanunu. (2009). Bakı.
3. Əliyev, B., Əliyeva, K., Cabbarov, R. (2011). *Pedaqoji psixologiya*. Bakı: Təhsil, 254.
4. Əliyev, B., Cabbarov, R. (2008). *Təhsildə şəxsiyyət problemi*. Bakı: Təhsil, 136.
5. İnklüziv sinifdə təlimin təşkili mövzusunda ixtisasartırma proqramının. Oxu materialı. *Avropa İttifaqı, Azərbaycan Təhsil Nazirliyi*, UNİC.
6. İnklüziv siniflərdə təlimin təşkili. (2018). *TİPİİ. Oxu materialı*. Bakı, 80.
7. Səfərova, E. (2018). *Biologiyanın tədrisində həyati bacarıqların aşılanması ilə şagird şəxsiyyətinin formalaşdırılması*. Dərs vəsaiti. Bakı.
8. The differentiated classroom: responding to the needs of all learners. Carol Ann Tomlinson. USA, 140.
9. Tomlinson, Carol, A. (1996). *Differentiating instruction for mixed-ability classrooms* [An ASCD professional inquiry kit]. Alexandria, VA: ASCD, 35-51.
10. Tomlinson, Carol, A. (1996). Good teaching for one and all: Does gifted education have an instructional identity?// *Journal for the Education of the Gifted*. USA, 155-174.
11. Tomlinson, Carol, A. (1995). *How to differentiate instruction in mixed ability classrooms*. Alexandria, VA: ASCD, 52-60.
12. Tomlinson, Carol, A. (1999). *The differentiated classroom: responding to the needs of all learners*. Alexandria, VA: ASCD, 101-105.

DOI: https://doi.org/10.36719/2663-4619/113/148-152

**Çinarə Teymurova**
Azərbaycan Memarlıq və İnşaat Universiteti
https://orcid.org/0009-0006-5210-7653
teymurova.chinara00@gmail.com

# İdarəetmədə informasiya sistemlərinin rolu və tətbiqi

**Xülasə**

Müasir dövrdə informasiya texnologiyalarının sürətli inkişafı idarəetmə proseslərinin mahiyyətini köklü şəkildə dəyişmişdir. İdarəetmə sahəsində qərarların daha çevik və əsaslandırılmış şəkildə qəbul olunması üçün informasiya sistemləri mühüm rol oynayır. Bu məqalədə informasiya sistemlərinin idarəetmədəki rolu, onların tətbiq sahələri və qarşıya çıxan əsas problemlər təhlil olunur. Eyni zamanda, müxtəlif sahələrdə — biznes, dövlət idarəçiliyi, təhsil və səhiyyədə — informasiya sistemlərinin tətbiqinə dair praktiki nümunələr təqdim edilir. Rəqəmsallaşmanın idarəetməyə gətirdiyi üstünlüklərlə yanaşı, mövcud texniki və insan resursu problemlərinə də toxunulmuşdur. Məqalənin əsas məqsədi idarəetmə sahəsində informasiya sistemlərinin strateji əhəmiyyətini göstərmək və gələcək inkişaf istiqamətləri üzrə tövsiyələr verməkdir. Nəticələr göstərir ki, informasiya sistemlərinin tətbiqi idarəetmənin effektivliyini əhəmiyyətli dərəcədə artırır. Gələcəkdə bu sahədə daha dərin inteqrasiya və texnoloji yeniliklərin tətbiqi gözlənilir.

***Açar sözlər:*** *informasiya sistemləri, rəqəmsal idarəetmə, qərar qəbuletmə, ERP sistemlər, elektron hökumət, rəqəmsal transformasiya, kibertəhlükəsizlik*

**Chinara Teymurova**
Azerbaijan University of Architecture and Construction
https://orcid.org/0009-0006-5210-7653
teymurova.chinara00@gmail.com

# The Role and Application of Information Systems in Management

**Abstract**

In the modern era, the rapid development of information technologies has fundamentally transformed the nature of management processes. Information systems play a crucial role in ensuring that decisions in the field of management are made more flexibly and based on sound reasoning. This paper analyzes the role of information systems in management, their areas of application, and the key challenges encountered. It also presents practical examples of the implementation of information systems across various domains, including business, public administration, education, and healthcare. In addition to highlighting the advantages brought by digitalization to management, the paper addresses existing technical and human resource-related limitations. The primary objective of the study is to demonstrate the strategic importance of information systems in management and to offer recommendations for future development directions. The findings reveal that the use of information systems significantly enhances the efficiency of management practices. It is anticipated that deeper integration and the application of technological innovations in this field will continue to grow in the future.

***Keywords:*** *information systems, digital governance, decision-making, ERP systems, e-government, digital transformation, cybersecurity*

## Giriş

İnformasiya əsrinin əsas xüsusiyyətlərindən biri idarəetmə proseslərinin daha mürəkkəb və dinamik xarakter almasıdır. Ənənəvi idarəetmə metodları müasir iqtisadi və texnoloji şərtlər daxilində effektivliyini tədricən itirməkdədir.

Bu şəraitdə informasiya sistemləri idarəetmənin ayrılmaz bir komponentinə çevrilmişdir. Onlar təşkilatlara operativ qərar qəbul etmək, resursları optimallaşdırmaq və informasiya axınını səmərəli şəkildə idarə etmək imkanı yaradır. Rəqəmsallaşma və texnologi-yanın sürətli inkişafı idarəetmə sistemlərinə yeni imkanlar və yanaşmalar təqdim etmişdir. Bu gün artıq idarəetmə yalnız insan təcrübəsinə və intuisiya əsaslanmır, eyni zamanda real vaxtda əldə edilən verilənlərə və informasiya sistemlərinin verdiyi analizlərə əsaslanır (Əliyev, 2018).

İnformasiya sistemləri idarəetmədə həm operativ, həm də strateji səviyyədə istifadə olunur. Onlar təşkilatların daxili fəaliyyətini tənzimləməklə yanaşı, xarici mühitlə effektiv əlaqə qurmasına da şərait yaradır. Bu sistemlər vasitəsilə risklərin idarə olunması, performansın qiymətləndirilməsi və proqnozlaşdırma daha dəqiq həyata keçirilə bilir. Xüsusilə böyük həcmli verilənlərin emalı və təhlili üçün informasiya sistemlərinin rolu danılmazdır. Süni intellekt, bulud texnologiyaları və avtomatlaşdırma idarəetmənin rəqəmsal transformasiyasını daha da sürətləndirmişdir (Qasımov, 2020).

**Tədqiqat**

İdarəetmədə informasiya sistemlərinin tətbiqi yalnız texniki məsələ deyil, həm də təşkilati mədəniyyətin bir parçasıdır. Bu sistemlərin səmərəli tətbiqi üçün təşkilatlar həm infrastruktur baxımından, həm də insan resursları sahəsində uyğunlaşmalıdır. Azərbaycanda da son illərdə elektron idarəetmə, e-hökumət və rəqəmsal xidmətlər sahəsində ciddi irəliləyişlər müşahidə olunur. Bu proseslər göstərir ki, informasiya sistemləri yalnız idarəetmənin effektivliyini artırmaqla kifayətlənmir, həm də şəffaflıq, çeviklik və hesabatlılıq prinsiplərini gücləndirir (Laudon, & Laudon, 2021).

Bu məqalənin məqsədi idarəetmə sahəsində informasiya sistemlərinin rolunu və tətbiq imkanlarını araşdırmaq, həm nəzəri, həm də praktiki aspektlərini təhlil etməkdir. Tədqiqatın aktuallığı ondan irəli gəlir ki, informasiya sistemlərinin düzgün qurulması və tətbiqi müasir təşkilatların rəqabətqabiliyyətliliyini müəyyən edən əsas amillərdən biridir. Məqalə həm akademik, həm də tətbiqi baxımdan bu sahədə maraqlı olan tədqiqatçılar və mütəxəssislər üçün faydalı ola bilər.

**1. İnformasiya Sistemləri.**

İnformasiya sistemləri (İS) – məlumatların toplanması, saxlanması, işlənməsi və yayılması proseslərini təmin edən qarşılıqlı əlaqədə olan texnoloji və insan amillərindən ibarət kompleks strukturlardır. Bu sistemlər təşkilatlarda qərar qəbuletmə proseslərini dəstəkləyərək idarəetmənin səmərəliliyini artırmağa xidmət edir. İnformasiya sistemlərinin əsas komponentlərinə insan, texnologiya, məlumat və proses daxildir. İnsan faktoru sistemin istifadəsini və qərarların qəbulunu təmin edir; texnologiya isə proqram təminatı, aparat və şəbəkə elementlərini əhatə edir. Məlumat komponenti qərarların əsasını təşkil edir, proseslər isə bu məlumatın necə toplanıb emal ediləcəyini müəyyənləşdirir.

İdarəetmədə informasiya sistemləri müxtəlif səviyyələrdə və məqsədlərlə tətbiq olunur. Ən geniş yayılmış sistemlərdən biri İdarəetmə İnformasiya Sistemləridir (Management Information Systems - MIS). MIS orta səviyyəli idarəçilər üçün planlama, nəzarət və qərar qəbuletmə funksiyalarını dəstəkləyir. Digər vacib sistemlərdən biri Qərar Qəbulunu Dəstəkləyən Sistemlərdir (Decision Support Systems - DSS) və onlar qeyri-strukturlaşdırılmış və yarı-strukturlaşdırılmış qərarların qəbulunda analitik modellər və verilənlər bazası vasitəsilə dəstək göstərir (Turban, Volonino, & Wood, 2018).

Yuxarı səviyyəli menecerlər üçün nəzərdə tutulmuş İcra İnformasiya Sistemləri (Executive Information Systems - EIS) strateji qərarların qəbuluna kömək edir və təşkilatın fəaliyyət göstəricilərinə dair vizual və ümumiləşdirilmiş məlumat təqdim edir. Daha genişmiqyaslı təşkilatlar üçün Müəssisə Resurslarının Planlaşdırılması Sistemləri (Enterprise Resource Planning - ERP) bütün idarəetmə funksiyalarını – maliyyə, logistika, insan resursları və istehsalat – birləşdirən inteqrasiya olunmuş platforma təqdim edir.

Statistik məlumatlara əsasən, 2024-cü ilin sonunda aparılan beynəlxalq bir sorğuya görə, orta və iri müəssisələrin 78%-i ERP sistemlərindən aktiv şəkildə istifadə edir. DSS sistemlərinin tətbiqi olan müəssisələrdə isə qərar qəbuletmə müddətinin orta hesabla 32% azaldığı müşahidə olunmuşdur. MIS istifadə edən təşkilatlarda məhsuldarlıq göstəricilərində illik orta 15%-lik artım qeydə alınıb. Bu faktlar göstərir ki, informasiya sistemləri yalnız texnoloji inkişaf deyil, eyni zamanda təşkilati performans üçün də həlledici rol oynayır.

İnformasiya sistemlərinin düzgün tətbiqi təşkilatlara rəqabət üstünlüyü qazandırır, əməliyyat xərclərini azaldır və şəffaflığı təmin edir. Bu baxımdan onların idarəetmə strukturunda rolu strateji əhəmiyyət daşıyır (Stair, & Reynolds, 2020).

**İdarəetmədə İnformasiya Sistemlərinin Rolu**

İnformasiya sistemləri müasir idarəetmə proseslərinin təməl elementlərindən birinə çevrilmişdir. Onların əsas funksiyalarından biri qərar qəbuletmə mexanizmlərinin təkmilləşdirilməsidir. İnformasiya sistemləri vasitəsilə rəhbərlik real vaxtda məlumat əldə edə bilir və bu, operativ və daha əsaslandırılmış qərarların qəbuluna imkan yaradır. Məsələn, satış və ehtiyat göstəricilərinin dinamik təhlili sayəsində bazardakı dəyişikliklərə çevik reaksiya verilir. Qərar qəbuluna dəstək verən sistemlər (DSS) analitik modellər və verilənlər bazası texnologiyalarından istifadə edərək alternativ ssenariləri simulyasiya edir. Bu da təşkilatlara risklərin azaldılması və səmərəliliyin artırılması istiqamətində dəqiq addımlar atmağa şərait yaradır (OECD, 2022).

| Sistem Növü | İstifadə Səviyyəsi | Əsas Funksiya | Məlumat Tipi | Nümunə |
|---|---|---|---|---|
| MIS | Orta idarəetmə | Hesabatlar, monitorinq | Strukturlaşdırılmış | Satış analizləri |
| DSS | Orta/yuxarı idarəetmə | Analitik dəstək | Yarı-strukturlaşdırılmış | Proqnoz modelləri |
| EIS | Yuxarı idarəetmə | Strateji qərarlar | Yığım və vizuallaşdırma | İcra dashboardları |
| ERP | Bütün səviyyələr | Resursların inteqrasiyası | Müxtəlif | SAP, Oracle ERP |

İnformasiya sistemləri resursların səmərəli istifadəsində də mühüm rol oynayır. Resursların paylanması, təqib edilməsi və yenidən planlaşdırılması ERP sistemləri vasitəsilə mərkəzləşdirilmiş şəkildə həyata keçirilir. Bu cür sistemlər müəssisələrin maliyyə, insan resursları, material və texniki bazalarını inteqrasiya edərək ümumi effektivliyi yüksəldir. Məsələn, avtomatlaşdırılmış təchizat sistemləri sifariş və anbar idarəçiliyini optimallaşdıraraq itkilərin və gecikmələrin qarşısını alır. Beləliklə, resurslardan maksimum dərəcədə istifadə imkanı yaranır.

Əlaqə və koordinasiya informasiya sistemlərinin daha bir vacib funksiyasıdır. Müasir təşkilatlar tez-tez müxtəlif şöbələr, filiallar və hətta ölkələrarası əməkdaşlıq şəraitində fəaliyyət göstərirlər. Bu zaman inteqrasiya olunmuş kommunikasiya platformaları (e-poçt, daxili mesajlaşma sistemləri, veb-konfrans alətləri və s.) əməkdaşlıq və məlumat paylaşımını asanlaşdırır. Əlaqə sistemlərinin tətbiqi həm üfüqi, həm də şaquli idarəetmədə informasiyanın axınını optimallaşdırır. Koordinasiyanın güclənməsi isə təşkilati məqsədlərin daha sinxron şəkildə yerinə yetirilməsinə şərait yaradır (Digital Transformation).

Real vaxtda məlumat axını idarəetmədə çevikliyi və şəffaflığı təmin edən mühüm faktorlardandır. Məsələn, maliyyə göstəricilərinin və əməliyyat məlumatlarının dashboardlar vasitəsilə izlənməsi menecerlərə vaxtında müdaxilə imkanı verir. Sensorlar, IoT cihazları və bulud texnologiyaları vasitəsilə məlumatların avtomatik və fasiləsiz axını təmin olunur. Bu isə idarəetmədə subyektivliyi azaldır və obyektiv qərarların qəbuluna şərait yaradır. Eyni zamanda real vaxt nəzarəti istehsalat, logistika və müştəri xidmətləri sahələrində operativ idarəetməni mümkün edir.

Strateji planlaşdırma və proqnozlaşdırma da informasiya sistemləri vasitəsilə daha dəqiq və əsaslandırılmış şəkildə həyata keçirilir. Analitik və proqnozlaşdırıcı alqoritmlər uzunmüddətli bazar trendlərinin öyrənilməsinə və təşkilatın strateji mövqeyinin təyin edilməsinə imkan yaradır. Strateji səviyyədə idarəçilər fəaliyyət prioritetlərini müəyyənləşdirmək üçün müxtəlif modellər və statistik göstəricilərdən istifadə edirlər. Bu sistemlər vasitəsilə müəssisələr daha düzgün investisiya qərarları verir və rəqabət mühitinə uyğunlaşma bacarığını artırırlar. Beləliklə, informasiya sistemləri yalnız gündəlik əməliyyatların idarə olunması üçün deyil, həm də gələcək yönümlü strategiyaların qurulmasında əhəmiyyətli vasitəyə çevrilir (Şahbazov, 2019).

Nəticə olaraq, informasiya sistemləri idarəetmənin müxtəlif səviyyələrində — operativ, taktiki və strateji — əvəzsiz rol oynayır. Onların tətbiqi təşkilatlarda qərarların daha əsaslandırılmış şəkildə qəbulunu, resursların optimal istifadəsini, struktur daxilində effektiv koordinasiyanı və uzunmüddətli

strateji planlamanı təmin edir. Müasir dünyada informasiya sistemlərinin düzgün tətbiqi təşkilatların rəqabət qabiliyyətini artırmaqla yanaşı, davamlı inkişafını da dəstəkləyir.




**Tətbiq Sahələri və Praktik Nümunələr**

İnformasiya sistemləri bu gün biznes və sənaye müəssisələrinin rəqabət üstünlüyü əldə etməsində əsas vasitəyə çevrilmişdir. Müəssisələr ERP (Enterprise Resource Planning) sistemləri vasitəsilə istehsalat, logistika, satış və maliyyə əməliyyatlarını mərkəzləşdirilmiş şəkildə idarə edirlər. Məsələn, "SAP" və "Oracle ERP" kimi sistemlər beynəlxalq şirkətlərdə geniş tətbiq olunur. Eyni zamanda, müştəri əlaqələrinin idarə olunmasında CRM (Customer Relationship Management) sistemləri satışların artırılması və müştəri məmnuniyyətinin yüksəldilməsi məqsədilə istifadə olunur.

Dövlət idarəçiliyində rəqəmsal idarəetmə modelləri şəffaflıq və vətəndaş məmnuniyyətinin təmin olunmasına xidmət edir. Azərbaycanda ASAN xidmət modelinin tətbiqi bu sahədə uğurlu nümunələrdən biridir. Bu model vətəndaşlara dövlət xidmətlərini elektron formada təqdim etməklə vaxt və resurs itkilərini minimuma endirmişdir. Eyni zamanda, e-hökumət portalı vasitəsilə vergi, sosial təminat, mülkiyyət və təhsil sahələrində onlarla xidmət vətəndaşlara real vaxtda təqdim olunur.

Təhsil sektorunda informasiya sistemləri elektron jurnal, virtual sinif otaqları və distant təhsil platformaları kimi formalarla tədris prosesini daha çevik etmişdir. Səhiyyədə isə "elektron resept" və "elektron xəstə kartı" sistemləri tibbi xidmətlərin keyfiyyətini və əlçatanlığını artırır. Maliyyə sahəsində banklar internet və mobil bankçılıq sistemləri ilə müştərilərə 24/7 xidmət göstərir, eyni zamanda daxili risklərin və əməliyyatların idarə edilməsində informasiya sistemlərindən geniş istifadə olunur.

Bu praktiki nümunələr göstərir ki, informasiya sistemlərinin tətbiqi idarəetmənin bütün səviyyələrində innovasiya və səmərəlilik gətirir. Azərbaycanda bu sahədə həyata keçirilən rəqəmsallaşma islahatları milli iqtisadiyyatın rəqəmsal transformasiyasını sürətləndirmişdir.

**Qarşıda Duran Çətinliklər və İnkişaf Perspektivləri.**

İnformasiya sistemlərinin idarəetmədə tətbiqi ilə yanaşı, bu proses bir sıra texniki və təşkilati çətinliklərlə də müşayiət olunur. Ən ciddi problemlərdən biri bəzi regionlarda informasiya texnologiyaları üzrə infrastrukturun zəif inkişaf etməsidir. Məsələn, kənd və ucqar bölgələrdə internet bağlantısının zəifliyi elektron idarəetmə sistemlərinin tam tətbiqinə mane olur. Bundan əlavə, köhnəlmiş avadanlıqlar və proqram təminatının yenilənməməsi informasiya sistemlərinin effektivliyini aşağı salır.

İnsan resurslarının çatışmazlığı və rəqəmsal savadlılıq səviyyəsinin aşağı olması da ciddi problemlərdəndir. Kiçik və orta müəssisələrdə çalışanların çoxu informasiya texnologiyalarından effektiv istifadə bacarığına malik deyillər. Bu səbəbdən yeni texnologiyaların mənimsənilməsi və tətbiqi gecikə bilir. Həmçinin dövlət idarələrində çalışan əməkdaşların bəzən yeni sistemlərə adaptasiyası üçün əlavə təlimlərə ehtiyac yaranır.

Kibertəhlükəsizlik məsələləri də müasir informasiya sistemlərinin inkişafında böyük əhəmiyyət kəsb edir. Xüsusilə şəxsi məlumatların qorunması, kiberhücumların qarşısının alınması və sistemlərin dayanıqlılığı prioritet sahələrdəndir. Məsələn, 2023-cü ildə Avropada bəzi bank sistemlərinə edilmiş kiberhücumlar nəticəsində müştəri məlumatlarının sızması ciddi narahatlıq doğurmuşdur.

Bütün bu çətinliklərlə yanaşı, inkişaf perspektivləri də genişdir. Süni intellektin idarəetmədə tətbiqi proqnozlaşdırma, analitik təhlil və proseslərin avtomatlaşdırılması baxımından yeni imkanlar açır. Avtomatlaşdırılmış qərar qəbuletmə sistemləri təşkilatlara daha çevik və obyektiv idarəetmə imkanı yaradır. Məsələn, böyük logistika şirkətləri süni intellektə əsaslanan marşrut planlaşdırma sistemlərindən istifadə edərək xərcləri azaldır və çatdırılma vaxtını optimallaşdırır. Gələcəkdə bu texnologiyaların daha geniş sahələrə inteqrasiyası gözlənilir.

## Nəticə

Aparılan tədqiqat göstərdi ki, informasiya sistemləri idarəetmənin bütün səviyyələrində qərar qəbuletmənin sürətini və dəqiqliyini əhəmiyyətli dərəcədə artırır. ERP və DSS kimi sistemlərin tətbiqi nəticəsində müəssisələrdə əməliyyat xərcləri azalmış, məhsuldarlıq isə orta hesabla 15–20% artmışdır. Dövlət idarəçiliyində rəqəmsal platformalar şəffaflığı artırmaqla yanaşı, vətəndaş məmnuniyyətini də yüksəltmişdir. Təhsil və səhiyyə sahələrində tətbiq edilən elektron sistemlər xidmətlərin əlçatanlığını və keyfiyyətini artırmışdır.

Lakin infrastruktur, insan resursları və kibertəhlükəsizlik kimi problemlər bu inkişafı müəyyən qədər məhdudlaşdırır. Bu səbəbdən, informasiya sistemlərinin tətbiqi ilə bağlı milli və təşkilati səviyyədə kompleks strategiyaların hazırlanması vacibdir. Gələcəkdə süni intellekt, maşın öyrənməsi və real vaxtda analiz imkanlarının idarəetmədə geniş yer tutacağı gözlənilir. Xüsusilə rəqəmsal savadlılıq üzrə maarifləndirmə tədbirləri informasiya sistemlərindən istifadənin effektivliyini artıracaqdır. Tədqiqat nəticələrinə əsasən tövsiyə olunur ki, idarəetmə strukturları informasiya sistemlərinə investisiya etməklə rəqabətqabiliyyətliliyini gücləndirsin. Beləliklə, informasiya sistemləri idarəetmədə innovasiyaya əsaslanan dayanıqlı inkişaf üçün mühüm vasitəyə çevrilir.

## Ədəbiyyat

1. Əliyev, H. (2018). *İnformasiya texnologiyaları və idarəetmədə tətbiqi*. Bakı: Bakı Dövlət Universiteti Nəşriyyatı.
2. Qasımov, R. (2020). *Rəqəmsal transformasiya və dövlət idarəçiliyi*. Bakı: Elm və Təhsil.
3. Laudon, K. C., & Laudon, J. P. (2021). *Management Information Systems: Managing the Digital Firm (16th ed.).* Pearson Education.
4. Turban, E., Volonino, L., & Wood, G. (2018). *Information Technology for Management: On-Demand Strategies for Performance, Growth and Sustainability (11th ed.)*. Wiley.
5. Stair, R., & Reynolds, G. (2020). *Principles of Information Systems (13th ed.)*. Cengage Learning.
6. OECD. (2022). *Digital Government in the 21st Century: Delivering Better Public Services through Technology*. Paris: OECD Publishing.
7. Digital government. https://www.oecd.org/governance/digital-government
8. Şahbazov, M. (2019). *Elektron hökumət sistemlərinin inkişafı və informasiya təhlükəsizliyi məsələləri*. Bakı: "Nurlan" nəşriyyatı.
9. World Bank. (2023). *Government Digital Transformation: A Global Perspective*. Washington, D.C.: World Bank Publications.
10. Digital Transformation. https://www.worldbank.org/digitaltransformation

DOI: https://doi.org/10.36719/2663-4619/113/153-156

**Mammad Mammadov**
Baku State University
Master student
https://orcid.org/0009-0007-4984-6153
mmammadov870@gmail.com

# Political Pluralism and Multi-Party Democracy

**Abstract**

Democracies are largely based on majority rule. The promotion of the dominant concept of democracy, founded on a majoritarian or pluralistic system at the national level, is closely connected with the concept of democracy within the party. The concepts of democracy implemented at both national and party levels exhibit a certain parallelism. The fact that the internal activities of political parties deviate from the concept of pluralist democracy and remain open to leader dominance through an oligarchic structure results in the formation of a majoritarian-based democracy at the country level. The objective of this study is to analyze political pluralism and multi-party democracy.

***Keywords:*** *democracy, political pluralism, party, multi-party democracy*

**Məhəmməd Məmmədov**
Bakı Dövlət Universiteti
magistrant
https://orcid.org/0009-0007-4984-6153
mmammadov870@gmail.com

# Siyasi plüralizm və çoxpartiyalı demokratiya

**Xülasə**

Demokratiyalar əsasən çoxluğun idarəçiliyinə əsaslanır. Ölkə səviyyəsində hakim demokratiya anlayışının majoritar və ya plüralist oxda irəliləməsi partiya daxilindəki demokratiya anlayışı ilə sıx əlaqədədir. Ölkə və partiya miqyasında həyata keçirilən demokratiya anlayışları müəyyən paralellik nümayiş etdirir. Siyasi partiyaların daxili fəaliyyətinin plüralist demokratiya anlayışından uzaqlaşması və oliqarxik quruluş vasitəsilə liderlərin hökmranlığına açıq olması ölkə səviyyəsində demokratiya anlayışının majoritar oxda formalaşmasına səbəb olur. Tədqiqatın məqsədi siyasi plüralizm və çoxpartiyalı demokratiyanın təhlilidir.

***Açar sözlər:*** *demokratiya, siyasi plüralizm, partiya, çoxpartiyalı demokratiya*

## Introduction

Political pluralism and multi-party democracy are important attributes of modern civilization. After freeing itself from the totalitarian communist regime and gaining independence, the Republic of Azerbaijan initiated the process of creating various socio-political movements and political organizations. As this process deepened, political parties emerged in the country's political landscape. This process of formation continues to this day. In 1992, the parliament adopted a separate law on "Political Parties." Following this, it was announced that more than 60 parties had been established in the republic, of which 48 were registered with the Ministry of Justice. Later, due to mergers and the cessation of activities of certain parties, their number decreased slightly. Currently, 36 political parties have official legal status (Azərbaycan Respublikasında siyasi sistemin demokratik transformasiyası prosesində çoxpartiyalılığın inkişafı xüsusiyyətləri, 2015).

**Research**

In the autumn of 1995, for the first time in the history of the Republic of Azerbaijan, elections to the Milli Majlis were held under a proportional system based on both majoritarian and multi-party

 

ideoloji təsirdədir ki, bu da ictimai şüurun, ictimai rəyin və onun ideoloji məzmununun vəziyyətindən irəli gəlir.

Bu gün bəzi media qurumları həm siyasi, həm də iqtisadi səbəblərə görə öz üzərinə düşən məsuliyyəti hiss etmədən məlumat və xəbərlər yayımlamaqda davam edir. Onların proqramları bəzən dövlətin və millətin maraqlarına deyil, sarı mətbuat məntiqinin və maraqlı qrupların mənafelərinə uyğun hazırlanır. Bununla da ən əsas vəzifələri olan dəqiq məlumat və xəbər vermək məsuliyyətindən yayınırlar. Bütün bu xüsusiyyətlərə malik olan KİV müasir dövrün ən böyük "mədəni istehsal" alətinə çevrilmişdir. Medianın cəmiyyət tərəfindən düzgün qavranılması üçün xəbərlər maksimum sadə, obyektiv və "real" vəziyyətə mümkün qədər yaxın hazırlanmalıdır (Problema vzaimootnosheniy gosudarstva i grazhdanskogo obshchestva v istorii politicheskoy mysli, 2018).

## Nəticə

Hazırda Azərbaycan dövləti və cəmiyyəti keyfiyyətcə yeni inkişaf mərhələsini yaşayır, ictimai həyatın bütün sahələri yenilənir, beynəlxalq standartlara cavab verən informasiya-kommunikasiya texnologiyaları tətbiq edilir, insanların rifahı yüksəlir. Bu baxımdan Heydər Əliyev bu mərhələnin xüsusiyyətlərini vurğulayaraq qeyd edirdi: “Bu gün bizim çoxlu jurnalistlərimiz var. Kəmiyyət baxımından heç bir çatışmazlığımız yoxdur. Bununla belə, keyfiyyət baxımından çatışmazlıqlarımız var. Bəlkə də təbiidir. Əvvəlcə böyük bir jurnalist ordusu yaratmaq, çoxlu qəzetlər yaratmaq, sonra keyfiyyəti tədricən artırmaq lazım idi. İndi kəmiyyətdən çox keyfiyyətə diqqət yetirməyə çalışın” (Əliyev, 2000).

Bu ideya Heydər Əliyev siyasi kursunun layiqli davamçısı - Azərbaycan Respublikasının hazırkı Prezidenti İlham Əliyevin fəaliyyətində öz əksini tapmışdır. 2008-ci il iyulun 31-də Azərbaycan Prezidenti İlham Əliyevin sərəncamı ilə Azərbaycan Respublikasında kütləvi informasiya vasitələrinin inkişafına dövlət dəstəyi Konsepsiyası təsdiq edilmişdir.

Konsepsiyanın tələblərinə uyğun olaraq 2009-cu il aprelin 3-də Azərbaycan Respublikasının Prezidenti yanında Kütləvi İnformasiya Vasitələrinə Dövlət Dəstəyi Fondu yaradılıb və media layihələrinin maliyyələşdirilməsinə başlanılıb. Kütləvi İnformasiya Vasitələrinin İnkişafına Dövlət Dəstəyi Fondu (KİVF) ölkə prezidentinin mətbuata dəstək üçün ayırdığı dövlət vəsaitlərinin bölüşdürülməsinə nəzarəti həyata keçirir. Bu, ölkədə tənqidin özü naminə yersiz tənqidə deyil, Azərbaycanın rifahının ümumi məqsədləri naminə konstruktiv mövqeyə köklənmiş mətbuatın məqsədyönlü formalaşmasının əsas yoludur.

Kütləvi informasiya vasitələrinin fəaliyyətinin intensivləşdirilməsi və hazırladıqları materialların keyfiyyətinin yüksəldilməsi üçün akademik Ramiz Mehdiyevin “Demokratiyaya gedən yolda: İrs üzərində düşüncə” məqaləsi böyük stimul oldu. Televiziyamızda yayımlanandan sonra intellektual, maarifləndirici, ən əsası vətənpərvərlik yönümlü verilişlərin sayı artdı. Bütün bu dəyişikliklər KİV-in Azərbaycan dövlətçiliyinin inkişafına gələcək xidməti üçün əlverişli “təzə” zəmin yaratmışdır. Ümumiləşdirsək, medianın plüralist cəmiyyətin ayrılmaz hissəsi olduğunu iddia etmək olar. Azad media olmadan vətəndaşlar öz hüquqlarını müdafiə edə, azad danışa, dinlənilə bilməz.

## Ədəbiyyat

1. Azərbaycan Gənclərinin Koordinasiya Şurası (KSAM). (n.d.). Rəsmi internet saytı. http://www.ksam.org/index
2. Azərbaycan Respublikasının Konstitusiyası. (2009). Bakı.
3. Azərbaycan Respublikası. (2001). *Kütləvi informasiya vasitələri haqqında Qanun*. Bakı: Qanun.
4. Əliyev, H. (2000, İyul 22). Mətbuatımızın bayramı, ümumxalq bayramı: Prezident Heydər Əliyevin Azərbaycan mətbuatının 125 illik yubileyinə həsr olunmuş mərasimdəki nitqi. *Bakı fəhləsi*.
5. Mehdiyev, R. (2009). Azərbaycanın efir məkanı: problemlər və mövzular. *Dövlət İdarəçiliyi: Nəzəriyyə və Təcrübə*, (1)25.
6. Mehdiyev, R. (2007). *Demokratiyaya gedən yolda: irsi əks etdirən*. Bakı.
7. Problema vzaimootnosheniy gosudarstva i grazhdanskogo obshchestva v istorii politicheskoy mysli. (2018). *Politicus. Naukoviy zhurnal,* 4.

DOI: https://doi.org/10.36719/2663-4619/113/168-172

**Nigar Süleymanova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
https://orcid.org/0009-0008-8331-3956
amiraslanigar99@gmail.com

# Dil qaydalarının yazı bacarıqlarına təsiri və inteqrativ tədris

**Xülasə**

Məzmun xətləri ümumi təlim nəticələrinin reallaşdırılması üçün müəyyən olunan fənn kurikulumunun zəruri hissəsi olub, şagirdlərin əldə edəcəyi bilik və bacarıqları daha aydın təsvir etmək və onu sistemləşdirmək məqsədi daşıyır. Məqalədə yazı və dil qaydaları məzmun xətti üzrə işlərin inteqrativ təşkilinin yazı bacarıqlarının təkmilləşdirilməsinə təsiri aydınlaşdırılmışdır.

Azərbaycan dili kurikulumu hazırlanarkən şagirdlərin məntiqi, tənqidi, yaradıcı təfəkkürlərinin inkişaf etdirilməsi məqsədi ilə onların bir-birləri ilə ünsiyyəti, əməkdaşlığı, oxu bacarıqları, müxtəlif tipli yazı nümunələri, gələcək peşə fəaliyyətində yararlı olan mühüm bacarıqlarının formalaşdırlması əsas mətləb olmuşdur.

Yazılmış məqalədən belə nəticəyə gəlmək olar ki, fəal interaktiv dərslərdə inteqrasiya yalnız fənlərarası və fəndaxili deyil, məzmun standartlarının öz daxilində də mövcuddur.

***Açar sözlər:*** *yazı, dil qaydası, məzmun xətti, inteqrativlik, dərs, Azərbaycan dili*

**Nigar Suleymanova**
Azerbaijan State Pedagogical University
https://orcid.org/0009-0008-8331-3956
amiraslanigar99@gmail.com

# The Impact of Language Rules on Writing Skills and Integrative Teaching

**Abstract**

Content lines are a necessary part of the subject curriculum defined for the realization of general learning outcomes, and aim to more clearly describe and systematize the knowledge and skills that students will acquire. In the article, the effect of the integrative organization of works on the content line of writing and language rules on the improvement of writing skills is clarified.

In order to develop the logical, critical and creative thinking of the students, the main goal was to develop their communication, cooperation, reading skills, different types of writing samples, important skills useful in their future professional activities.

It can be concluded from the written article that integration in active interactive lessons is not only interdisciplinary and intra-disciplinary, but also exists within the content standards themselves.

***Keywords:*** *writing, language order, content line, integrative, lesson, Azerbaijani language*

## Giriş

Azərbaycan dövləti təhsil sahəsində apardığı mütərəqqi siyasət nəticəsində bu sahədə mühüm islahatlar həyata keçirmiş və müasir dövrün tələblərinə uyğun tədris modelini formalaşdırmağa nail olmuşdur. Xüsusilə, milli və fənn kurikulumlarının yaradılması və təkmilləşdirilməsi istiqamətində görülən işlər təhsil sisteminin modernləşdirilməsinə mühüm töhfə vermişdir. Kurikulum islahatları çərçivəsində şagirdlərin idrak fəallığının artırılması, onların tənqidi və yaradıcı təfəkkürünün inkişaf etdirilməsi, eyni zamanda müasir pedaqoji texnologiyaların tədris prosesinə inteqrasiyası əsas prioritetlərdən biri kimi müəyyən edilmişdir.

Müasir kurikulum yanaşmaları, eyni zamanda, Azərbaycan təhsil sisteminin qlobal təhsil məkanına inteqrasiyasını sürətləndirmiş və beynəlxalq standartlara uyğunlaşdırılmasını təmin etmişdir.

Beynəlxalq təcrübəyə əsaslanan yeni təhsil konsepsiyaları dünya təhsil sistemində tətbiq olunan qabaqcıl metodikaları milli kontekstdə reallaşdırmağa imkan vermişdir. Təhsilin keyfiyyətinin yüksəldilməsi məqsədilə rəqəmsal texnologiyaların tətbiqi, fənlərarası inteqrasiyanın genişləndirilməsi, tədqiqat yönümlü öyrənmə metodlarının inkişaf etdirilməsi kimi aspektlərə xüsusi diqqət yetirilmişdir. Eyni zamanda, müəllimlərin peşəkar inkişafına və onların innovativ tədris metodlarına yiyələnməsinə şərait yaradılması, təhsil prosesinin keyfiyyətinə müsbət təsir göstərmişdir. Bu yanaşmalar nəticəsində Azərbaycan təhsil sistemi qlobal təhsil tendensiyalarına uyğunlaşdırılaraq, bilik iqtisadiyyatı üçün zəruri olan müasir kompetensiyalara malik fərdlərin yetişdirilməsinə xidmət edir (Bayramov, Məhərrəmov, & İsgəndərzadə, 2015).

**Tədqiqat**

Məzmun xətləri ümumi təlim nəticələrinin reallaşdırılması üçün müəyyən olunan fənn kurikulumunun zəruri hissəsi olub, şagirdlərin əldə edəcəyi bilik və bacarıqları daha aydın təsvir etmək və onu sistemləşdirmək məqsədi daşıyır. Dil tədrisi ilə bağlı kompetensiyaları “başa düşmə” (dərk etmə) və “başa salma” şəklində qruplaşdırmaq mümkündür. Birinci qrupa oxumaq və dinləmək, ikinci qrupa isə danışmaq və yazmaq kimi bacarıqları daxildir. Azərbaycan dili ilə bağlı məzmun xətləri sadalanan bacarıqları, həmçinin dil qaydalarını əhatə edir (Azərbaycan Respublikasının Təhsil Nazirliyi, 2022, s. 8).

Müasir təhsil yanaşmaları çərçivəsində Azərbaycan dili üzrə təlimin məqsəd və vəzifələrinə uyğun olaraq dörd əsas məzmun xətti müəyyən edilmişdir:

**Dinləyib-anlama, danışma** – Şagirdlərin nitq mədəniyyətinin formalaşdırılması, dinlədikləri və ya iştirak etdikləri ünsiyyət proseslərini mənimsəmələri və məntiqli şəkildə danışmaları bu məzmun xəttinin əsas məqsədlərindəndir.

**Oxu** – Şagirdlərin müxtəlif mətn növlərini anlama, təhlil etmə və qiymətləndirmə bacarıqlarını inkişaf etdirməyə yönəlmişdir.

**Yazı** – Düşüncələrin və ideyaların yazılı formada məntiqi və rabitəli şəkildə ifadə olunmasını təmin edir.

**Dil qaydaları** – Şagirdlərə fonetik, leksik və qrammatik biliklər qazandırmaqla yanaşı, onların yazı və nitq bacarıqlarını normativ qaydalara uyğun şəkildə inkişaf etdirməyə xidmət edir.

Bu məqalədə əsas diqqət üçüncü və dördüncü məzmun xətləri olan yazı və dil qaydalarının inteqrativ təşkilinə yönəldiləcəkdir. Bu yanaşma, yazılı nitqin formalaşması ilə paralel şəkildə dil qaydalarının mənimsənilməsinə imkan yaradır. İnteqrativ tədris modeli, hər iki sahənin bir-birini tamamlamasını təmin etməklə şagirdlərin həm nəzəri bilikləri, həm də praktik yazı bacarıqlarını gücləndirir.

✓ Yazı bacarıqlarının formalaşdırılması

Yazı prosesi şagirdlərin duyğu və düşüncələrini dilin norma və qaydalarına uyğun şəkildə ifadə etməsinə xidmət edir. Yazı bacarığı yalnız mətnin məzmun baxımından zəngin olması ilə deyil, həm də onun struktur baxımından düzgün və rabitəli şəkildə qurulması ilə ölçülür. Şagirdlərin qoyulmuş problem və ya mövzu ətrafında öz fikirlərini məntiqli ardıcıllıqla ifadə edə bilməsi, onların tənqidi və yaradıcı düşünmə qabiliyyətlərini inkişaf etdirir. Yazı həmçinin tədqiqatçılıq, mühakimə yürütmə və təşkilatçılıq bacarıqlarını nümayiş etdirməyə imkan yaradır.

✓ Dil qaydalarının mənimsənilməsi və tətbiqi

Dil qaydaları məzmun xətti, şagirdlərin fonetik, leksik və qrammatik bilikləri sistemli şəkildə öyrənməsini təmin etməklə onların yazılı və şifahi nitqini təkmilləşdirir. Bu məzmun xətti dilin daxili strukturuna dair bilikləri sadə və anlaşıqlı qaydalar şəklində təqdim edir və onların praktiki tətbiqini dəstəkləyir. Dil qaydalarının mənimsənilməsi, yazı prosesində orfoqrafik normaya riayət olunmasını, cümlə strukturunun düzgün qurulmasını və durğu işarələrindən yerli-yerində istifadə edilməsini təmin edir (*Azərbaycan dilinin tədrisi: ənənə və müasirlik*, 2010).

Yazı bacarığının inkişafı, şagirdlərin təhsil prosesində üzləşdikləri bir sıra mərhələləri əhatə edir. Bu mərhələlər, yazının strukturuna və dil normalarına uyğun şəkildə formalaşır. İlk mərhələdə, şagirdlər hüsnxət normalarına riayət etməli, ikinci mərhələdə isə orfoqrafik qaydalara uyğun yazmağı öyrənməlidirlər. Üçüncü mərhələ, alınmış məlumatları öz sözləri ilə ifadə etməkdir və bu mərhələ yazının daha müstəqil və yaradıcı formada təşkilini tələb edir. Nəhayət, dördüncü mərhələdə şagirdlər

öz hiss və düşüncələrini yazılı formada ifadə etməlidirlər. Bu mərhələdə ən çox istifadə edilən yazılı formalara üzündən köçürmə, imla, inşa və esse daxildir.

Yazı bacarığının ən çətin və mürəkkəb mərhələsi 4-cü mərhələdir, yəni şagirdlərin fikirlərini ədəbi dilin qaydalarına uyğun şəkildə ifadə etmələri. Əslində, bu mərhələdə şagirdlərin yaradıcı və tənqidi düşünmə qabiliyyətləri inkişaf edir və onlar öz fikirlərini daha müstəqil şəkildə ifadə edirlər. Bu prosesin uğurlu həyata keçirilməsi üçün şagirdlərə uyğun motivasiya verilməli və onları müvafiq yazılı fəaliyyətlərə cəlb etmək vacibdir.

Azərbaycan dilinin tədrisində əhəmiyyətini qorumaqda olan və orta məktəblərdə geniş istifadə olunan bir sıra yazı növləri vardır:

- İmla
- İfadə
- İnşa
- Rəy- inşa
- Esse
- Əməli yazılar

İnsanlar yazı vasitəsi ilə həyat boyu ictimai, iqtisadi və mədəni sahələrdə əldə etdikləri nailiyyətləri ümumiləşdirir, elmi, bədii yaradıcılıq işləri aparır, özünün tarixini yaradır, onu gələcək nəsillər üçün sistemləşdirir, qoruyub saxlayırlar. Dilin özünəməxsusluğunu, zənginliyini mühafizə edirlər. Yazı Azərbaycan dili təlimində ən zəruri bacarıqları əhatə edir, oxu üzrə fəaliyyətlərin həyata keçirilməsinə imkan yaradır. Buna görə də yazı dövlət dili kimi Azərbaycan dili təlimində məzmun xətlərindən biri kimi qəbul olunur. Yazı məzmun xətti kimi Azərbaycan dili təlimində ilkin yazı texnikasının, orfoqrafik, durğu işarəsi qaydalarının, dil vahidlərindən, onun üslubi imkanlarından, nitqin müxtəlif formalarından istifadə bacarıqlarının mənimsənilməsini təmin edir (Azərbaycan Respublikasının Təhsil Nazirliyi, 2013, s. 10).

Azərbaycan dili fənn kurikulumunda yazı məzmun xətti üzrə ümumi təlim nəticələrinə diqqət yetirərkən, yazı və dil qaydaları məzmun xətləri arasında sıx inteqrasiya və əlaqə olduğunu müşahidə edirik. Yazı bacarıqları, şagirdlərin yalnız fikirlərini düzgün və aydın şəkildə ifadə etmələrini deyil, həm də dilin struktur qaydalarına uyğun şəkildə tətbiq etmələrini tələb edir. Bu inteqrasiya, şagirdlərin yazılı nitqində orfoqrafiya, qrammatika və durğu işarələri kimi dil qaydalarını tətbiq etmələrini, həmçinin dil vahidlərindən istifadə edərək müxtəlif yazı formalarında bacarıqlarını nümayiş etdirmələrini əhatə edir (Azərbaycan dili tədrisində dil qaydalarının mənimsədilməsində alqoritmlərdən istifadə, 2021).

Siniflər üzrə yazı standartları müxtəlif yazı formalarında (inşa, ifadə, esse, hekayə və s.) bacarıqlarının inkişaf etdirilməsini tələb edir. Bu yazı formalarının hər biri, şagirdlərin fərqli yazılı ifadə və tənqidi düşünmə qabiliyyətlərini inkişaf etdirir. Pedaqoji ədəbiyyatda esse və inşa arasında kəskin sərhəd qoyulmur. Lakin müasir təhsil sistemində daha çox esse yazı formasına üstünlük verilir, çünki esse daha çox şagirdlərin müstəqil düşünmə və öz fikirlərini inkişaf etdirmə qabiliyyətlərini əks etdirir. Ənənəvi inşa yazılarından fərqli olaraq, esse konkret situasiyalar üzərində qurulub, şagirdlərin öz baxışlarını və təcrübələrini daha sərbəst şəkildə təqdim etmələrinə imkan yaradır.

İmla da şifahi nitqlə yazılı nitqi əlaqələndirən inteqrativ yazı növüdür. İmla yazılardan iki məqsədlə istifadə olunur: *öyrətmək və yoxlamaq*. İmlalar orfoqrafik çalışmaların ən məhsuldar növüdür. Orfoqrafiya və orfoepiya qaydalarının öyrənilməsini təmin edən imlalar Azərbaycan dili fənninin Yazı məzmun xətti üzrə bilik və bacarıqların mənimsənilməsində önəmli tapşırıqdır. İmla üzrə işin düzgün təşkili şagirdlərin savadını artırır, onların müvafiq bilik və bacarıqlara yiyələnmələrini sürətləndirir. Bunun üçün də Azərbaycan dili dərslərində mütəmadi olaraq imlalardan istifadə olunmalıdır. Yalnız bu halda şagirdlər öyrəndikləri orfoqrafik qaydaları dəfələrlə işlətməklə yadda saxlayır, vərdişə çevirirlər (Nəhmətova, 2020, s. 36).

Azərbaycan dili kurikulumunda dil qaydaları ilə bağlı standartlar 5-7-ci siniflərdə fonetika, morfologiya, 8-11-ci siniflər üzrə standartlar, əsasən, sintaksis, üslubiyyat, nitq mədəniyyəti məsələlərini əhatə edir. Ona görə də müəllimlər aşağı siniflərdən başlayaraq şagirdlərdə yazı texnikasını inkşaf etdirməlidir.

Ümumi orta təhsil səviyyəsində şagirdlərin yazı bacarıqlarının inkişafı təlim prosesinin vacib hissəsidir. Bu, şagirdlərin rabitəli yazı vərdişlərinə yiyələnməsi, müxtəlif əməli yazı nümunələrini düzgün şəkildə ifadə etməsi, mətn hissələrini və abzasları fərqləndirə bilməsi kimi əsas bacarıqları özündə əks etdirir. Bu prosesdə şagirdlərə aşağıdakı bacarıqlar qazandırılır:

**Yazılı ifadə bacarıqları**: Şagirdlər verilmiş hər hansı bir mövzunu müxtəlif yazı formalarında (inşa, esse, hekayə və s.) ifadə etməli və fikir və düşüncələrini aydın şəkildə yazılı şəkildə təqdim etməlidirlər.

**Sitatlardan istifadə edərək fikrin dəqiqləşdirilməsi**: Şagirdlər mətnlərdən sitatlar gətirərək, öz fikirlərini dəqiqləşdirməli və onları daha inandırıcı şəkildə təqdim etməlidirlər.

**Yazının növ və tipləri**: Şagirdlər yazının müxtəlif növ və tiplərini düzgün ifadə etməli və bu zaman dil qaydalarından maksimal dərəcədə istifadə etməli və tətbiq etməlidirlər.

Yazı növləri və tipləri şagirdlərin yazılı ifadə bacarıqlarını inkişaf etdirməkdə mühüm rol oynayır. Yazının növləri aşağıdakı kimi müəyyən olunur:

1. Yazının növləri:
- ❖ *İnşa*
- ❖ *İfadə*
- ❖ *Esse*
- ❖ *Hekayə*
- ❖ *Rəy*
- ❖ *Məqalə*

2. Yazının tipləri:
- ➢ *Təsviri xarakterli yazılar*
- ➢ *Nəqli xarakterli yazılar*
- ➢ *Mühakimə xarakterli yazılar*

Hər bir yazı növü və tipi şagirdin yazılı ünsiyyət bacarıqlarının müxtəlif aspektlərini inkişaf etdirir. Bu bacarıqlar şagirdin dil qaydalarına əsaslanan yazılı ifadə və ünsiyyət qurma qabiliyyətlərini artırır.

**Dil qaydalarının əhəmiyyəti**: Şagirdlər yazı bacarıqlarını inkişaf etdirmək üçün dil qaydalarını düzgün və tam mənimsəməlidirlər. Dil qaydalarını yaxşı mənimsəməyən şagirdin nitqi və yazısı qeyri-dəqiq, yanlış və anlaşılmaz ola bilər. Buna görə də:

**Dil qaydaları**: Dilin fonetik, leksik və qrammatik strukturlarına riayət etmək şagirdlərin yazı bacarıqlarını inkişaf etdirir.

**Yazı bacarıqlarının linqvistik əsasları**: Dil qaydalarını yaxşı mənimsəyən hər bir şagirdin yazı qabiliyyəti də yüksək səviyyədə olur.

**Oxu və yazı bacarıqlarının əlaqəsi:** Dil qaydalarının düzgün mənimsənilməsi həm oxu, həm də yazı bacarıqlarının inkişafını təmin edir.

**Mətnin strukturu və təşkilati əhəmiyyəti**: Yazı bacarıqlarının inkişafı prosesində mətnin düzgün strukturunun təşkil edilməsi vacibdir. Mətnin strukturunun əsas xüsusiyyətləri və əlamətləri aşağıdakılardır:

- ▪ **Cümlələrin əlaqəliliyi**: Mətnin cümlələri məna və qrammatik cəhətdən bir-biri ilə əlaqəli olmalıdır.
- ▪ **Başlıq**: Hər bir mətnin başlığı olmalı və ya mətnə uyğun başlıq verilməlidir.
- ▪ **Mətnin hissələri**: Mətn ümumiyyətlə üç hissədən ibarət olur:
  - o Giriş: Mətnin başlanğıcı və təqdimatı
  - o Əsas hissə: Mətnin özəyi, əsas fikrin inkişafı
  - o Nəticə: Mətnin yekunu, qənaət və ya hökm

Yazı bacarıqlarının inkişafında mətnin xarakteri: Mətnin xarakteri də yazı bacarıqlarının inkişafına böyük təsir göstərir. Mətnin xarakterinə görə, müxtəlif yazı növləri müəyyən edilir:

- ✓ **Nəqli mətnlər:** Fikirlərin sadə və aydın şəkildə çatdırılması məqsədilə yazılır.
- ✓ **Təsviri mətnlər**: Hadisələrin və ya obyektlərin vizual təsvirini təqdim edir.
- ✓ **Mühakimə mətnləri**: Müəyyən mövzu ilə bağlı fikirlər irəli sürülür və bu fikirlər əsaslandırılır.

Dil qaydalarının yazı bacarıqlarına təsiri və inteqrativ tədris yanaşması müasir təhsildə mühüm əhəmiyyət kəsb edir. Azərbaycan dili fənninin kurikulumunda yazı və dil qaydaları məzmun xətləri bir-birini tamamlayaraq şagirdlərin dil bacarıqlarının inkişafında fundamental rol oynayır. Yazılı ifadə bacarıqlarının təkmilləşdirilməsi, şagirdlərin hərtərəfli inkişafını təmin etmək məqsədilə dil qaydalarının öyrədilməsi ilə sıx əlaqəlidir. Şagirdlər dil qaydalarına uyğun olaraq yazılı mətnlər təqdim etdikdə, yalnız dilin normativ tərəflərini deyil, həm də düşüncə və ifadə formalarını doğru qurma qabiliyyətlərini inkişaf etdirirlər. Bu, onların analitik, yaradıcı və tənqidi təfəkkürünü gücləndirir və onlara təhlil etmə, quruluş yaratma və məzmunu dəqiq ifadə etmə bacarıqlarını qazandırır (Azərbaycan dili kurikulumu).

İnteqrativ tədris yanaşması yazı və dil qaydalarını birləşdirərək şagirdlərin mətnləri daha dərindən anlamasına, onlardan müxtəlif növ və formatlarda istifadə etməsinə imkan verir. Dil qaydalarının inteqrasiyası, xüsusən yazılı ifadə üçün vacib olan struktur və texnikaların düzgün mənimsənilməsini təmin edir. Bu yanaşma, şagirdlərə həm yazılı ifadə qabiliyyətlərini inkişaf etdirmək, həm də onların dilin müxtəlif aspektlərini daha mükəmməl şəkildə istifadə etmələrinə şərait yaradır. İnteqrativ tədris, həmçinin digər fənnlər üzrə dərslərdə də dilin effektiv istifadəsini gücləndirir, beləliklə, şagirdlər yalnız dilin strukturlarını deyil, həm də dilin tədris etdiyi məzmunu daha dərindən başa düşürlər. Yazılmış məqalədən belə nəticəyə gəlmək olar ki, fəal interaktiv dərslərdə inteqrasiya yalnız fənlərarası və fəndaxili deyil, məzmun standartlarının öz daxilində də mövcuddur.

## Nəticə

Bununla yanaşı, dil qaydaları və yazı bacarıqlarının inteqrativ tədrisi şagirdlərə yalnız dərs zamanı deyil, gündəlik həyatlarında da böyük üstünlüklər təmin edir. Bu yanaşma onların analitik düşünmə, yazılı və şifahi ifadə etmə bacarıqlarını inkişaf etdirərək gələcəkdə uğurlu peşə fəaliyyətinə və sosial münasibətlərə zəmin yaradır. Dil qaydalarının düzgün tətbiqi və yazı bacarıqlarının təkmilləşdirilməsi, həmçinin, şagirdlərin özünüifadə qabiliyyətlərini artıraraq, onları müstəqil düşünən, mükəmməl yazılı ünsiyyət quran və dilin hərtərəfli istifadəçisi olmağa yönəldir. Bu proses nəticəsində şagirdlər yalnız akademik müvəffəqiyyət əldə etmirlər, eyni zamanda həyatda da dilin müxtəlif aspektlərinə qarşı daha məsuliyyətli yanaşırlar.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Təhsil Nazirliyi. (2013). *Azərbaycan Respublikasının Ümumtəhsil məktəbləri üçün Azərbaycan dili (Dövlət dili kimi) fənni üzrə təhsil proqramı (kurikulumu) (I-XI siniflər)*. Bakı.
2. Azərbaycan Respublikasının Təhsil Nazirliyi. (2022). *Tam orta təhsil səviyyəsinin təmayül sinifləri üçün Azərbaycan dili fənni üzrə kurikulum* (F-238 nömrəli əmrlə təsdiq edilmişdir, 28 aprel 2022).
3. Bayramov, A., Məhərrəmov, Z., & İsgəndərzadə, M (2015). *Azərbaycan dili və nitq mədəniyyəti (ali məktəb tələbələri üçün dərs vəsaiti)*. Bakı: ULU.
4. Cəfərova, N. (2016). *İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası (I hissə).* Bakı.
5. Nəhmətova, K. A. (2020). *Yazı işinin təşkili metodikası*. Bakı.
6. *Azərbaycan dilinin tədrisi: ənənə və müasirlik*. (2010, oktyabr 1). http://www.anl.az/down/meqale/az_muellimi/2010/oktyabr/135102.htm
7. Azərbaycan dili tədrisində dil qaydalarının mənimsədilməsində alqoritmlərdən istifadə. (2021, oktyabr
8. https://www.arti.edu.az/az/presentation/935-azarbaycan-dili-tadrisinda-dil-qaydalarinin-manimsadilmasinda-alqoritmlardan-istifada
9. Azərbaycan dili kurikulumu. https://metodiktovsiyye.blogspot.com/2015/09/azrbaycan-dili-kurikulumu.html

DOI: https://doi.org/10.36719/2663-4619/113/173-177

**Şərqiyyə Rəcəbova**
Lənkəran Dövlət Universiteti
https://orcid.org/0009-0007-8508-8740
racabova@internet.ru

# Üzvi kimyanın tədrisində A.Borodin və A.Nobelin elmi, bədii və ictimai irsinin əhəmiyyəti

**Xülasə**

Kimyanın öyrənilməsində kimyəvi qanun və qanunauyğunluqları, kimyəvi reaksiya və prosesləri kəşf edən alimlər, şərait, maraqlı situasiyalar çox cəlbedici görünür və bu kəşfləri edən, öyrənən alimlərin maraqlı həyat tərzləri, kimyadan əlavə məşğul olduqları ədəbiyyat, incəsənət, ictimai-siyasi fəaliyyət sahələri təhsilalanlarda kimyaya marağın yaranmasına gətirib çıxaran stimullaşdırıcı rola, funksiyaya malikdir.

Pedaqoqun tədris olunan mövzu üzrə öyrənilən kimyəvi qanunların, reaksiya və proseslərin hansı alimlər tərəfindən, hansı şəraitdə aparılması barədə dərslikdə yer almayan maraqlı məlumatları dinləyici auditoriyasına təqdim etməsi şüuraltı dərketmə mərkəzlərinin aktivləşdirilməsinə imkan verir, kimyaya olan maraqlarını görkəmli şəxslərin həyat və yaradıcılıqları üzərindən yaxşı nümunə, güclü əyani təbliğat vasitəsi kimi istifadə edilərək kimyaya maraqlarının formalaşdırılmasının stimullaşdırılmasına və dayanıqlı inkişafa gətirib çıxara bilər

***Açar sözlər:*** *üzvi kimya, görkəmli alimlər, A.Borodin, A.Nobel, ictimai irs*

**Shargiyya Rajabova**
Lankaran State University
https://orcid.org/0009-0007-8508-8740
racabova@internet.ru

# In the Teaching of Organic Chemistry A.Borodin and the Importance of A.Nobel's Scientific, Artistic and Public Heritage

**Abstract**

Scientists who discover chemical laws and regularities, chemical reactions, processes, conditions, interesting situations look very attractive in the study of chemistry, and interesting lifestyles of scientists who make and study these discoveries, in addition to chemistry, literature, art, socio-political activities have a stimulating role and function that leads to interest in chemistry in the learners.

The educator's presentation to the audience of interesting information not contained in the textbook on which scientists and under what conditions the studied chemical laws, reactions and processes are carried out on the topic being taught allows the activation of subconscious awareness centers, can lead to the stimulation of the formation of interest in chemistry and sustainable development, using their interest in chemistry

***Keywords:*** *organic chemistry, notable scholars, A.Borodin, A.Nobel, public heritage*

## Giriş

Təhsil müəssisələrində üzvi kimyanın tədrisi proseslərində təhsilalanlar üzvi birləşmələrin quruluşunu, onların bir-birinə çevrilməsini, müxtəlif nəzəriyyələr, adlı kimyəvi reaksiyalar və onların müəllifləri ilə tanış olmaq imkanı əldə edirlər. Kimya dərsliklərinin geniş təhlili göstərir ki, kimyanın bu bölməsində vəziyyət digər bölmələrindən daha pis vəziyyətdədir. Belə ki, kimyanın öyrənilməsinin ilkin mərhələlərində qanun və reaksiyaları kəşf edənlər haqqında müəyyən material olduğu halda, sonrakı bölmə-üzvi kimya bölməsi barəsində bunu demək mümkün deyildir.

Burada verilən bioqrafik məlumatlar çox azdır. Bu baxımdan buraxılan boşluğun doldurulması vacibdir və bunun mümkün yollarını dissertasiyanın bu fəslində araşdırmağa cəhd edilmişdir.

**Tədqiqat**

Üzvi kimyanın tədrisində bir sıra maraqlı adlı kimyəvi reaksiyalar, onların mexanizmləri, üzvi maddələrin tərkibi, quruluşu, zəncirdəki birləşmə ardıcıllığı arasındakı əlaqəni müəyyən edən kimyəvi quruluş nəzəriyyəsi, elektron nəzəriyyə, birləşmələrin kimyəvi formullarını əsaslandıran nəzəriyyələr mövcuddur. Bundan əlavə karbon zəncirindəki təkqat, ikiqat və üçqat rabitələr, onların təbiəti və rabitələrin uzunluğu, karbonlar arasındakı bucaqlar və məsafələr, karbonla hidrogen arasındakı bucaqlar və məsafələr kimi çoxlu sayda bilik daşıyan qanunlar, nəzəriyyələr və onları yaradan elm xadimlərinin elmi irsindən geniş istifadə edilir (Xəlilov, Əhlimanov, 1986).

Üzvi kimya sahəsindəki bu görkəmli alimlər içərisində üzvi birləşmələrin "Kimyəvi quruluş nəzəriyyəsi"nin banisi A.Butlerov, doymuş karbohidrogenlərin sintezində tətbiq edilən Vürs reaksiyasının müəllifi Ş.Vürs, benzolun formulunu müəyyən edən Kekule, sintetik kauçukun sintez üsulunu işləyib hazırlayan N.Lebedev, nitrobirləşmələri reduksiya edərək sintetik boya sənayesinin əsasını qoyan N.Zinin, aldol kondensləşməsi reaksiyasının kimyəvi əsaslarını yaradan A.Borodin, nitrobirləşmələr əsasında partlayıcı maddələrin sənaye texnologiyası yaradan A.Nobelin elmi irsi yer almışdır (Nobel Prize Internet Archive).

Üzvi kimyanın tədrisində adları çəkilən görkəmli alimlərin elmi tədqiqat irsindən, ədəbi-bədii-mədəni, ictimai-siyasi-sosial fəaliyyətlərindən geniş şəkildə faydalanmaqla təhsilalanlarda kimyaya maraqların formalaşdırılması və stimullaşdırılması kimi vacib məsələnin həyata keçirilməsi mümkündür. Bu məqsədlə hazırkı dissertasiya işində bu bölmədə adları çəkilən proseslərin öyrənilməsində bu nəzəriyyələri və prosesləri öyrənən şəxslərin elmi yaradıcılığına nəzər salınmışdır.

***A.Borodinin həyat simfoniyası.*** Bu dahi şəxsiyyət 12 noyabr 1833-cü ildə Sankt-Peterburqda gürcü knyazı L.Gedianovun qeyri-rəsmi kəbinində olmuş gözəl A. Antonovadan dünyaya gəlmişdir. Kyaz Qedianov Avdotinin ailəsini təhkimçilik hüququndan azad edərək oğluna çox yüksək təhsil verə bilmişdir.

Üzvi kimyanın öyrənilməsində kimyaçılar aldol kondensləşməsi reaksiyası ilə yaxından tanış olurlar. Bu reaksiya isə böyük rus kimyaçısı A.Borodin və fransız kimyaçısı Ş.Vürs tərəfindən eyni zamanda bir-birindən asılı olmayaraq kəşf edilmiş, öyrənilmişdir. A.Borodin kiçik yaşlarından N.Zininin yanında kimyadan dərslər almış, çoxlu ev təcrübələri aparmış, öz laboratoriyasında-otağında tez-tez kiçik partlayışlar törətmişdir. A.Borodin kimya ilə məşğul olmaqla yanaşı, eyni zamanda çox gözəl ədəbiyyat bilicisi, professional musiqiçi, bəstəkar və rəssam kimi tanınmışdır. Ona görə də üzvi kimyada açıq quruluşlu aldehidlərin tədrisi mövzusunda onların kimyəvi xassələrinin öyrənilməsi zamanı dahi kimyaçı A.Borodinin həm də musiqiçi-bəstəkar hərtərəfli yaradıcılığına nəzər salmaq faydalı olardı. Aldol kondensləşməsi reaksiyaların öyrənilməsi zamanı onun A.Borodinin kimyadan əlavə məşğul olduğu digər sahələrin xüsusiyyətlərindən məlumatlar səsləndirməklə təhsilalanların diqqətinin öyrənilən mövzuya daha cəlb etmək, prosesi motivasiya etməklə kimyaya olan maraqlarını stimullaşdırmaq olar.

***A.P.Borodinin elmi irsi.*** Yalnız musiqi, folklor, ədəbiyyat və rəssamlıqla deyil, eyni zamanda kimya ilə ciddi məşğul olan Aleksandrın evində çoxlu kimyəvi reaktivlər, kolbalar, kimya avadanlıqları var idi. Müxtəlif sahələrə ciddi maraq göstərməsinə baxmayaraq A.Borodin üçün həlledici ixtisas kimya oldu, nəinki musiqi. Onun kimyadan ən çox sevdiyi kitabı V.F.Odoevskinin "Kimyadan qısa anlayışlar" kitabı idi (Volkov, Vonskiy, Kuznetsova, 1991; Garkunov, 1984; Mendeleyev, 1947).

A.Borodin 1850-ci ildə Peterburq Tibb-Cərrahlıq Akademiyasına daxil olmuş, 1856-cı ildə oranı bitirmiş, orada müəllim kimi fəaliyyət göstərmiş və artıq iki il sonra-1858-ci ildə tibb doktoru dərəcəsini almışdır.

1860-cı illərdə Peterburqda elmi, pedaqoji və ictimai fəaliyyətlə məşğul olmuş, 1862-ci ildə assisent-professor, 1864-cü ildə professor və 1877-ci ildə akademik olmuşdur (Garkunov, 1984; 8).

1859-62-ci illərdə Avropada ezamiyyətlərdə olarkən D.Mendeleyevlə tanış olması və bu tanışlığın dostluğa çevrilməsi, Heydelberqdə həm də gələcək həyat yoldaşı məşhur Şulhoffun tələbəsi, gözəl pianoçu E.Protopova ilə rastlaşması alimin həyatında silinməz izlər buraxır. Həyat yoldaşı

böyük kimyaçının musiqi dünyasını zənginləşdirir, Şopen, List, Şumanın yaradıcılığına ciddi nüfuz edə bilir.

A.Borodinin kimyada əsas elmi istiqaməti isə üzvi sintez sahəsi olmuşdur. 1861- 62-ci illərdə gümüş duzlarına bromla təsir etməklə doymuş karbon turşuların bromlu törəmələrinin sintez üsulunu işləmiş, doymuş karbon turşularının flüorüzvi birləşmələrini sintez etmiş, 1863-73-cü illərdə aldehidlərin aldol kondensləşməsi reaksiyalarını tətqiq etmiş, 40-dan çox elmi əsərləri çap olunmuşdur (Garkunov, 1984; Mendeleyev, 1947; 8).

Aldehid və ketonlar yüksək reaksiya qabiliyyəti ilə seçilən üzvi birləşmələrdir və bu aktivlik birləşmənin tərkibindəki aktiv karbonil qrupunun varlığı ilə müəyyən edilir. Karbonilə qonşu karbon atomlarının iştirakı ilə gedən aldehidlərin aldol kondensləşməsi və ketonların kroton kondensləşmələri reaksiyaları alimin elmi fəaliyyətində geniş yer tutur.

***A.Borodinin aldol-kroton kondensləşməsi reaksiyası.*** Bu reaksiya iki açıq quruluşlu aldehid molekulu arasında turşu və ya əsasların iştirakında aldolun- β- hidroksialdehidin və ya iki molekul ketonun iştirakı ilə β-hidroksiketonun alınması üzrə gedir. Aldol-kroton kondensləşməsi reaksiyası ilk dəfə 1872-ci ildə fransız kimyaçısı Ş.Vürs və A.Borodin tərəfindən aparılmışdır. Dissertasiya işində yalnız A.Borodinin elmi, ədəbi, bədii, musiqi və ictimai fəaliyyətinə toxunmuşuq.




Aldol kondensləşməsi reaksiyası karbonil qrupuna başqa karbonilli molekulun enol formasında birləşməsini təmin edir, yəni bu reaksiya iki karbonilli molekulun - aldehidin bir molekula birləşdirilməsi reaksiyasıdır və bu proses üzvi sintezin çox vacib reaksiyalarından biridir. Bu reaksiya təbii birləşmələrin sintezi üçün, həm də bioloji sistemlərdə gedən proseslər üçün çox əhəmiyyətlidir (Hüseynov, Rəcəbova, 2024; 8; 9).




Bu reaksiyada karbonil qrupu enollaşmış formadadır və metilen komponenti şəklindədir, yəni sadə dildə desək, birləşmə aldehiddir. Aldol kondensləşməsi karbonil qrupu ilə metilen komponenti arasında turşu və əsas iştirakında baş verir. Turşu katalizatorları, məs., sulfat, xlorid, toluolsulfoturşular, Brenstend-Louri və Lyuis turşuları karbonili aktivləşdirərək keto-enol çevrilməni təmin edir.

***A.Borodinin musiqi dünyası.*** O, kimya ilə yanaşı professional musiqi ilə məşğul olur, fleytada, fortepianoda və violençeldə gözəl ifa edirdi. 9 yaşında fortepianoda 4 əllə ifa üçün ilk əsərini "Elena"-rəqsini bəstələyir, 14 yaşında isə kamera ansamblı üçün əsərlər yazmağa cəhd edir. Musiqi gənc Aleksandrın qəlbini ovsunlamış və o musiqi ilə çox ciddi məşğul olmağa başlamışdır. Kimya müəllimi N.Zinin bir dəfə onu möhkəm danlayaraq deyir ki, cavan oğlan, mənim sənə kimyada böyük ümidlərim var, onları yerə vurma (Mendeleyev, 1947).

1850-ci illərdə artıq çoxlu romansları və fortepiano pyesləri ilə bir çox musiqi bilicilərinin diqqətini cəlb edə bilmiş və 1862-ci ildə onun M.Balakirevlə tanışlığı alimin musiqi kariyerasında önəmli rol oynamışdır.

Ömrünün sonuna yaxın böyük alim kimyadan bir qədər aralanmış, bütün gücünü musiqiyə vermişdir. Birinci simfoniyanın uğurundan fərəhlənən alim - bəstəkarın beynində “İqor polku haqqında dastan” əfsanəsini musiqiyə çevirmək planı formalaşır və eyni zamanda iki opera əsərini- “Knyaz İqor” və “Rusiya” əsərlərini yazmağa başlayır. Lakin zaman bəzən çox amansız olur və zalım ölüm ona bu gözəl işləri tamamlamağa imkan vermir. Beləliklə, 1887-ci ildə bəstəkarın şah əsəri hesab edilən “Knyaz İqor” operası onun ölümündən sonra bəstəkarlar N.Rimski- Korsakov və A.Qlazunov tərəfindən müvəffəqiyyətlə tamamlanaraq tamaşaya qoyulmuşdur (Mendeleyev, 1947).

**Nobel və partlayıcılar sənayesi**. Daha çox messenat kimi tanınan, qliserinin, sellüloza və toluolun mövcud kimyəvi xüsusiyyətlərindən ustalıqla bəhrələnməyi bacaran Beynəlxalq “Nobel” fondunun təsisçisi, kəşflərin əhəmiyyətini çox tez dəyərləndirə və qiymətləndirə bilən A.Nobel də partlayıcı maddələrlə çox yaxından maraqlanmış və öz diqqətini bu kəşfə yönəltməsi ilə qara barıtı nitroqliserin ilə qarışdıraraq təkana qarşı davamlı, yalnız xüsusi fitilin köməyi ilə partlayan maddəni- dinamiti almağa və tezliklə bütün dünyada dinamit sənayesi imperiyasını qurmağa müvəffəq olmuşdur (Xəlilov, 1982).

A.Nobelin yeni texnologiyaya əsaslanan partlayıcı sənayesini inkişaf etdirməsi, o dövrün hərbçilərinin, inşaatçılarının, mədənçilərinin həddən çox aktivləşməsinə gətirib çıxarmış və o, buna görə də bu istiqamətdə tədqiqatlarını genişləndirmişdir. Patlayıcılar sənayesində zavodlarda və daşınmalar zamanı baş verən çoxsaylı partlayışlar və tələfatlar onu daha təhlükəsiz istifadə edilə biləcək partlayıcıların alınması üzrə yeni tədqiqatların aparılmasına, mövcud tədqiqatları isə genişləndirməyə sövq edir (Hüseynov, Rəcəbova, 2023; Al'dol'naya kondensatsiya | Organicheskaya khimiya; 11).

A.Nobel 1862-ci ildə nitroqliserinlə təcrübələr aparmış, ilk partlayışlarını həyata keçirmiş, 1863-cü ildə öz partladıcısını- "Nobel alışqanı" adlandırdığı partladıcısını kəşf edərək onun üçün İsveç patenti almış, öz ixtirasını tətbiq edərək Helenburqda kiçik nitroqliserin istehsal zavodu təsis etmişdir. Lakin nitroqliserinlə işləmək çox çətin və təhlükəli olduğundan 1864-cü ildə Alfredin qurduğu zavodun partlamasına, bir sıra insanların, o cümlədən kiçik qardaşı Emilin həlak olmasına baxmayaraq A.Nobel gücünü, ağlı və iradəsini ortaya qoyaraq tədqiqatlarını davam etdirmiş, cəmi 1 ay ərzində nitroqliserin istehsal edən yeni zavodlar təsis etmişdir.

1866-cı ildə təsadüfən nitroqliserin tutumunun zədələnməsi nəticəsində nitroqliserinin sexin döşəməsinə axıb tökülməsi baş verdi. Sexin döşəməsi gizelqur adlanan qum təbəqəsi ilə örtülmüşdü və burada nitroqliserinin axıntısı ilə hər hansı bir partlayış baş vermədi. Çünki gizelqur uduculuq qabiliyyəti çox yüksək olan yaxşı adsorbent olduğundan onun üzərinə tökülən nitroqliserini tamamilə uda bilmişdi. Bu səbəbdən də sexdə partlayış baş verməmişdi. Bu hadisəni təsadüfən müşahidə edən A.Nobel dərhal yeni bir kəşfə imza atmağı bacardı. Gizelqurun-gilin adsorbsiya qabiliyyətini müəyyən edərək onun öz kütləsindən üç dəfə çox miqdarda nitroqliserini udmasını görən A.Nobel bu miqdarda nitroqliserinin təhlükəsiz olduğunu, onu gizelqurda yerləşdirməyin mümkün və təhlükəsiz olması ideyasını irəli sürdü və bununla da partlayıcı maddələr istehsalında yeni eranın- dinamit erasının əsasını qoymuş olur (Hüseynov, Rəcəbova, 2023; Al'dol'naya kondensatsiya | Organicheskaya khimiya; 11).

Onun usanmadan, ruhdan düşmədən apardığı davamlı tədqiqatlar bəhrəsini verir və 1867-ci ildə Alfred yeni və idarəsi daha təhlükəsiz olan dinamit ixtira edir. Bu fikirləri eşidən təhsilalanlar tədqiqatçılığın nə demək olduğunu anlayır, elmin və iradənin gücü ilə həyatda hər şeyə nail olmağın mümkünlüyünü dərk edirlər. Bunları nəzərə alaraq deyə bilərik ki, keçilən mövzunun həqiqətən A.Nobelin fəaliyyəti üzərində qurulması tədrisdə öz bəhrəsini verə bilər (Hüseynov, Rəcəbova, 2023).

Gizelgurda yerləşdirilmiş partlayıcı maddəni dinamit adlandıran və bu tərkibə onun partlayış təhlükəsini azaldan bəzi duzların əlavə edilməsinin vacib olmasını tədqiq edən A.Nobel partlayıcının yalnız xüsusi partlayıcılar vasitəsilə partlatmağın mümkün olmasını müəyyən edir. A.Nobel 1875-ci ildə nitrosellülozanı nitroqliserində həll edərək jelatinə bənzər "guruldayıcı həlməşik” kimi maddənin müxtəlif maddələrlə qarışdırılaraq tüstüsüz barıt- "ballistit” almağa müvəffəq olur və 1888-ci ildə kəşfini patentləşdirməsi ilə çoxlu sayda dinamit zavodları quraraq qısa müddət ərzində dinamit istehsalı üzrə dünya bazarında monopolist bir fiqura çevrilir (Al'dol'naya kondensatsiya |

Organicheskaya khimiya; 11).

A.Nobel partlayıcı maddələrin yalnız canlıların həyatlarını məhv etməyə yönəlmiş hərbi sənaye məhsulu kimi bir kimyəvi maddə olmayıb, həm də insanlara yaxşı mənada xidmət edən xüsusi hallarda - çətin keçilən yerlərdə tunellərin salınmasında, yol çəkilməsi zamanı dağ süxurlarının partladılmasında, qızıl, gümüş, müxtəlif metal yataqlarının açıq üsulla istismarı zamanı partlayış işlərində, köhnəlmiş, ömrünü başa vurmuş, qəza vəziyyətli hündür mərtəbəli obyekt və binaların bir anda partlayışla yox edilməsində yaxşı, xeyirxah məqsədlər kimi də tətbiq edilə bilməsini vurğulayır, dinc məqsədlər üçün yaratdığını qeyd edirdi (Al'dol'naya kondensatsiya | Organicheskaya khimiya).

## Nəticə

Ölkəmizin müasir təhsil ocaqlarında təhsilalanlar kimyadan mükəmməl biliklər almaqla yanaşı həm də məntiq və təfəkkür formalaşmasına imkan verən bir sıra vacib tətbiqi biliklər əldə edirlər. Tətbiq etdiyimiz bu tədris üsulu vasitəsi ilə onlar bəzi alimlərin kimyadan başqa digər məşğuliyyətlərinin də olmasını görürlər. Məs., M.Lomonosovun şairliyi, rəssamlığı, ictimai fəaliyyəti, A.Borodinin professional musiqiçiliyi, bəstəkarlığı, A.Nobelin sənayeçi, texnoloq, maliyyəçi keyfiyyətlərinə malik olması göstərir ki, istedadı, qabiliyyəti olan hər kəs öz əsas ixtisası ilə yanaşı başqa sahələrdə də uğur qazana bilər.

Bununla da, təhsilalanlar bu örnəklər üzərindən dərk edirlər ki, onlar kimyanı gözəl bilməklə, yaxşı kimyaçı mütəxəssis olmaqla, eyni zamanda ürəklərində möhkəm kök salmış romantik hisslərin- şairlik, rəssamlıq, yazıçılıq və s. arzularını da kimya ilə paralel olaraq həyata keçirə bilmələri mümkündür. Çünki bu cür tədris üsulunda onların tanış olduqları tarixi şəxsiyyətlər bir örnək, nümunə olaraq gözləri qarşısındadır, kumirlərinin həyatı onlar üçün çox əla bir nümunədir.

## Ədəbiyyat


1. Hüseynov, İ. Ş., Rəcəbova, Ş. R. (2023). "Üzvi kimyada nitrobirləşmələr"in tədrisində A.Nobelin Elmi, sənaye-texnoloji irsindən istifadə". AEM. *Elmi İş Beynəlxalq Elmi Jurnal*. İmpakt Faktor: 0.864. Elmi Araşdırmalar. *VII Respublika Elmi Qaynaqlar Tezislər Toplusu*. e-ISSN: 2789-6919, DOI: https://doi.org/10.36719/2023/VII. Bakı, 21.12.2023
2. Hüseynov, İ. Ş., Rəcəbova, Ş. R. (2024). "Üzvi kimyada "doymuş alifatik Aldehidlər və ketonlar"ın tədrisində A.Borodinin elmi və mədəni yaradıcılığından istifadə" AEM ELMİ İŞ. Beynəlxalq Elmi Konfrans. İmpakt Faktor: 0.864. Elmi Araşdırmalar. *XXI Beynəlxalq Elmi Konfrans*. Bakı, 07.11.2024
3. Xəlilov, Ə. N. (1982). *Əsrin böyük kəşfləri*. Bakı: "Azərnəşr".
4. Xəlilov, Ə. N., Əhlimanov, A. (1986). Kimyanın tədrisində şagirdlərin görkəmli alimlərin həyat və yaradıcılığı ilə tanış edilməsi. *Kimya və biologiya tədrisi (metodik məcmuə)*, № 2. Bakı.
5. Volkov, V. A., Vonskiy, Ye. V., Kuznetsova, G. I. (1991). «*Vydayushchiyesya khimiki Mira*». – Moskva, Izd. VSH, 656.
6. Garkunov, V. P. (1984). *Metodika prepodavaniya khimii». Uchebnoye posobiye dlya studentov pedagogicheskikh institutov po khimicheskim i biologicheskim cpetsial'nostyam*. Moskva. "Prosveshcheniye".
7. Mendeleyev, D. I. (1947). «*Osnovy khimii*», t-2, izd. «Mir», Leningrad.
8. Wikipedia https://az.wikipedia.org › wiki › Aleksandr_Borodin
9. orgchem@avchem.ru http://orgchem.avchem.ru › a... ALDOL.KONDEN.
10. Al'dol'naya kondensatsiya | Organicheskaya khimiya - avchem.ru orgchem@avchem.ru http://orgchem.avchem.ru › a...
11. Wikipedia https://en.wikipedia.org › wiki Alfred Nobel.
12. Nobel Prize Internet Archive. Nobel Prize https://www.nobelprize.org › Alfred Nobel Archive - NobelPrize.org

DOI: https://doi.org/10.36719/2663-4619/113/178-183

**Fain Mövlanov**
Azərbaycan Dövlət İqtisad Universiteti
magistrant
https://orcid.org/0009-0003-3028-9677
fain.movlanov@mail.ru

# Müasir mağazalarda satış sahəsinin planlaşdırılmasının nəzəri əsasları

**Xülasə**

Müasir mağazalarda satış sahəsinin planlaşdırılması, coğrafi bölgələr üzrə satış resurslarının optimal paylanması ilə gəliri və bazarı əhatə etməyi maksimum dərəcədə artırmağı hədəfləyən strateji bir prosesdir. Bu planlaşdırma prosesi satış mütəxəssislərinə effektiv yanaşmalar və strategiyalar təqdim edərək, daha effektiv iş aparmağa və nəticələri yaxşılaşdırmağa imkan verir. Satış sahəsinin planlaşdırılması bir çox amili nəzərə alaraq həyata keçirilir, məsələn, bazar imkanları, coğrafi ərazi, müştəri tələbi və gəlirlilik tarixi məlumatlar. Müasir dövrdə mağaza planlaması həmçinin qabaqcıl texnologiyalar və dizayn strategiyalarını əhatə edir. Satış sahələrində tətbiq edilən innovasiyalar arasında təcrübəli pərakəndə satış yerləri, ağıllı texnologiyaların inteqrasiyası və mağazadaxili mağaza anlayışları yer alır. Bu yanaşmalar pərakəndə satışın gəlirliliyini artırmağa yönəlmiş müxtəlif nəzəri çərçivələrdən faydalanır. Bunlara dinamik imkanlar çərçivəsi, inovasiya nəzəriyyəsi, pərakəndə həyat dövrü nəzəriyyəsi, altı qüvvə modeli nəzəriyyəsi, bazar strategiyasının mənfəət təsiri (PIMS) və Delta modeli nəzəriyyəsi daxildir. Bu nəzəriyyələr pərakəndə satış strateqiyasının təkmilləşdirilməsi və müştəri mərkəzli yanaşmaların inkişafı üçün əhəmiyyətli rol oynayır.

***Açar sözlər:*** *satış sahəsinin planlaşdırılması, satış strategiyaları, satış performansı, rəqəmsal ticarət, innovasiya nəzəriyyəsi, bazar strategiyası*

**Fain Movlanov**
Azerbaijan State University of Economics
Master student
https://orcid.org/0009-0003-3028-9677
fain.movlanov@mail.ru

# Theoretical Foundations of Sales Area Planning in Modern Stores

**Abstract**

The planning of sales areas in modern stores is a strategic process aimed at maximizing revenue and market coverage by optimally distributing sales resources across geographical regions. This planning process provides sales professionals with effective approaches and strategies, enabling them to work more efficiently and improve results. Sales area planning takes into account various factors such as market opportunities, geographical territory, customer demand, and profitability historical data. In the modern era, store planning also incorporates advanced technologies and design strategies. Innovations applied in sales areas include experienced retail locations, the integration of smart technologies, and the concept of in-store shops. These approaches leverage various theoretical frameworks aimed at enhancing retail profitability. These include the dynamic capabilities framework, innovation theory, retail life cycle theory, the six forces model theory, profit impact of market strategies (PIMS), and the Delta model theory. These theories play a significant role in the improvement of retail strategies and the development of customer-centric approaches.

***Keywords:*** *sales area planning, sales strategies, sales performance, digital commerce, innovation theory, market strategy*

## Giriş

Satış sahəsinin planlaşdırılması prosesi müxtəlif coğrafi regionlar üzrə satış resurslarının optimal paylanmasını müəyyən etməklə gəliri və bazarı əhatə etməyi maksimum dərəcədə artırmaq məqsədi daşıyan strateji təşəbbüsdür. Satış planı satış mütəxəssislərinə hansı perspektivləri izləməli olduqlarını və kimlərin onları həyata keçirə biləcəyini müəyyən etməyə kömək etmək üçün təlimatlar və strategiyalar təqdim edir. Bu, satış işçilərinə səylərini daha effektiv şəkildə cəmləşdirməyə və yanaşmalarını ixtisaslaşdırmağa imkan verir (Acuaviva Huertos, Pérez Garbín, Díaz-Agudo, Sánchez-Ruiz, 2021).

Satış sahəsi bir qrup və ya satış şöbələri qrupu üzrə təyin edilmiş istehlak bazarının xüsusi seqmentidir. Satış sahələri adətən coğrafiyaya görə təsnif edilir. Lakin satış sahələri həmçinin hesab ölçüsü, sənaye və ya satılan məhsul və ya xidmətə görə də təsnif edilə bilər. Satış sahəsini planlaşdırarkən bazar imkanları nəzərə alınmalıdır. Ərazi bölmələri və təyinatları istehlakçı tələbi və gəlirlilik haqqında tarixi məlumatlara da əsaslana bilər. Məsələn, son üç il ərzində Sakit Okeanın Şimal-Qərb bölgəsindəki pərakəndə alıcıların qida məhsullarına Midwestdəkilərdən daha çox tələbatı ola bilər, buna görə də bu daha gəlirli bölgəni dəstəkləmək üçün daha çox satış işçisi təyin oluna bilər. Ola bilsin ki, şirkət bu boşluğu bir fürsət kimi görür. Bu qərarlar satış sahəsinin planlaşdırılmasının daha geniş biznes məqsədləri və strategiyaları ilə kəsişməsini tələb edir. Təşkilatlar satış sahələri yaratmaq və daha sonra ən effektiv yanaşmanı müəyyən etmək üçün nəticələri ölçmək məqsədiylə yeni məlumatların təhlilini tələb edir (Gazzola, Grechi, Martinelli, Pezzetti, 2022).

**Tədqiqat**

Satış sahəsinin planlaşdırılmasına vahid yanaşma olmasa da, daha təcrübəli təşkilatların planlaşdırma prosesində izlədiyi bir neçə addım və yaxşı təcrübələr var. Bunlar;

a) Seqmentləşdirmə: Satış gəlirlərini artırmaq və mövcud hesabları saxlamaq üçün yüksək gəlirli müştəri kateqoriyalarını və perspektivləri müəyyən etmək;

b) Model bazar ssenariləri: Hesablanmış nisbi hesab dəyəri və tənzimləmə seçimlərindən istifadə edərək ümumi bazar gəlirini nəzərə almaq;

c) Satış əhatəsinin planlaşdırılması: Satış işçiləri optimal xidməti effektiv şəkildə təqdim edərkən hesab tapşırıqlarının nisbətini nəzərdən keçirmək;

d) Ərazi bölgüsü: Məkan, hesablar, məhsullar, satış potensialı və istənilən sayda digər amillər əsasında satış sahələrini müəyyənləşdirmək;

e) Ərazi təyinatı: Satış nümayəndələrini ən uyğun və ən yüksək gəlir potensialına əsaslanan ərazilərlə əlaqələndirmək;

f) Satış performansının təhlili: Müəyyən bir müddət ərzində satış tərəqqisini ölçmək lazımdır. Bu təhlil komandalara satış strategiyasının zəif tərəflərini müəyyən etməyə və növbəti dövrdə nəticələri yaxşılaşdırmaq üçün dəyişikliklər etməyə imkan verir.

Müasir dövrdə mağaza planlaması müştəri təcrübəsinin keyfiyyətini və biznes əməliyyatlarının effektivliyini artırmaq üçün qabaqcıl texnologiyalar və dizayn strategiyalarını özündə birləşdirərək əhəmiyyətli dəyişikliklərə məruz qalmışdır. Mağaza planlaşdırılmasında tətbiq edilən müasir innovasiyalar (Yılmaz, Tokman, 2022):

1. Təcrübəli pərakəndə satış yerləri

Rəqəmsal ticarətin artmasına baxmayaraq, pərakəndə satış yerləri hələ də öz aktuallığını qorumaqdadır. Bir çox pərakəndə satıcının qəbul etdiyi ən mühüm innovativ strategiyalardan biri "click and mortar" anlayışıdır. Bu strategiyadan istifadə edərək, yalnız onlayn mövcud olan bizneslər öz təkliflərini vermək üçün fiziki mağazalar açırlar. Bu, onlara onlayn alış-verişin üstünlüklərini fiziki mağazada alış-verişin daha real təcrübəsi ilə birləşdirməyə imkan verir.

Nümunə olaraq, "La Redoute Intérieurs" adlı ev əşyaları satan mağaza müştərilərə onlarla alış-veriş etməzdən əvvəl veb saytında mövcud olan məhsulları fiziki olaraq yoxlamaq və onlara toxunmaq imkanı verir. Bu immersiv təcrübə müştərilərin alışlarında daha inamlı hiss etmələrinə kömək edir və onlara etibar yaradır (Christensen, 2013).

2. Ağıllı texnologiyaların inteqrasiyası

Ağıllı texnologiyaların qəbul edilməsi mağaza əməliyyatlarında və müştərilərlə qarşılıqlı əlaqədə ciddi yeniliklərə və irəliləyişlərə səbəb olub:

- **Qrammatik dəqiqlik və nitq axıcılığı** – Sintaktik vahidlərin düzgün istifadəsi nitqin ardıcıllığını təmin edir və anlaşılmazlığı aradan qaldırır.
- **Söhbət zamanı spontan cümlə qurma bacarığı** – Dil öyrənənlər müxtəlif sintaktik modelləri mənimsədikdə, ünsiyyət zamanı daha az tərəddüd edir və sürətli cümlə qurma qabiliyyətinə sahib olurlar (Hüseynzadə, 2018).
- **Sosial və rəsmi ünsiyyətdə nitq etiketi** – Fərqli sintaktik formalar rəsmi və qeyri-rəsmi ünsiyyət şəraitinə uyğun ifadə tərzini müəyyənləşdirir.

Məsələn, rəsmi danışıqda daha çox mürəkkəb və tabeli cümlələrdən, qeyri-rəsmi danışıqda isə sadə və qısa sintaktik strukturlardan istifadə edilir. Bu da nitqin kontekstə uyğun tənzimlənməsinə kömək edir.

**3. Sintaksisin Semantikaya və Ünsiyyət Strategiyalarına Təsiri**

Sintaktik elementlər təkcə qrammatik quruluş deyil, həm də **fikrin semantik mənasını dəyişdirən vasitədir**. Müxtəlif cümlə strukturlarının istifadəsi **məna çalarlarını, vurğulanan fikri və kommunikativ məqsədi dəyişdirə bilər**:

- **Məlumatın düzgün ötürülməsi** – Cümlə quruluşu ifadənin mənasını dəyişdirə bilər. Məsələn, "O, müəllim olmaq istəyir" ilə "Müəllim olmaq istəyən odur" cümlələri eyni sözlərdən ibarət olsa da, vurğu və məna baxımından fərqlidir.
- **Emosional və məntiqi vurğular** – Cümlə strukturunun dəyişməsi mətnin emosional çalarını da formalaşdıra bilər (Məmmədov, 2019).
- **Nitq strategiyalarının təkmilləşdirilməsi** – Müxtəlif cümlə tiplərinin öyrənilməsi öyrənənlərə ünsiyyət zamanı uyğun ifadə formalarını seçməkdə kömək edir.

Məsələn, **inversiya, ellips və paralel konstruksiyalar** kimi sintaktik üsullar yazı və nitqin daha təsirli olmasına səbəb olur.

## Nəticə

Sintaktik elementlər dil öyrənənlərin yazılı və şifahi ifadə bacarıqlarını inkişaf etdirməklə onların ünsiyyət effektivliyini artırır. Müxtəlif sintaktik quruluşları mənimsəyən tələbələr fikirlərini daha dəqiq, ardıcıl və məntiqli ifadə edə bilir, həmçinin ünsiyyət zamanı spontan danışıq bacarıqlarını inkişaf etdirirlər. Dilin tədrisində sintaktik elementlərin funksional aspektləri vurğulandıqda, öyrənənlər dili daha dərin və səmərəli şəkildə mənimsəyə bilirlər.

## Ədəbiyyat

1. Axundov, A. (1988). *Dilçilikdə üslubiyyat məsələləri*. Bakı: Elm, 45-60.
2. Cəfərli, B. (2010). *Azərbaycan dilinin tədrisi metodikası*. Bakı: Təhsil.
3. Əliyev, H. (2019). *Sintaktik quruluşların nitqdə rolu*. Bakı: Elm və təhsil.
4. Hüseynzadə, A. (2018). *Müasir tədris metodları və Azərbaycan dili sintaksisi*. Bakı: Elm.
5. Məmmədli, A. (2014). *Dil tədrisində sintaktik elementlərin əhəmiyyəti*. Bakı: Nurlar.
6. Məmmədova, Ş. (2021). *Akademik yazıda sintaksisin funksional rolu*. Bakı: Təhsil.
7. Məmmədov, Ə. (2019). *Dilçilikdə metodik yanaşmalar*. Bakı: Nurlar.
8. Qasımov, R. (2018). *Dil tədrisində kommunikativ yanaşmalar*. Gəncə: Elm və İnkişaf.
9. Sadıqova, L. (2017). *İkinci dil öyrənənlər üçün qrammatik uyğunlaşmalar*. Bakı: Azərnəşr.

ISSN: 2663-4619
e-ISSN: 2708-986X

DOI: https://doi.org/10.36719/2663-4619/113/207-211

**Reyhanə Səfərova**
Bakı, Azərbaycan
https://orcid.org/0009-0006-5168-5216
safarovareyhane@gmail.com

# Sultan I Səlimin Səfəvi siyasəti: Osmanlı imperiyasının şərq strategiyası

**Xülasə**

XVI əsrin əvvəllərində Osmanlı və Səfəvi dövlətləri arasındakı siyasi və dini mübarizə daha da gərginləşmiş, bu da hər iki dövlətin daxili və xarici siyasətinə ciddi təsir göstərmişdir. Səfəvilərin şiəliyi rəsmi məzhəb kimi qəbul edərək, Anadoluda mürid toplaması Osmanlı dövlətinin vahid dini və siyasi ideologiyasına təhlükə yaratmışdır. Sultan I Səlim hakimiyyətə gəldikdən sonra Səfəvilərin Anadoludakı təsirini azaltmaq və Osmanlı dövlətinin sünni İslam məzhəbini qorumaq üçün sərt tədbirlər görmüşdür. Sultan I Səlimin bu siyasətinin ən əhəmiyyətli nəticələrindən biri 1514-cü ildə baş verən Çaldıran döyüşü olmuşdur. Osmanlı ordusu top və atəşli silahlardan istifadə etməklə Səfəvi qüvvələrini məğlub etmiş, nəticədə Osmanlı dövlətinin şərq sərhədləri möhkəmlənmişdir. Osmanlı ordusu Təbrizi qısa müddətlik nəzarəti altına alsa da, strateji səbəblərdən geri çəkilməli olmuşdular. Amma Osmanlı dövlətinin bu qələbəsi Səfəvilərin Anadoludakı təsirini əhəmiyyətli dərəcədə zəiflətmişdir. Məqalədə I Səlimin Səfəvilərə qarşı apardığı mübarizənin həm hərbi, həm də ideoloji tərəfləri qeyd edilmişdir. Sultan I Səlimin yürütdüyü sərt siyasət Osmanlı-Səfəvi münaqişəsinin dərinləşərək XVII əsrə qədər davam etməsinə səbəb olmuşdur.

***Açar sözlər:*** *Osmanlı dövləti, Səfəvilər dövləti, Şah I İsmayıl, Sultan I Səlim, Çaldıran döyüşü*

**Reyhana Safarova**
Baku, Azerbaijan
https://orcid.org/0009-0006-5168-5216
safarovareyhane@gmail.com

# The Safavid Policy of Sultan Selim I: The Eastern Strategy of the Ottoman Empire

**Abstract**

At the beginning of the 16th century, the political and religious struggle between the Ottoman and Safavid states intensified, which seriously affected the domestic and foreign policies of both states. The Safavids' adoption of Shiism as an official sect and the gathering of followers in Anatolia posed a threat to the unified religious and political ideology of the Ottoman state. After Sultan Selim I came to power, he took strict measures to reduce the influence of the Safavids in Anatolia and to protect the Sunni Islamic sect of the Ottoman state. One of the most important results of this policy of Sultan Selim I was the Battle of Çaldıran in 1514. The Ottoman army defeated the Safavid forces using artillery and firearms, and as a result, the eastern borders of the Ottoman state were strengthened. Although the Ottoman army briefly took control of Tabriz, they had to retreat for strategic reasons. However, this victory of the Ottoman state significantly weakened the influence of the Safavids in Anatolia. The article highlights both the military and ideological aspects of Selim I's struggle against the Safavids. The harsh policy pursued by Sultan Selim I led to the deepening of the Ottoman-Safavid conflict, which continued until the 17th century.

***Keywords:*** *Ottoman state, Safavid state, Shah Ismail I, Sultan Selim I, Battle of Chaldiran*

## Giriş

Osmanlı-Səfəvi münasibətləri XVI əsrin əvvəllərində Yaxın Şərqdə siyasi hadisələrin gedişatına ciddi təsir göstərən əhəmiyyətli amillərdən biri olmuşdur. Şah I İsmayıl Səfəvi dövlətini 1501-ci ildə

yaratdıqdan sonra şiəliyi rəsmi məzhəb elan etmiş və geniş ərazilərdə nüfuz qazanmağa başlamışdır. Bu nüfuz, həm dini, həm də siyasi yöndən Osmanlı dövləti üçün təhlükə yaratmışdı. Çünki, Səfəvilər Anadoludakı Qızılbaşlar vasitəsilə Osmanlı torpaqlarında mövqelərini gücləndirirdilər.

Sultan I Səlimin taxta çıxması ilə Osmanlı-Səfəvi münasibətləri daha da gərginləşmişdir. Sultanın əsas məqsədi Səfəvilərin Anadoluda yaydığı təsiri zəiflətmək və dövlətin şərq sərhədlərini möhkəmləndirmək olmuşdur. Bundan əlavə, o, sünni İslamın qoruyucusu kimi çıxış edərək Səfəvilərin dini nüfuzunu sarsıtmağa çalışmışdır. Bu məqsədlə, Sultan I Səlim əvvəlcə daxildə Qızılbaşlara qarşı sərt tədbirlər görmüş, sonra isə Səfəvilər dövləti ilə açıq müharibəyə girmişdir. Səfəvi və Osmanlı dövləti arasında 1514-cü ildə baş verən Çaldıran döyüşü bu siyasətin ən mühüm nəticələrindən biri olmuşdur. Bu döyüş Osmanlılar üçün böyük qələbə ilə nəticələnsə də, Səfəvilərlə uzunmüddətli münaqişənin başlanğıcı kimi tarixə düşmüşdür.

**Tədqiqat**

Osmanlı Sultanı II Bəyazid (1481–1512) və Səfəvi hökmdarı Şah I İsmayıl (1501–1524) arasındakı münasibətlər Osmanlı-Səfəvi mübarizəsinin ilkin mərhələsini təşkil edir. Bu dövr Osmanlı və Səfəvi dövlətləri arasındakı münasibətlərdə diplomatik gərginliyin artdığı, lakin hələ açıq müharibəyə çevrilmədiyi bir mərhələ olaraq tarixə keçmişdir. Sultan II Bəyazidin hakimiyyəti dövründə Osmanlı dövləti başlıca olaraq daxili sabitliyi qorumağa və Avropadakı Macarıstan, Venesiya və Məmlük dövlətləri ilə olan münasibətlərə diqqət yetirirdi. Digər tərəfdən, Şah I İsmayıl Səfəvi dövlətinin əsasını qoyaraq şiə məzhəbini rəsmi ideologiya kimi qəbul etmiş və Osmanlı torpaqlarında, əsasən də Anadoluda nüfuzunu artıraraq tərəfdarlar toplamağa başlamışdı. Bu isə Osmanlı hakimiyyəti üçün ciddi təhlükə kimi dəyərləndirilmişdir. Şah I İsmayılın Anadoluda tərəfdar toplayaraq Osmanlı dövlətinə qarşı siyasi və dini təsirini artırması Sultan II Bəyazidin hakimiyyəti üçün ciddi problem idi. Osmanlı dövlətinin əsas dayağı olan sünni məzhəbinə qarşı Səfəvilərin şiə təbliğatı dövlətin daxilində parçalanma təhlükəsinə səbəb olmuşdu. Buna baxmayaraq, Sultan II Bəyazid Şah I İsmayılla açıq müharibəyə girməkdən qaçınmış, daha çox diplomatik tədbirlərə üstünlük vermişdir.

Sultan II Bəyazidin hakimiyyətinin son dövründə Anadoluda rüşvət və zülm artmış, vergilərin toplanmasında çoxlu qanunsuzluqlar yaranmışdı. Bu səbəbdən də köçəri türkmən dəstələri və yoxsul kəndlilər bir araya toplanıb, 1511-ci ildə Şah I İsmayılın dəstəyi ilə Şahqulunun başçılğı altında üsyana başlamışdılar. Bu üsyan Osmanlı dövləti tərəfindən qəti şəkildə yatırılmış, uğursuzluğa düçar olan türkmənlər isə Osmanlı tərəfindən cəzalandırılmamaq üçün Şah I İsmayıla sığınmışdılar (Artan, 2019, s. 285, 312).

Eyni zamanda Şah I İsmayılın Osmanlı dövlətindəki hakimiyyət uğrunda mübarizəyə və dövlətin daxili işlərinə qarışması da, iki dövlət arasındakı münaqişənin əsasını hazırlamışdı. Atasının Səfəvilər dövləti ilə bağlı siyasətindən narazı olan Trabzon hakimi Şahzadə Səlim Osmanlı dövləti tərkibində Qızılbaşlığa zidd olan qüvvələrin köməyiylə 1512-ci il tarixində atasını taxtdan sala bilmişdi (Səfərli, Yusifli 2005, s. 8). O, Səfəvilərin Anadoludakı təsirinin yayılmasının qarşısını almaq üçün ciddi tədbirlərin görülməsinin lazım olduğunu başa düşmüşdü. O, Osmanlı dövlətində ilk hökmdar idi ki, Şərq məsələsini Osmanlı dövlətinin əsas problemi kimi görürdü. Bu səbəblə də, o, digər Osmanlı Sultanlarından fərqli olaraq Qərb əvəzinə Şərqə doğru yürüşə üstünlük vermişdir. Özünü Abbasilərdən sonra bütün müsəlmanların xəlifəsi olaraq görən Osmanlı Sultanı, bu düşüncəsini həyata keçirmək üçün Səfəvilər dövlətinə qarşı hücuma keçmək qərarına gəlmişdi. Bu məqsədlə də, Sultan I Səlim taxta çıxan kimi I Şah İsmayıla təhdidkar bir məktub göndərmişdi.

Onun Səfəvilərə müharibə elan etməsinin ən ciddi səbəblərindən biri də din məsələsi idi. O, hakimiyyətə gəldikdən sonra Osmanlı dövlətindəki "dinsiz, kafir" adlandırdığı qırx mindən çox şiə Qızılbaşı siyahıya aldırıb, işgəncə ilə qətlə yetirmişdi (İnalcık, 2014, s. 186).

O, Səfəvilərə qarşı hərbi əməliyyatlarını qanuniləşdirmək üçün Ədirnədə şura toplamış və Qızılbaşların onların qətlinə dair fitvalar almışdı. Fitvalarda Şah I İsmayıl və onun tərəfdarlarına qarşı aparılan müahribələr Osmanlı dövləti üçün cihad kimi hesab edilmişdi (Səfərli, Yusifli, 2005, s. 9).

Türkiyə tarixçilərinə görə, Səfəvi-Osmanlı münasibətlərini gərginləşdirən digər bir səbəb, Sultan I Səlimin qardaşı oğlu Şahzadə Muradın Şah I İsmayılıa sığınması idi. Sultan I Səlim Şahzadə Muradı və Diyarbəkiri tələb etdiyi bir məktubu elçi vasitəsiylə Səfəvilər sarayına göndərmişdi. Səfəvi şahı isə göndərdiyi cavab məktubunda, Şahzadə Muradın qonaq olduğunu və buna görə də qonağını təslim

etməyəcəyini bildirmişdi. Səfəvi şahı məktubunda, Diyarbəkiri fəth yolu ilə aldığını və buranın yalnız hərb yolu ilə geri alına biləcəyini vurğulamışdı. Sultan I Səlimin Diyarbəkrlə bağlı olan iddiaları Səfəvilərə qarşı hərbi yürüşə başlamaq üçün bir bəhanə rolunu oynamışdır. O, yeniçərilər qarşısında çıxış edərək Şah I İsmayılın şeyxlikdən şahlığa keçdiyin və hakimiyyətinin qeyri-qanuni olduğunu bildirmişdi.

Sultan I Səlim, Səfəvilər dövlətinə qarşı yürüşə başlamamışdan əvvəl Qərbdəki həbi əməliyyatları dayandırmış və Şeybani Ubeydulla xana Səfəvilər dövlətinə qarşı müttəfiqliq təklifi etdiyi bir məktub göndərmişdi. Onun digər bir tədbiri isə Anadoludan ticari malın yanında savaş alətləri, gümüş və dəmir kimi məmulatların Səfəvi dövlətinə daşınmasının qarşısını almaq idi. O, sərhədlərdəki keçid məntəqələrində nəzarəti gücləndirməklə, Anadoludan Şah I İsmayıla gedən maddi yardımlara qismən mane olmuşdu (Dədəyev, 2009, s. 131).

Səfəvilər dövlətinin yaranması ilə XVI əsrin əvvəllərində Avropa dövlətləri və Səfəvilər dövlətinin iştirakı ilə Osmanlı dövlətinə qarşı ittifaqların əsası qoyulmuşdu. Səfəvilər dövləti həm Osmanlı təhlükəsi, həm də ticarət maraqlar üçün Venesiya Respublikası ilə sona qədər davam edən diplomatik, mədəni, ticarət əlaqələr yaratmışdır (Guliyev, s. 3).

Şah I İsmayıl Çaldıran döyüşü ərəfəsində odlu silah əldə etmək üçün Portuqaliya ilə də yaxınlaşmışdı. Onun məqsədi İran körfəzi vasitəsilə Potuqaliyadan odlu silah və mütəxəssislər gətirmək idi. Bu məqsəd üçün o, Potuqaliyanın İran körfəzində möhkəmlənməsinə mane olmamışdı. Amma Portuqaliya Osmanlı-Səfəvi müharibəsində hər iki türk dövlətini zəiflətmək üçün Şah I İsmayılın ordusunu odlu silahla təmin etməmişdi.

Sultan I Səlim Ədirnə toplantısından sonra ordusunu hazır vəziyyətə gətirib, 1514-cü il 20 martda Səfəvi torpaqlarına yürüşə başladı və bunu bir məktubla Şah I İsmayıla bildirdi. Şah I İsmayılın əmri ilə Osmanlı ordusunun keçəcəyi yerlərdəki əkinlər, otlaqlar və yaşayış məskənləri məhv edilmişdi. Sultan I Səlim Ərzincanda Səfəvi şahına ikinci məktub göndərib, onu döyüşə dəvət etdi. O, bu təhqiramiz məktubla Şah I İsmayılı döyüş meydanına gətirmək istəyirdi bilirdi ki, belə böyük ordunu uzaq diyarda aylarla saxlamaq çətin məsələdir. Qarşıdan qış gəlirdi və Şah I İsmayıl əkinləri, otlaqları və yaşayış məskənlərini yandırdığı üçün bir müddət sonra ordunu təmin etmək üçün ərzaq tapılmayacaqdı. Osmanlı ordusunda narazılıqlar başlamışdı, bəzi yeniçərilər Eleşgird düzündə Sultanın çadırına güllə atmağa qədər irəliləsələr də,  Sultan I Səlimin əsgərlər qarşısında sərt, qısa və təsirli çıxışı vəziyyəti yaxşılaşdırmışdı (Türkiyə Diyanət Vəqfi İslam Ensiklopediyası, s. 193-195).

1514-cü il avqustun 23-də ildə Çaldıran düzündə iki türk dövləti qarşı-qarşıya gəldi. Osmanlı dövləti Çaldıran döyüşündə qarşı tərəflə müqayisədə həm daha çox sayda olan qoşunla, həm də texniki təchizat baxımından üstün idi. Səfəvi ordusunun isə hər hansı bir odlu silahı olmasa da, Çaldıran döyüşündə uğur qazanması üçün çox ciddi imkanları mövcud idi. Döyüşdən bir gün əvvəl keçirilən müşavirədə Diyarbəkr hakimi Məhəmməd xan Ustaclı Osmanlı qoşunları üzərində uğurun əldə edilməsi üçün bir neçə təklif irəli sürmüşdü. Bu təkliflərə qoşunların geri çəkilməsi və əlavə qüvvə toplandıqdan sonra iki ay sonra döyüşün başlanması, Osmanlı qoşunları üzərinə qəfil hücumun təşkil edilməsi və Osmanlı qoşunları üzərinə gecə hücumlarının təşkil edilməsi daxil idi. Bu təkliflərin həyata keçirilməsi Osmanlı qoşunlarını son dərəcə ağır vəziyyətə sala bilərdi. Amma həm Şah I İsmayıl, həm də müşavirənin digər üzvləri bu təkliflərlə razılaşmadılar (Süleymanov, 2018, s. 6).

Döyüş zamanı Səfəvi ordusu Osmanlı qoşunlarına qarşı güclü müqavimət göstərməyə çalışsa da, Osmanlı ordusunun atəş gücü qarşısında yavaş-yavaş dağılmağa və böyük itkilər verməyə başlamışdı. Gün ərzində davam edən döyüşün sonunda Səfəvi ordusu dağılmış, Şah I İsmayıl məcburiyyət qarşısında qalaraq döyüş meydanını tərk etmişdi. Döyüşdə Məhəmməd xan Ustaclı, Qorçubaşı Sarı Pirə, Lala Hüseyin bəy, kimi məşhur Qızılbaş sərkərdələrinin çoxu qəhrəmancasına həlak olmuşdular.

Bu döyüşdə Osmanlı ordusu da Rumeli bəylərbəyi Həsən Paşa, Sofya sancağı bəyi Malqoçoğlu Əli bəy və Silistrə sancağı bəyi Malqoçoğlu Tur Əli bəy kimi bir çox tanınmış sərkərdəsini itirmişdi (Qızılbaşlar tarixi, 1993, s. 42, 8).

Dövrün Səfəvi mənbələrinə əsasən iki min nəfər Səfəvi ordusuna, üç min nəfər isə Osmanlı ordusuna mənsub olmaqla ümumilikdə beş min əsgər həlak olmuşdu. Şərəfxan Bidlisi "Şərəfnamə" əsərində yalnız Qızılbaşların beş min nəfər itki verdiyini qeyd edir, bu həqiqətə daha yaxındır.

Osmanlı tarixçilərindən bir çoxu isə Osmanlı ordusunun 30-40 min, Qızılbaşların isə bundan 2 dəfə artıq itki verdiyini qeyd edir (Mirişli, 2021, s. 7).

Sultan I Səlim döyüşdən sonra Təbrizə daxil olmuş və Səfəvi xəzinəsini ələ keçirmişdi. O, Təbriz şəhərinin bütün əhalisini "Həsən Padşah məscidi"nə toplayaraq, Qızılbaş xətibinə sünni xütbəsi oxumasını əmr etmişdi. Təbriz alındıqdan sonra müharibəni davam etdirmək getdikcə çətinləşməyə başladığı üçün və əhali güclü müqavimət göstərdiyi üçün Osmanlı ordusu geri çəkilməyə məcbur olmuşdu. Həmçinin, Səraba çəkilmiş Şah I İsmayılın yeni ordu toplaması haqqında da xəbərlər Osmanlı ordusuna çatmışdı. Sultan I Səlim, Təbizdə doqquz gün qalıqdan sonra şəhəri tərk etdi. Osmanlı ordusu geri çəkilərkən çoxlu Təbriz ustalarını, neçə min sənətkar ailəsini, müxtəlif peşə sahiblərini özləri ilə birlikdə İstanbula apardı. İstanbula aparılan mahir Azərbaycan sənətkarları sonralar Osmanlının memarlıq və incəsənətinin inkişafında mühüm rol oynamışdılar (Aksu, 1998, s. 214).

Sultan I Səlim Qarabağda qışlamaq qərarına gəlmişdi. Onun məqsədi, qışı burada keçirib, yaz sonunda Səfəvi dövləti üzərinə planladığı əsas yürüşə keçəcəkdi. Lakin, Sultan I Səlimin vəzirləri onun bu fikiri ilə razılaşmamışdı. Bu səbəblə də o, Naxçıvan şəhərindən keçməklə Osmanlının içərisinə irəliləmək qərarına gəldi. Bu marşrutla o, ordusu üçün ərzaq əldə edə biləcəkdi. Nəticədə, Naxçıvan əhalisinin çoxu sünniliyə mənsub olduqlarını bildirmələrinə baxmayaq, Naxçıvan şəhəri Osmanlı ordusunun talanlarına məruz qaldı. Naxçıvan şəhərindən sonra İrəvan şəhəri də bu talanlara məruz qaldı. Sultan I Səlimin bu talanları etməkdə məqsədi ordudakı narazılıqların qarşısını almaq olsa da, Osmanlı ordusu bu uzaq yerlərdə müharibə etmək istəmirdi, bu səbəblə də orduda geri dönmək üçün etirazlar baş vermişdi. Sultan I Səlim ordudakı etirazlar səbəbi ilə nəhayət geri dönmək əmrini verdi və Osmanlı ordusu böyük talanlardan sonra Səfəvi torpaqlarını tərk etdi.

Osmanlı ordusunun şəhəri tərk etməsindən istifadə edən Şah I İsmayıl Təbriz şəhərinə geri qayıtmış və çox gecikmədən, Sultan I Səlim Amasyada olarkən sülh bağlamaq üçün ona məktub göndərmişdi. Lakin, Osmanlı Sultanı gələn Səfəvi elçilərini həbs etdirmişdi. Sultan I Səlim İstanbula qayıtdıqdan sonra da Şah I İsmayıl qiymətli hədiyyələrlə birlikdə elçilərini Osmanlı sarayına göndərmişdi. Sultan I Səlim bəy və paşaları ilə sülh istəyini müzakirə etmiş və sonra onun vaxt qazanmaq üçün sülh istədiyi qərarına gələrək Səfəvi elçilərini Dimetoka və Kilidbahirdə həbs etmişdi (Gündüz, 2013, s. 147).

Osmanlı dövləti Çaldıran döyüşündəki qələbə ilə Ərzurum şəhəri də daxil olmaqla Qərbi Anadolunu və Şimali Mesopotamiyanı hakimiyyəti altına almışdı. Bağdad şəhəri də daxil olmaqla Ərəb İraqı isə Səfəvilər dövlətinin hakimiyyəti altında qalmışdı.

Şərqi Anadolunu fəthi ilə, Osmanlı dövləti Anadoludan Qafqaza, Suriyə və İrana gedən mühüm strateji keçidlərini və bu ölkələrə hərbi səfərlər həyata keçirmək imkanını əldə etmişdi. Nəticədə Şərqi Anadoludan keçən Təbriz-Hələb və Təbriz-Bursa ipək yolları və Məmlük torpaqlarının ələ keçirilməsi ilə Süveyş kanalına qədər olan beynəlxalq ticarət yollarına nəzarət Osmanlı dövlətinin təsir dairəsinə keçmişdi (Əzimli, 2010, s. 106).

Çaldıran döyüşündən bir qədər sonra Diyarbəkirlilər öz itaətini Sultan I Səlimə bildirdiyi üçün Şah I İsmayıl Qara xanı Diyarbəkirə yollamışdı. Buna qarşılıq Osmanlı dövləti də öz ordusunu Diyarbəkirə göndərmişdi. Nəticədə iki türk dövləti arasında 1516-cı ildə Kızıltəpədə Koçhisarda qarşı-qarşıya gəlmiş və döyüşün nəticəsi olaraq Səfəvilər Diyarbəkir bölgəsini, Urfanın bəzi bölgələrini və Mardin ətrafındakı əraziləri itirmişdi.

## Nəticə

Sultan I Səlimin Səfəvi siyasəti Osmanlı dövlətinin şərq sərhədlərini gücləndirmiş, Anadoludakı Səfəvi təsirini əhəmiyyətli dərəcədə zəiflətmişdir. Bununla belə, bu siyasət iki dövlət arasında uzun müddət davam edəcək münaqişəyə səbəb olmuşdur. Çaldıran döyüşü Səfəvilər üçün ciddi məğlubiyyətlə nəticələnsə də, onları tamamilə zəiflədə bilməmişdir. Şah I İsmayılın döyüşdən sonra geri çəkilmə strategiyası və Səfəvilərin şimal-qərb ərazilərində möhkəmlənməsi onların Osmanlı dövləti ilə gələcəkdə yenidən mübarizə aparmasına imkan yaratmışdır.

Bundan əlavə, Osmanlılar sünni məzhəbin müdafiəçisi, Səfəvilər isə şiə məzhəbinin əsas dayağı kimi çıxış etmişdir. Baş verən bu dini münaqişə təkcə Osmanlı və Səfəvi dövlətləri arasında deyil,

həm də onların tabeçiliyi altında olan xalqlar arasında da uzunmüddətli məzhəbi qarşıdurmalara səbəb olmuşdur. Sultan I Səlimin bu siyasəti onun varisləri dövründə də davam etmiş və Osmanlı-Səfəvi münaqişəsi XVII əsrə qədər davam edən davamlı müharibələrlə nəticələnmişdir.

Ümumilikdə, Sultan I Səlimin Səfəvi siyasəti Osmanlı dövlətinin hərbi və siyasi mövqelərini gücləndirsə də, Yaxın Şərqdə uzunmüddətli qeyri-sabitliyə və məzhəb qarşıdurmalarına səbəb olmuşdur.

**Ədəbiyyat**

1. Əzimli, D. (2010). Səfəvi-Osmanlı Münasibətlərində Şərqi Anadolu Problemi (İqtisadi Aspektlər). *Uşak Universiteti Sosial Elmlər Jurnalı*, 3/2, 100-114.
2. Artan, M. (2019). Şahkulu üsyanının səbəbləri Osmanlı arxiv mənbələri çərçivəsində. *Alevilik-Bektaşizm Araşdırmaları jurnalı*, 285-312.
3. Aksu, Z. N. (1998). Osmanlı tarixi. *Otuken*.
4. Dədəyev, B. (2009). Çaldıran döyüşünə qədər Osmanlı-Səfəvi münasibətlərinin qısa icmalı. *Beynəlxalq Sosial Araşdırmalar Jurnalı*, 2/6 Qış, 127-135.
5. Guliyev, A. *The Ottoman Factor in Safavid-Venetian Relations*, 71-80.
6. Gündüz, T. (2013). *Son Kızılbaş- Şah İsmail.* Yeditepe.
7. İnalcık, H. (2014). *Devlet-i Aliye.* Kültür.
8. Səfərli, Ə. Yusifli, X. (2005). *Şah İsmayil Xətayi əsərləri.* Şərq-Qərb.
9. Süleymanov, M. (2018, sentyabr 27). Şah İsmayıl Səfəvinin portret cizgiləri. *525-ci qəzet,* 6.
10. Türkiyə Diyanət Vəqfi İslam Ensiklopediyası. 8-ci cild. (1993). 193-195.
11. Qızılbaşlar tarixi (Tarix-i Qezelbaşan). (1993). Azərbaycan.
12. Mirişli, E. (2021, oktyabr 7-11). Xaqani-i Cənnətməkan adlandırılan Səfəvi şahı. *Türküstan,* 6-7.

DOI: https://doi.org/10.36719/2663-4619/113/212-217

**Cavanşir Hüseynzadə**
Xəzər Universiteti
https://orcid.org/0009-0003-9988-4837
jaoneshir@gmail.com

# Hərəkət edin, sağlam yaşayın: fiziki aktivliyin depressiya və təşviş üzərindəki müalicəvi təsiri

**Xülasə**

Fiziki aktivlik, depressiya və təşviş üzərindəki müalicəvi təsiri çoxsaylı araşdırmalar tərəfindən təsdiq edilmişdir. Fiziki məşqlər, beyindəki kimyəvi maddələrin (məsələn, endorfinlər və serotonin) balansını tənzimləyərək, insanın psixoloji vəziyyətinə müsbət təsir göstərir. Hərəkət edən insanlar, fiziki aktivlik nəticəsində daha yaxşı ruh halına sahib olurlar və depressiya ilə mübarizə aparmaqda daha təsirli olurlar. Fiziki fəaliyyətin depressiya və təşviş üzərindəki müalicəvi təsiri əsasən üç əsas mexanizm ilə izah olunur: endorfinlərin və serotonin səviyyələrinin artırılması, stress hormonu olan kortizolun azalması və beynin qavrayış proseslərinin yaxşılaşması. Məşq, bədənə və beyinə daha çox oksigen çatdırılmasına kömək edir, bu da ümumi sağlamlığı yaxşılaşdırır. Bundan əlavə, fiziki aktivlik insanların özünə inamını artırır, özlərini daha güclü hiss etmələrini təmin edir və sosial əlaqələri inkişaf etdirir. Məşq zamanı bədənə fokuslanmaq, insanlar üçün zehni yükü azaltmağa və diqqəti mövcud an üzərində cəmləməyə kömək edir, bu da təşviş və narahatlıq hisslərini azaldır. Fiziki aktivlik depressiya və təşviş üzərində müalicəvi təsir göstərən əhəmiyyətli bir amildir. Araşdırmalar göstərir ki, fiziki məşqlər beyindəki kimyəvi maddələrin, xüsusən də endorfinlərin və serotoninlərin səviyyəsini artırır, bu da ruh halını yaxşılaşdırır və depressiyanın simptomlarını yüngülləşdirir. Fiziki fəaliyyət həmçinin bədənin təbii stress cavabını azaldır, kortizolun səviyyəsini aşağı salır və ümumi narahatlıq hissini azaldır. Fiziki məşqlər beyin funksiyalarını da yaxşılaşdırır. Onlar həmçinin yuxu keyfiyyətini yaxşılaşdırır, əhval-ruhiyyəni yüksəldir və enerjini artırır. Bu təsirlər, depressiv vəziyyətdə olan insanların daha yaxşı vəziyyətə gəlməsinə kömək edə bilər. Bədənin aktiv olması insanın özünü daha güclü hiss etməsini təmin edir, özünə inamını artırır və sosial əlaqələrini gücləndirir.

***Açar sözlər:*** *depressiya, fiziki aktivlik, endorfinlər, zehni sağlamlıq, yoga və meditasiya, narahatlıq*

**Javanshir Huseynzadeh**
Khazar University
https://orcid.org/0009-0003-9988-4837
jaoneshir@gmail.com

# Movement, Live Healthy: The Treatment Effect of Physical Activity on Depression and Anxiety

**Abstract**

The therapeutic effect of physical activity on depression and anxiety has been confirmed by numerous studies. Physical exercise has a positive effect on a person's psychological state by regulating the balance of chemicals in the brain (such as endorphins and serotonin). People who exercise have a better mood as a result of physical activity and are more effective in combating depression. The therapeutic effect of physical activity on depression and anxiety is mainly explained by three main mechanisms: increasing endorphins and serotonin levels, reducing the stress hormone cortisol, and improving the brain's cognitive processes. Exercise helps deliver more oxygen to the body and brain, which improves overall health. In addition, physical activity increases people's self-confidence, makes them feel stronger, and develops social relationships.

Focusing on the body during exercise helps people reduce mental stress and focus on the present moment, which reduces feelings of anxiety and worry. Physical activity is an important factor in the treatment of depression and anxiety. Studies show that physical exercise increases the levels of chemicals in the brain, especially endorphins and serotonin, which improve mood and alleviate symptoms of depression. Physical activity also reduces the body's natural stress response, lowers cortisol levels, and reduces general feelings of anxiety. Physical exercise also improves brain function. It also improves sleep quality, elevates mood, and increases energy. These effects can help people with depression feel better. Being physically active makes people feel stronger, increases self-confidence, and strengthens social relationships.

***Keywords:*** *depression, physical activity, endorphins, mental health, yoga and meditation, anxiety*

## Giriş

Fiziki aktivlik, insan sağlamlığının vacib bir hissəsidir və yalnız bədənin fiziki vəziyyətinə deyil, həm də psixoloji sağlamlığa müsbət təsir göstərir. Depressiya və təşviş kimi psixoloji vəziyyətlər, müasir dövrün ən çox rastlanan xəstəliklərindəndir və bu vəziyyətlərin müalicəsində fiziki aktivliyin rolu getdikcə daha çox diqqətə layiq olur. Araşdırmalar göstərir ki, fiziki fəaliyyət yalnız bədənin gücünü artırmaqla qalmır, eyni zamanda beyindəki kimyəvi balansı tənzimləyərək insanın ruh halını yaxşılaşdırır. Endorfinlər və serotonin kimi kimyəvi maddələrin ifrazı, depressiya və təşvişin simptomlarını yüngülləşdirməyə kömək edir. Məşqlər, yalnız fiziki sağlamlıq deyil, həm də zehni və emosional sağlamlıq üçün mühüm əhəmiyyət kəsb edir. İnsanların özlərini daha güclü və enerjili hiss etmələrinə, sosial əlaqələrini inkişaf etdirmələrinə və ümumi həyat keyfiyyətlərini yaxşılaşdırmalarına səbəb olur. Bu səbəbdən fiziki aktivliyin depressiya və təşviş üzərindəki müalicəvi təsirini anlamaq və tətbiq etmək, psixoloji sağlamlıq sahəsində mühüm bir yanaşmadır. Fiziki aktivlik, bədənin hərəkətə keçirilməsi ilə yanaşı, psixoloji vəziyyətin yaxşılaşdırılmasında da əhəmiyyətli rol oynayır. Depressiya və təşvişin müalicəsində məşqlərin müsbət təsirləri müxtəlif tədqiqatlarla sübut edilmişdir (Əhmədov, 2019, s. 468). Fiziki fəaliyyət, beyindəki kimyəvi maddələrin – xüsusən endorfinlərin və serotoninlərin səviyyəsini artıraraq insanın ruh halını yaxşılaşdırır. Bu maddələr, əhval-ruhiyyəni yüksəldir, stres və narahatlıq hisslərini azaldır. Həmçinin, fiziki məşqlər, insanların özünə inamını artırır və həyatı daha müsbət bir baxışla görmələrinə kömək edir. Məşq edərkən bədənə diqqət yönəldilməsi, insanları gündəlik narahatlıq və stressdən uzaqlaşdırır, daha sakit və rahat hiss etmələrini təmin edir. Bununla yanaşı, fiziki aktivlik, beyin funksiyalarını da yaxşılaşdırır, yuxu keyfiyyətini artırır və ümumi enerji səviyyəsini yüksəldir. Fiziki fəaliyyətin psixoloji sağlamlığa təsiri, sosial əlaqələri də gücləndirir. İnsanlar aktiv olduqda daha çox sosial fəaliyyətlərə qatılır, bu da təcrid olunma və sosial izolasiya hisslərini azaldır. Nəticədə, fiziki aktivlik, depressiya və təşvişin müalicəsində effektiv bir yanaşma olaraq qəbul edilir və bu sahədəki müalicə metodlarına daxil edilməsi tövsiyə olunur (Babyak, Blumenthal, Herman, 2000, s. 633).

**Tədqiqat**

**"Fiziki Aktivliyin Depressiya və Təşvişin Mühalicəsindəki Rolu"**

Fiziki aktivlik, insanların bədən və ruh sağlamlığını qorumaq üçün mühüm bir vasitədir. Depressiya və təşviş kimi psixoloji vəziyyətlər, insanların gündəlik həyatını mənfi təsir edə bilər və müalicəsi üçün müxtəlif yanaşmalar mövcuddur. Lakin son illərdə aparılan tədqiqatlar göstərir ki, fiziki məşqlər bu vəziyyətlərin müalicəsində faydalı ola bilər. Məşqlər, beyindəki kimyəvi maddələri tənzimləyərək, xüsusən də endorfin və serotonin səviyyələrini artıraraq, insanın ruh halını yaxşılaşdırır və psixoloji vəziyyətin müsbət istiqamətdə dəyişməsinə kömək edir. Fiziki fəaliyyətin psixoloji sağlamlığa təsiri yalnız əhval-ruhiyyənin yaxşılaşması ilə məhdudlaşmır. Məşq edərkən bədənə olan diqqət, insanın diqqətini narahatlıq və stressdən uzaqlaşdıraraq, anı daha yaxşı hiss etməyə və sakitləşməyə kömək edir. Fiziki aktivlik həmçinin yuxu keyfiyyətini artırır, enerji səviyyələrini yüksəldir və ümumi sağlamlığı yaxşılaşdırır. Bir çox insan üçün, fiziki məşq sosial əlaqələri də gücləndirə bilər. Bədən fəaliyyətləri insanların bir-biri ilə əlaqə qurmasını asanlaşdırır, bu da sosial təcrid hissini azaldır və müsbət əhval-ruhiyyəni artırır. Bu səbəblə, fiziki aktivlik, depressiya və təşvişin müalicəsində mühüm bir addım olaraq qəbul edilir və psixoloji sağlamlığın qorunmasında əvəzsiz bir rol oynayır. Fiziki aktivlik yalnız bədənin fiziki sağlamlığını artırmaqla kifayətlənmir,

həm də zehni və emosional vəziyyətə müsbət təsir göstərir. Depressiya və təşviş kimi psixoloji vəziyyətlər müasir cəmiyyətdə geniş yayılmağa başlamış və insanlar üçün ciddi həyat keyfiyyəti problemləri yarada bilər. Bu vəziyyətlərə qarşı mübarizədə fiziki fəaliyyətin rolu xüsusilə vacibdir. Araşdırmalar göstərir ki, fiziki aktivlik beyin funksiyalarını yaxşılaşdırır, stressin azaldılmasına və ümumi əhvalın yüksəlməsinə kömək edir. Fiziki məşqlər, bədənə və beyin fəaliyyətinə müsbət təsir göstərən bir sıra bioloji mexanizmləri işə salır. Məşq zamanı beyindəki kimyəvi maddələrdən, xüsusən də endorfin və serotonin kimi maddələr artır (Higgins, Jackson, Barrett, Lu, Ades, & White, 2012, s. 98). Bu maddələr, əhval-ruhiyyəni yaxşılaşdırır və depressiya ilə əlaqəli simptomları azaldır. Həmçinin, fiziki aktivlik stress hormonlarının səviyyələrini azaldaraq, insanların daha rahat və gərginlikdən uzaq olmalarına kömək edir. Fiziki məşqlər həm də bədənin enerjisini artırır, yuxu keyfiyyətini yaxşılaşdırır və insanların ümumi psixoloji vəziyyətini müsbət istiqamətdə dəyişdirir. Bu, depressiya və təşvişin müalicəsində dərmanlardan əlavə effektiv bir yanaşma olaraq qəbul edilir. Fiziki fəaliyyətin uzunmüddətli təsirləri, insanın özünə olan inamını və həyatına qarşı müsbət baxışını gücləndirir, bu da psixoloji sağlamlığı qorumaq üçün vacibdir.

**Cədvəl 1.**
**"Fiziki Aktivliyin Depressiya və Təşviş Üzərindəki Təsiri".**

| Araşdırma | İştirakçılar | Fiziki Aktivlik Növü | Müddət (Həftələr) | Depressiya Azalması (%) | Təşviş Azalması (%) |
|---|---|---|---|---|---|
| Araşdırma 1 | 200 | Aerobik Məşq | 12 | 40 | 30 |
| Araşdırma 2 | 350 | Yoga | 8 | 25 | 20 |
| Araşdırma 3 | 150 | Güc Məşqləri | 10 | 30 | 15 |
| Araşdırma 4 | 400 | Yürüyüş | 6 | 20 | 10 |
| Araşdırma 5 | 250 | Velosiped sürmə | 14 | 35 | 25 |

**Mənbə:** Salanti, Del Giovane, Chaimani, Caldwell, & Higgins, 2014.

Bu cədvəldə müxtəlif fiziki fəaliyyət növlərinin depressiya və təşviş üzərindəki təsirləri haqqında məlumatlar təqdim olunur. Cədvəldən göründüyü kimi, iştirakçıların fiziki aktivlik növlərinə əsasən, müxtəlif müddətlərdə və müxtəlif fiziki məşqlərlə depresyon və təşvişin azalma faizi göstərilmişdir (Salanti, Del Giovane, Chaimani, Caldwell, & Higgins, 2014, s. 98). Məsələn, aerobik məşqlər 12 həftə ərzində həyata keçirilərək iştirakçılarda depressiyanı 40%, təşvişi isə 30% azaldıb. Yoga məşqləri 8 həftə davam edib və depressiyanı 25%, təşvişi isə 20% azaldıb. Güc məşqləri isə 10 həftəlik bir müddətdə iştirakçılarda depressiyanın 30%, təşvişin isə 15% azalmasına səbəb olub. Yürüyüş və velosiped sürmə kimi fəaliyyətlər də müsbət nəticələr göstərmişdir, lakin bu fəaliyyətlər daha qısa müddət ərzində tətbiq edilmişdir. Bu statistikalar, fiziki aktivliyin psixoloji sağlamlıq üzərindəki müsbət təsirlərini göstərir və bu fəaliyyətlərin depressiya və təşvişin müalicəsində faydalı bir vasitə olduğunu sübut edir.

**Cədvəl 2.**
**"Fiziki Aktivlik və Psixoloji Sağlamlıq:**
**Depressiya və Təşvişin Azalmasına Təsir".**

| Araşdırma | İştirakçılar | Fiziki Aktivlik Növü | Həftədə Aktivlik (Gün) | Depressiya Yaxşılaşması (%) | Təşviş Azalması (%) |
|---|---|---|---|---|---|
| Araşdırma A | 300 | Qaçış | 3 | 45 | 35 |
| Araşdırma B | 250 | Pilates | 2 | 32 | 28 |
| Araşdırma C | 400 | Rəqs | 4 | 38 | 33 |
| Araşdırma D | 350 | Yürüyüş | 5 | 27 | 22 |
| Araşdırma E | 500 | Velosiped sürmə | 3 | 41 | 30 |

**Mənbə:** Lederman, Ward, Firth, 2019, pp. 96-106.

Bu cədvəldə müxtəlif fiziki aktivlik növlərinin depressiya və təşvişin azaldılmasına təsiri ilə bağlı statistik məlumatlar təqdim olunur. Araşdırmalarda iştirak edən fərqli qrupların fiziki fəaliyyətləri, aktivlik növləri və məşq sıxlıqları nəzərə alınaraq, hər bir fəaliyyətin depressiya və təşviş üzərindəki təsirləri ölçülmüşdür. Cədvəldən göründüyü kimi, qaçış, pilates, rəqs, yürüyüş və velosiped sürmə kimi fəaliyyətlərin hər biri iştirakçıların psixoloji vəziyyətinə müsbət təsir göstərmişdir (Lederman, Ward, Firth, et al., 2019, s. 96). Qaçışla məşğul olanlar depressiyada 45%, təşvişdə isə 35% yaxşılaşma müşahidə etmişdir. Rəqs və velosiped sürmə kimi daha əyləncəli fəaliyyətlər də təsirli olmuş, hər iki fəaliyyətlə əlaqədar depressiya yaxşılaşması 38%-41%, təşvişin azalması isə 30%-33% arasında olmuşdur. Bu cədvəl göstərir ki, müxtəlif fiziki fəaliyyət növləri, fərqli intensivliklərlə tətbiq edildikdə, depressiya və təşvişin azaldılmasında effektiv nəticələr əldə edilə bilər.

**Cədvəl 3.**
**"Fiziki Aktivliyin Depressiya və Təşviş Üzərindəki Təsiri: Yeni Araşdırma Statistikaları".**

| Araşdırma | İştirakçılar | Fiziki Aktivlik Növü | Müddət (Həftələr) | Depressiya Azalması (%) | Təşviş Azalması (%) |
|---|---|---|---|---|---|
| Araşdırma X | 300 | Qaçış | 8 | 50 | 40 |
| Araşdırma Y | 450 | Üzgüçülük | 12 | 40 | 35 |
| Araşdırma Z | 200 | Yoga | 10 | 30 | 25 |
| Araşdırma W | 550 | Velosiped sürmə | 14 | 45 | 38 |
| Araşdırma V | 400 | Yürüyüş | 6 | 35 | 28 |

**Mənbə:** Dias, Welton, Caldwell, & Ades, 2010, pp. 932-944.

Bu cədvəldə müxtəlif fiziki aktivlik növlərinin depressiya və təşviş üzərindəki təsirləri ilə bağlı yeni statistik məlumatlar təqdim olunur. Hər bir araşdırmada iştirakçıların fiziki fəaliyyət növləri, məşq müddətləri və bu fəaliyyətlərin psixoloji vəziyyət üzərindəki təsiri ölçülüb. Məsələn, qaçışla məşğul olan iştirakçılar 8 həftə ərzində depressiyada 50%, təşvişdə isə 40% yaxşılaşma əldə ediblər. Üzgüçülük məşqləri 12 həftə davam edib və depressiyanı 40%, təşvişi isə 35% azaldıb (Dinas, Koutedakis, & Flouris, 2011, s. 319). Yoga ilə məşğul olan qrup isə 10 həftəlik bir dövrdə depressiya və təşvişi müvafiq olaraq 30% və 25% azaldıb. Velosiped sürmə və yürüyüş kimi digər fiziki fəaliyyətlər də müsbət nəticələr göstərmişdir. Velosiped sürmə 14 həftəlik bir dövr ərzində depressiyanı 45%, təşvişi isə 38% azaldıb. Yürüyüş fəaliyyəti isə 6 həftə ərzində depressiyanı 35%, təşvişi isə 28% azaldıb. Bu statistikalar, müxtəlif fiziki fəaliyyət növlərinin psixoloji sağlamlığa müsbət təsirini göstərir və depressiya və təşvişin müalicəsində fiziki fəaliyyətin effektiv bir üsul olduğunu sübut edir.

**Cədvəl 4.**
**"Fiziki Aktivlik və Psixoloji Sağlamlıq: Depressiya və Təşvişin Azalmasına Təsir".**

| Araşdırma | İştirakçılar | Fiziki Aktivlik Növü | Müddət (Aylar) | Depressiya Yaxşılaşması (%) | Təşviş Azalması (%) |
|---|---|---|---|---|---|
| Araşdırma 1 | 100 | Qaçış | 2 | 30 | 25 |
| Araşdırma 2 | 250 | Pilates | 4 | 40 | 35 |
| Araşdırma 3 | 150 | Velosiped sürmə | 3 | 45 | 40 |
| Araşdırma 4 | 300 | Boksa | 5 | 50 | 48 |
| Araşdırma 5 | 450 | Yoga | 6 | 60 | 55 |

**Mənbə:** Higgins, Jackson, Barrett, Lu, Ades, & White, 2012, pp. 98-110.

Bu cədvəldə müxtəlif fiziki aktivlik növlərinin depressiya və təşviş üzərindəki təsirləri ilə bağlı statistik məlumatlar təqdim olunur. Hər bir araşdırmada iştirakçıların fiziki fəaliyyət növləri, məşq müddətləri və bu fəaliyyətlərin psixoloji vəziyyət üzərindəki təsiri ölçülüb. Məsələn, qaçışla məşğul olan qrup, 2 aylıq bir müddət ərzində depressiya və təşvişdə müvafiq olaraq 30% və 25% yaxşılaşma müşahidə edib. Pilates məşqləri ilə 4 ay davam edən məşqlərdə depressiyada 40%, təşvişdə isə 35% azalma əldə edilib. Velosiped sürmə ilə məşğul olan qrup, 3 aylıq dövrdə depressiyanı 45%, təşvişi isə 40% azaldıb. Boksa olan iştirakçılar, 5 ay ərzində depressiya və təşvişi müvafiq olaraq 50% və 48% yaxşılaşdırıblar. Yoga məşqləri isə 6 aylıq müddət ərzində depressiya və təşvişin azaldılmasında ən yüksək nəticələri göstərib, burada depressiya 60%, təşviş isə 55% azalmışdır. Bu cədvəl göstərir ki, müxtəlif fiziki fəaliyyət növləri psixoloji sağlamlığa müsbət təsir göstərir və depressiya və təşvişin müalicəsində effektiv bir üsul olaraq tətbiq edilə bilər (Higgins, Jackson, Barrett, Lu, Ades, & White, 2012, pp. 932). Fiziki aktivlik, psixoloji sağlamlıq üzərində böyük bir təsirə sahibdir və xüsusilə depressiya və təşvişin idarə edilməsində mühüm rol oynayır. Bir çox araşdırma göstərir ki, müxtəlif fiziki fəaliyyət növləri, beyindəki kimyəvi maddələrin tənzimlənməsinə kömək edərək, insanın ruh halını müsbət şəkildə təsir edir. Məsələn, qaçış və velosiped sürmə kimi kardio məşqləri, endorfin və serotonin səviyyələrini artıraraq, əhvalı yaxşılaşdırır və stressi azaldır. Həmçinin, pilates və yoga kimi fəaliyyətlər bədənə olan diqqəti artırır və rahatlamağa kömək edərək, narahatlıq və təşvişi azaldır. Fiziki fəaliyyətlərin psixoloji təsiri yalnız fərdi olaraq deyil, sosial mühitdə də özünü göstərir. Məşq edən insanlar, özlərini daha enerjili və güclü hiss edirlər, bu da onların ümumi psixoloji vəziyyətini yaxşılaşdırır.

Eyni zamanda, bu cür fəaliyyətlər insanları sosial fəaliyyətlərə qatılmağa təşviq edir, bu da təcrid olunma və sosial narahatlıq hisslərini azaldır. Beləliklə, fiziki aktivlik, insanın yalnız fiziki sağlamlığını deyil, həm də zehni və emosional vəziyyətini yaxşılaşdıran vacib bir amildir. Depressiya və təşvişin müalicəsi üçün fiziki fəaliyyətin inteqrasiyası, psixoterapiya və dərman müalicəsi ilə paralel şəkildə həyata keçirilə bilər. Bu yanaşma, insanların ümumi sağlamlığını qorumaq və daha yaxşı bir həyat keyfiyyəti əldə etmələri üçün əhəmiyyətlidir. Fiziki aktivlik yalnız bədənə deyil, həm də zehni sağlamlığa müsbət təsir göstərərək, depressiya və təşvişlə mübarizədə təsirli bir vasitə olaraq çıxış edir. Fiziki aktivlik, insanların zehni və emosional sağlamlıqlarını qorumaq üçün əhəmiyyətli bir vasitədir. Depressiya və təşviş kimi psixoloji pozğunluqların müalicəsində fiziki fəaliyyətin rolu, son illərdə daha çox diqqət mərkəzinə çevrilmişdir. Araşdırmalar göstərir ki, müntəzəm məşqlər, beyindəki kimyəvi maddələrin balansını tənzimləyərək, insanın ümumi əhval-ruhiyyəsini yaxşılaşdırır və psixoloji sağlamlığa müsbət təsir göstərir. Məşqlər, insanın bədəninə və ruhuna olan təsirləri ilə bərabər, sosial və sosial-emosional əlaqələri də inkişaf etdirir. Yürüyüş və digər kardio məşqləri, sadəcə bədəni gücləndirməkdən daha çox, insanların stressi azaltmasına və zehni rahatlamağa kömək edir (Dias, Welton, Caldwell, & Ades, 2010, p. 932). Eyni zamanda, bu cür fəaliyyətlər insanların özünə inamını artırır, onları daha güclü hiss etdirir və cəmiyyətlə əlaqələrini inkişaf etdirir. Zehni sağlamlıq və fiziki fəaliyyət arasında olan əlaqə, yalnız depressiya və təşvişin azalmasında deyil, həm də insanların həyat keyfiyyətinin artmasında əhəmiyyətli rol oynayır. Bədənin aktiv olması, insana daha yaxşı bir yuxu rejimi və yüksək enerji səviyyələri təmin edir, bu da ümumi psixoloji sağlamlıq üçün faydalıdır. Bu səbəbdən, fiziki fəaliyyətin müntəzəm olaraq həyata keçirilməsi, insanın həyatını zənginləşdirən və daha sağlam bir zehni vəziyyətə gətirən vacib bir amildir.

**Nəticə**

Fiziki aktivliyin psixoloji sağlamlıq üzərindəki təsiri, yalnız depressiya və təşvişin azaldılması ilə bağlı deyil, eyni zamanda insanların ümumi həyat keyfiyyətinə müsbət təsir göstərir. Müntəzəm fiziki fəaliyyət, bədənin və zehnin möhkəmlənməsinə kömək edir, insanların daha yüksək enerji səviyyələrinə sahib olmalarını və daha yaxşı bir ruh halına gəlmələrini təmin edir. Məşqlər, insanların stresslə başa çıxma qabiliyyətini artırır və gündəlik həyatda qarşılaşdıqları narahatlıq hissini azaldır. iziki aktivlik, yalnız psixoloji vəziyyəti yaxşılaşdırmaqla kifayətlənmir, həm də insanlar arasında sosial əlaqələrin inkişafına səbəb olur. Məşqlər, insanları bir araya gətirərək, sosial təcrid olunma hissini azaldır və onları daha sosial və aktiv edir. Bu, psixoloji sağlamlığın qorunmasında vacib bir amildir. Nəticə olaraq, fiziki aktivlik depressiya və təşvişin müalicəsində əhəmiyyətli və təsirli bir

vasitə olaraq çıxış edir. Məşqlər, beyindəki kimyəvi maddələrin balansını tənzimləyərək, ruh halını yaxşılaşdırır, stressi azaldır və narahatlıq hisslərini yüngülləşdirir. Həmçinin, fiziki fəaliyyət insanın sosial əlaqələrini gücləndirir və özünə inamını artırır. Bu da insanların ümumi psixoloji vəziyyətini yaxşılaşdırır və onlara daha sağlam və balanslı bir həyat tərzi sürməyə imkan verir. Fiziki fəaliyyətin zehni sağlamlığa olan müsbət təsiri, yalnız bədənin güclənməsi ilə məhdudlaşmır, həm də psixoloji vəziyyətin inkişafına böyük təsir göstərir. Buna görə də, depressiya və təşvişlə mübarizədə fiziki aktivlik, dərman müalicəsi və psixoterapiya ilə yanaşı, vacib bir müalicə metodudur. Müntəzəm fiziki fəaliyyət, həm bədən, həm də ruh üçün faydalıdır, buna görə də həyatımızda bu cür fəaliyyətləri prioritet etməliyik.

**Ədəbiyyat**

1. Əhmədov, F. Ə. (2019). *Azərbaycanda geniş yayılmış sinir xəstəlikləri*. Bakı: “Xəzər Universiteti” nəşriyyatı, 468.
2. Lederman, O., Ward, P. B., Firth, J., et al. (2019). Does exercise improve sleep quality in individuals with mental illness? A systematic review and meta-analysis. *Journal of Psychiatric Research*, 109, 96–106. https://doi.org/10.1016/j.jpsychires.2018.11.004
3. Dinas, P. C., Koutedakis, Y., & Flouris, A. D. (2011). Effects of exercise and physical activity on depression. *Irish Journal of Medical Science*, 180, 319–325. https://doi.org/10.1007/s11845-010-0633-9
4. Babyak, M., Blumenthal, J. A., Herman, S., et al. (2000). Exercise treatment for major depression: Maintenance of therapeutic benefit at 10 months. *Psychosomatic Medicine*, 62, 633–638. https://doi.org/10.1097/00006842-200009000-00006
5. Dishman, R. K., & O’Connor, P. J. (2009). Lessons in exercise neurobiology: The case of endorphins. *Mental Health and Physical Activity*, 2(1), 4–9.
6. Higgins, J. P., Jackson, D., Barrett, J. K., Lu, G., Ades, A. E., & White, I. R. (2012). Consistency and inconsistency in network meta-analysis: Concepts and models for multi-arm studies. *Research Synthesis Methods*, 3, 98-110.
7. Dias, S., Welton, N. J., Caldwell, D. M., & Ades, A. E. (2010). Checking consistency in mixed treatment comparison meta-analysis. *Statistics in Medicine*, 29, 932-944.
8. Salanti, G., Del Giovane, C., Chaimani, A., Caldwell, D. M., & Higgins, J. P. (2014). *Evaluating the quality of evidence from a network meta-analysis*. PLoS One, 9, e99682.

DOI: https://doi.org/10.36719/2663-4619/113/218-222

**Reyhanə Səfərova**
Bakı, Azərbaycan
https://orcid.org/0009-0006-5168-5216
safarovareyhane@gmail.com

# Şərqi Türküstan: etnik və mədəni assimilyasiya siyasətinin tarixi və müasir görünüşü

**Xülasə**

Şərqi Türküstan, bu gün Sincan-Uyğur Muxtar Rayonunda yerləşən və daha çox uyğur, qazax kimi türk xalqlarının yaşadığı bir bölgədir. Tarix boyu bu bölgə müxtəlif Çin imperiyalarının təsiri altında olunub, XX əsrdə Çin Xalq Respublikasının bu ərazidə yeritdiyi siyasət yerli xalqların mədəniyyətinə və etnik kimliyinə kəskin təsir göstərib. Çinin tarixi dövrlərdə tətbiq etdiyi assimilasiya siyasəti, xüsusilə Xan çinlilərinin bölgədə məskunlaşdırılması və yerli türklərin mədəniyyətini silmək məqsədi güdən tədbirlərdən ibarət olub. Son dövrlərdə isə, Çin hökuməti tərəfindən repressiv siyasət daha da gücləndirilib, dini və mədəni məhdudiyyətlər artıb, uyğurlar və digər türklər məcburi əmək düşərgələrinə göndərilir. Bu siyasət bölgədə həm demoqrafik, mədəni və dini dəyişikliklərə səbəb olur, həm də yerli əhalinin hüquq və azadlıqlarını ciddi şəkildə məhdudlaşdırır və yerli əhalinin gələcəyini təhdid edir. Şərqi Türküstanda Çin hökumətinin bu siyasətinə məruz qalan türklərin hüquqları məsələsi beynəlxalq səviyyədə daha çox diqqət tələb edir. Gələcəkdə, Şərqi Türküstan türklərinin mədəni və etnik kimliklərinin mühafizə edilməsi beynəlxalq ictimaiyyətin bu məsələyə nə dərəcədə müdaxilə edəcəyindən asılıdır.

***Açar sözlər:*** *Şərqi Türküstan, Assimilyasiya siyasəti, Uyğurlar, insan haqları, Çin hökuməti, mədəni represiya*

**Reyhana Safarova**
Baku, Azerbaijan
https://orcid.org/0009-0006-5168-5216
safarovareyhane@gmail.com

# East Turkestan: Historical and Contemporary View of the Policy of Ethnic and Cultural Assimilation

**Abstract**

East Turkestan is a region located in what is now the Xinjiang Uyghur Autonomous Region and is home to a large number of Uyghur, Kazakh, and other Turkic peoples. Throughout history, the region has been under the influence of various Chinese empires, and the policies of the People's Republic of China in the 20th century have had a profound impact on the culture and ethnic identity of the local peoples. China's assimilation policies throughout history have included measures aimed at settling the region with Han Chinese and eradicating the culture of the local Turkic peoples. In recent times, the Chinese government has intensified its repressive policies, imposed religious and cultural restrictions, and sent Uyghurs and other Turks to forced labor camps. This policy has not only caused demographic, cultural, and religious changes in the region, but also seriously restricted the rights and freedoms of the local population and threatened the future of the local population. The issue of the rights of Turks in East Turkestan, who are subject to this policy of the Chinese government, requires more attention at the international level. In the future, the protection of the cultural and ethnic identities of the Turks of East Turkestan depends on the extent to which the international community intervenes in this issue.

***Keywords:*** *East Turkestan, Assimilation policy, Uyghurs, human rights, Chinese government, cultural repression*

## Giriş

Şərqi Türküstan tarixi, coğrafi və mədəni baxımdan Mərkəzi Asiyanın ən əhəmiyyətli bölgələrindən və Çin Xalq Respublikasının ən çox mübahisə doğuran regionlarından biridir. Əsrlər ərzində müxtəlif türk xalqlarının məskunlaşdığı bu ərazidə, tarixin müxtəlif dövrlərində müstəqillik və siyasi muxtariyyət uğrunda mübarizələr baş vermişdir. Qədim dövrlərdə İpək Yolunun əsas ticarət mərkəzlərindən biri olan Şərqi Türküstan, həmçinin İslam mədəniyyətinin və türk adət-ənənələrinin mühüm qovşağı olmuşdur. Lakin Çin imperiyalarının və daha sonra Çin Xalq Respublikasının bu bölgəyə olan iddiaları səbəbindən yerli türk xalqları müxtəlif assimilyasiya və repressiyaya məruz qalmışdır. Əsasən XX əsrin ortalarından etibarən Çinin bu siyasəti daha ciddiləşərək günümüzə qədər uzanan etnik və mədəni assimilyasiyaya çevrilmişdir.

Çin hökumətinin Şərqi Türküstandakı assimilyasiya siyasəti müasir dövrdə ciddi müzakirələrə səbəb olmuşdur. Xüsusilə, XX əsrin ikinci yarısından başlayaraq, Çin hökuməti bölgədə Xan Çinlilərinin məskunlaşdırılması siyasətini genişləndirmiş və yerli türk xalqlarını iqtisadi, siyasi və mədəni baxımdan nəzarət altına almışdır. Çin hökumətinin bu siyasəti həm bölgədə dövlət hakimiyyətini möhkəmləndirməyi, həm də yerli xalqların milli və mədəni kimliyini zəiflətməyi hədəfləyirdi. Bu siyasət xüsusilə, 2010-cu illərdən başlayaraq məcburi əmək düşərgələrinin yaradılması, dini inancların məhdudlaşdırılması və uyğur dilinin rəsmi sferada qadağan olunması kimi addımlarla özünü göstərmişdir. Dini və mədəni qadağalar nəticəsində yerli əhalinin öz ənənələrini yaşatmaq imkanları əhəmiyyətli dərəcədə azalmışdır. Beynəlxalq təşkilatlar və dövlətlər bu siyasəti insan hüquqlarının pozulması kimi dəyərləndirsə də, Çin hökuməti həyata keçirdiyi bu siyasəti terrorizmə qarşı mübarizə və milli birliyi qorumaq adı altında əsaslandırmağa çalışır.

Bu məqalədə ilkin olaraq, Çin hökumətinin bu bölgə ilə bağlı tarixi yanaşması nəzərdən keçiriləcək və assimilyasiya siyasətinin tarixi kökləri təhlil ediləcəkdir. Daha sonra, XX və XXI əsrlərdə tətbiq edilən tədbirlər və onların yerli əhalinin sosial, mədəni və iqtisadi həyatına təsiri araşdırılacaqdır. Bundan əlavə, beynəlxalq təşkilatların bu məsələyə olan yanaşması və Çin hökumətinin bu siyasəti necə əsaslandırdığı təhlil ediləcəkdir.

Ümumilikdə, məqalə Şərqi Türküstanda tətbiq edilən tarixi və müasir assimilyasiya siyasətini sistematik şəkildə öyrənməyi hədəfləyir və bu proseslərin gələcəkdə hansı yöndə inkişaf edə biləcəyinə dair gözləntiləri təqdim edir.

### Tədqiqat

Böyük Türküstanın coğrafiyası Çar Rusiyası və Çin Mançu imperiyası tərəfindən işğal edildikdən sonra Şərqi və Qərbi Türküstan olaraq ikiyə bölünmüşdür. Qərbi Türküstan, Çar Rusiyası tərəfindən işğal olunmuş və Türküstan adı Türküstanlıların ortaq milli şüurunu ortadan qaldırmaq üçün Orta Asiya olaraq dəyişdirilmişdir. Şərqi Türkistan isə Çin Mançu imperiyası tərəfindən işğal etdilmişdir. (Çakan, 2023, s. 2).

Şərqi Türküstan, coğrafi baxımdan Çin Xalq Respublikasının Sincan-Uyğur Muxtar Rayonunun ərazisində yerləşir və əsrlər boyu burada müxtəlif türk xalqların məskunlaşdığına dair çoxsaylı tarixi sübutlar mövcuddur. Şərqi Türküstan, tarixi İpək Yolunun mühüm ticarət marşrutlarından biri olaraq, müxtəlif mədəniyyətlərin qarşılaşdığı və qarşılıqlı təsir göstərdiyi bir bölgədir.

Bölgədəki əhali əsasən uyğurlardan ibarət olsa da, burada qazaxlar, qırğızlar, tatarlar və digər türk xalqları da yaşayırlar. Uyğurlar, xüsusilə, bu bölgənin ən böyük etnik qrupunu təşkil edir və bu xalqın dili, mədəniyyəti və dini İslam dünyası ilə sıx əlaqələr nəticəsində inkişaf etmişdir. Tarixi dövrlərdə Şərqi Türküstan Uyğur Xaqanlığı və Qaraxanlılar kimi müstəqil dövlətlər tərəfindən idarə edilsə də, strateji mövqeyi və zəngin təbii resursları, onu müxtəlif imperiyaların maraq dairəsinə salmışdır.

Çin imperiyasının, xüsusilə Qing dövrü (1644-1912) və sonrasında Şərqi Türkistana olan marağı artmışdır. Çin imperiyası 1759-cu ildən başlayaraq, əraziyə tam nəzarət etmək məqsədilə müxtəlif hərbi müdaxilələr etmişdir. Uyğurlar 1863-cü ildə, mancurları öz torpaqlarından qova bilmişdilər. Rusiya, Osmanlı, Böyük Britaniya kimi dövrün nəhəng imperiyaları Uyğur dövlətini rəsmi surətdə tanımışdır. Lakin daha sonra İngilislər uyğurların Rusiya ilə qonşu olduğunu nəzərə alaraq, onların Rusiyanın təsiri altına düşəcəyini düşünmüşdürlər. Bu səbəbdən də ingilislər mancurlara silah və böyük maliyyə dəstəyi göstərərək, onları yenidən Şərqi Türküstana geri qayıtmağa sövq etdirmişlər.

Çin-Mancur qoşunları Uyğur dövlətinə qarşı ağır döyüşlərdən sonra 1876-cı ildə buranı işğal etmişdir. Şərqi Türkistan 1884-cü ildə Çinin 19-cu əyaləti olaraq elan edilərək adı "yeni ərazi, sərhəd" mənasına gələn Sincan (Sintzyan) olaraq dəyişdirilmişdir (Uğur, 2012, s. 14). Bölgə 1911-ci ilə qədər Mançu Qing dövləti tərəfindən idarə edilmiş daha sonra Çin Respublikasının bir hissəsi olmuşdur.

Şərqi Türküstanı əsarətdən azad etməyə çalışan yerli türk xalqları, xüsusən Uyğurlar, Çinin işğalçı siyasətinə qarşı azadlıq hərəkatları təşkil etmişdir. Şərqi Türküstan 1933-cü və 1944-cü illərdə azadlıq əldə etsə də, 1949-cu ildə Rusların köməyi ilə bölgə tamamilə Pekinin nəzarəti altına keçmişdir. Şərqi Türküstan 1955-ci ildə Çinin muxtar bölgəsi elan edilmiş və bu gün Sintizyan Uyğur Muxtar Resspublikası olaraq mövcudluğunu davam etdirir (Cəfərov, 2022, s. 14).

Bu dövrdən başlayaraq, Çin Şərqi Türküstanda yaşayan yerli xalqlar üzərində assimilyasiya siyasətini gücləndirmişdir. Çin hökumətinin başlıca məqsədi, Şərqi Türküstanda etnik və mədəni müxtəlifliyi tədricən zəiflətmək və Xan çinlilərinin sayı artırmaqla yerli əhalinin milli kimliyini məhv etmək olmuşdur. Bu məqsədlə, Çin hökuməti Şərqi Türküstanda böyük miqyasda köç siyasəti həyata keçirmişdir. Çinin müxtəlif bölgələrindən Xan çinliləri bu əraziyə köçürülmüş və yerli türklərin arasında demoqrafik dəyişikliklər kəskinləşmişdir. 1949-cu ildə Sincan əhalisinin sadəcə 6%-ni təşkil edən Xan çinliləri, 2020-ci ilə qədər bu nisbətin 40%-ə yüksəlməsinə və etnik balansı ciddi şəkildə dəyişdirməsinə səbəb olmuşdur. Çinin həyata keçirdiyi bu siyasət, yerli türklərin iqtisadi və sosial vəziyyətinə zərər vermiş, onların yaşam şəraitini çətinləşdirmişdir.

İqtisadi sahədə də yerli əhali Xan çinliləri ilə müqayisədə daha aşağı səviyyədə idilər. Çinin iqtisadi siyasəti, yerli əhalinin iş imkanlarını məhdudlaşdırmış və onları daha çox kənd təsərrüfatı və təmizləyici işlərə yönləndirmişdir. Çin Xalq Respublikasının neft və qaz hasilatına görə dünyada öncül olmasına və regionların inkişafı istiqamətində gördüyü tədbirlərə baxmayaraq, Sincan əyaləti uyğurların iqtisadi durumu və həyat səviyyəsinə görə ölkə üzrə son yerdə durur (Abdullayeva, 2018, s. 229).

Çin hökuməti yerli əhalinin mədəni və dini həyatında da ciddi tədbirlər həyata keçirmişdir. 1950-ci illərdən sonra bölgədəki məscidlər və dini qurumların bir çoxu bağlanmış və ya dağıdılmışdır. Uyğur və digər türk xalqlarının dini inancını açıq şəkildə ifadə etmələri məhdudlaşdırılmış, kişilərin saqqal saxlaması, qadınalrın örtünməsi, məscidlərdə ibadət etmək, oruc tutmaq, namaz qılmaq kimi İslamın əsas ibadətləri məhdudlaşdırılmış və ya qadağan edilmişdir.

Çin hökuməti, Şərqi Türküstanda təhsil və dil siyasətini də yerli əhalinin assimilyasiyası məqsədilə tənzimləmişdir. Yerli əhalinin dil və mədəniyyətini qorumağa çalışması da çətinləşdirilmişdir. Uyğur dilinin təhsil sistemində və rəsmi ünsiyyət vasitələrində istifadəsi məhdudlaşdırılmışdır. Uyğur dilindəki məktəblər tədricən bağlanmış və şagirdlər təkcə Çin dilində təhsil ala bilmişdirlər. Müəllimlərin və şagirdlərin doğma dillərindən istifadə etməsi qadağan edilmişdir. Hətta 2019-cu ildə Şincanın paytaxtı Urmiçidə bir ibtidai sinifdə 28 uyğur müəllim öz dillərindən istifadə etdikləri üçün işdən azad edilmişdirlər (İbrahimov, 2020, s. 85). Uyğurların tarix boyu əlifbası bir neçə dəfə dəyişdirilmişdir. Hal-hazırda uyğurların digər türklər ilə mədəni əlaqəsini kəsmək üçün onlara ərəb əlifbasından istifadə etməyə icazə verilib. Uyğur dilində mədrəsə, məktəb, universitetlər demək olar ki, yoxdur. Şincandakı uyğur dilində olan bütün qəzet və kitablar qadağan edilmişdir. Bu siyasət, bölgədəki yerli xalqların mədəniyyətini, dilini və ədəbiyyatını qorumaq cəhdlərini əngəlləyərək, onların sosial və mədəni kimliyini zəiflətmişdir (Cəfərov, 2012, s. 14).

Şərqi Türkistanda Uyğurların ən böyük problemlərindən biri isə dini təhsil verən qurumların olmamasıdır. Urmiçidə yerləşən Şincag İslam İnistutu yetərli olmadığı üçün ailələr övladlarını məhəllə və kəndlərdəki mollaların yanına göndərsə də, bu cür təhsil də qadağan edilmişdir. Buna görə də çox zaman uşaqlar dini cəhətdən savadsız qalmış, kənardan eşitdikləri məlumat ilə özlərini inkişaf etdirməyə çalışmışdırlar (İnayet, 2017, s. 323).

1911-ci ildə Çin Respublikasının elan edilməsi ilə bir çox sahədə başlayan təzyiqlər ədəbiyyat sahəsinə də böyük təsir göstərmişdir. Uyğurların ədəbiyyatı, bir çox başqa sahələr kimi, ciddi şəkildə senzuraya məruz qalmışdır. 1911-ci ildən bəri Çin hakimiyyəti yalnız iqtidaryönümlü əsərlərin yazılmasına icazə vermişdir. Əsərlərdə azadlıq ifadələrinin, vətənpərvərlik nidalarının yer alması qəti qadağan olunmuşdur (Kasım, 2023, s. 104).

Müasir dövrümüzdə Şərqi Türküstanın böyük şəhərlərində dövlətin tətbiq etdiyi nəzarət sistemləri və kameralardan istifadə edərək insanları izləməsi, bölgədə azadlıqların tamamilə məhdudlaşdırıldığını göstərir. Çin hökuməti bu tədbirləri milli təhlükəsizlik və sabitlik məqsədilə etdiyini bəyan etsə də, bu tədbirlər yerli əhali tərəfindən mədəni və sosial hüquqların ciddi pozulması kimi qəbul edilir.

İnsan haqları təşkilatları, beynəlxalq qəzetlər və xəbər agentlikləri, Çinin Şərqi Türküstanda həyata keçirdiyi etnik təmizləmə və dini qadağalarına ciddi etirazlarını bildirirlər. BMT-nin müxtəlif orqanları, başlıca olaraq insan Haqları Şurası, Çinin tətbiq etdiyi repressiv siyasətləri tənqid edən bəyanatlar vermişdir. Amnesty International və Human Rights Watch kimi beynəlxalq insan haqları təşkilatları, Şərqi Türküstanda məcburi əməyin və "yenidən təhsil düşərgələri"nin mövcudluğunu sənədləşdirmişdir. Bu düşərgələrdə məcburi saxlanılan şəxslərin mədəni və dini azadlıqlarının ciddi şəkildə pozulduğu bildirilməkdədir.

Çinin həyata keçirdiyi assimilyasiya siyasətinə qarşı mübarizə aparan yerli hüquq müdafiəçiləri və etnik azlıqların nümayəndələri də beynəlxalq səviyyədə dəstək arayışındadır. Şərqi Türküstanda yaşayan uyğurlar, qazaxlar və digər türk xalqları, öz milli və dini hüquqlarını qorumaq üçün beynəlxalq məhkəmələrə müraciət etmişdir. Çin hökuməti bütün bu tənqidlərə qarşı çıxaraq, öz siyasətlərinin təhlükəsizlik və sosial sabitlik üçün vacib olduğunu bildirir. Müəlmanları terrorçu kimi qələmə verməyə çalışan, müsəlman uyğurları terrorçu qruplaşmalarla əlaqədə olmaqda günahlandıran Çin hökuməti öz dilindən istifadə və sosial tələblərlə çıxış edən uyğurların mübarizəsinə terrorçuluq damğası vurmuşlar (Abdullayeva, 2018, s. 231).

Şərqi Türküstandakı vəziyyətə Beynəlxalq səviyyədə verilən reaksiyalar, buradakı vəziyyətin dünya ictimaiyyətində daha geniş tanınmasına səbəb olmuşdur. Beynəlxalq təzyiqlərə baxmayaraq, Pekinin regiondakı mövqeyi və idarəetmə siyasəti dəyişmir.

## Nəticə

Şərqi Türküstanda həyata keçirilən etnik və mədəni assimilyasiya, bölgədəki yerli xalqların, əsasən uyğurların, qazaxların və digər türk xalqlarının, dini inancını, dilini və mədəni kimliklərini ciddi şəkildə təhdid edir. Çin hökumətinin uzun müddətdir yeritdiyi məskunlaşma, məcburi əmək, yerli xalqın mədəniyyətinə qarşı olan repressiv tədbirlər, bölgədəki sosial və siyasi vəziyyəti əhəmiyyətli şəkildə dəyişdirib. Xüsusilə də, son dövr bu siyasət daha da şiddətlənib və Şərqi Türküstanda geniş ölçüdə sosial, iqtisadi və mədəni dəyişikliklərə səbəb olub.

Şərqi Türküstanda tətbiq edilən assimilyasiya siyasəti yalnız mədəni və etnik dəyişikliklərə səbəb olmur, həm də bölgənin sosial və iqtisadi formasına da ciddi təsir göstərir. Çinlilərinin bölgəyə köçürülməsi nəticəsində yerli əhalinin iqtisadi imkanları məhdudlaşdırılmış və sosial strukturda qeyri-bərabərlik dərinləşmişdir.

Çin hökumətinin bu siyasətinə qarşı həm yerli əhali, həm də xaricdəki diaspora mübarizə aparır. Yerli əhalinin müqaviməti və beynəlxalq səviyyədə edilən təzyiqlər, Çinin Şərqi Türküstanda həyata keçirdiyi siyasəti dəyişdirməyə çalışır, lakin Çin hökumətinin güclü nəzarəti və mərkəzləşdirilmiş idarəetmə sistemi bu müqavimətə mane olur.

Gələcəkdə, Şərqi Türküstandakı türk xalqlarının hüquqlarının qorunması, yalnız Çin hökuməinin bu siyasəti dəyişməsinə deyil, eyni zamanda beynəlxalq ictimaiyyətin bu məsələyə daha fəal yanaşmasına bağlı olacaq. Beynəlxalq təşkilat və dövlətlərin bu məsələyə münasibəti hələ də tamamilə yekdil deyil, bu da Çin hökumətinin bu siyasətini davam etdirməsinə şərait yaradır. Əgər beynəlxalq ictimaiyyət daha güclü addımlar atmazsa, Şərqi Türküstan türklərinin etnik və mədəni kimliyi tədricən yoxa çıxacaq və yerli əhalinin həyat şəraitinin daha da pisləşməsi davam edəcək. Bu səbəbdən, gələcəkdə bölgədəki assimilyasiya siyasətinə qarşı beynəlxalq səviyyədə daha sistemli və təsirli müdaxilə tələb olunur.

## Ədəbiyyat

1. Abdullayeva, Ü. (2018). Çinin xarici siyasətində Uyğur məsələsi. *Dini araşdırmalar jurnalı,* № 1, 225-233.

2. Cəfərov, R. (2012). Uyğurlar: tarixi, aqibəti Şərqi Türküstandakı yazı işarələri, mumiyalar qədimliyinə görə Misir, Şumer, Mayya mədəniyyətlərindən çox-çox əvvəllərə aid edilir. *Xalq Cəbhəsi*, 14.
3. Cəfərov, T. (2022). Şərqi Türküstan türklərinin milli-azadlıq mübarizəsi (XIX-XX əsrlər). *Türküstan qəzeti*.
4. Çakan, V. (2023). Tarixdə və günümüzdə Şərqi Türküstan Problemi. *Asiyaşünaslıq jurnalı*, № 7, 1-6.
5. İbrahimov, E (2020). Təhlükə altındakı Türk dilləri: Çinin Uyğur Türkləinə qarşı yeritdiyi dil siyasəti. *Terminalogiya məsələləri*, 78-88.
6. Kasım, R. (2023). Uyğur türklərinin Çin zülmünə qarşı varlıq mübarizəsinin qiymətləndirilməsi. *Beynəlxalq Uyğur Araşdırmaları Jurnalı*, № 21, 98-106.
7. İnayet, A. (2017). Çin-Şərqi Türküstan. *Yeni Türkiyə*, (96), 317-324.
8. Uğur. (2012). Türkəsilli xalqlar-uyğurlar Çinin idarəçiliyi altında olan Şərqi Türküstan 1,8 milyon kvadrat kilometrlik bir ərazidir. *Xalq Cəbhəsi*, 14.

**TƏBİƏT ELMLƏRİ**

**NATURAL SCIENCES**

DOI: https://doi.org/10.36719/2663-4619/113/223-227

**Ali Jafarov**
Lankaran State University
PhD in Agricultural Sciences
https://orcid.org/0000-0002-3698-7711
alicafarov1959@mail.ru
**Turan İsmailli**
Lankaran State University
Master student
https://orcid.org/0009-0005-8831-4251
ismayillituran99@gmail.com

# Spectrophotometric Properties of Salyan Plain Soils

**Abstract**

The presented article provides information on spectral reflectance. The reflection of light by soil depends on a number of chemical elements and physical properties of soils. However, a multiparameter analysis of the simultaneous influence of these factors on the spectral coefficients of soils has not yet been carried out. In general, the spectral curves of all soil types are subject to changes in certain parts of electromagnetic waves depending on the parent rocks, the amount of humus and the ratio of its forms, mechanical composition, minerals, carbonates, iron oxides, etc. This confirms the importance of studying spectrophotometric studies in soils. The article presents the results of studies of the spectrophotometric properties of Salyan plain soils depending on humus, carbonates, humidity, density, salts, etc. These indicators significantly affect the integral reflectance of soils. Thus, the greater the amount of humus in soils, the lower the spectral reflectance, and the greater the amount of carbonates and salts, the higher the spectral reflectance.

The dependence of the intensity of soil reflectance coefficients and the spectral composition on moisture content and changes in the size of their fractions indicate that it is necessary to study the color and spectral reflectance of soils within certain conditions.

In most of the works carried out in this direction, it is recommended to conduct the color and spectral reflectance of soils on air-dried soil samples with sizes between 1.0-0.01 mm.

Studying the regularity of the dependence of spectrophotometric properties on various factors allows us to eliminate some shortcomings. To increase the effectiveness of the work being done, it is necessary to quantitatively assess the response of reflection coefficients to influencing factors.

Determining the regularity of the optical properties of soils leads to the study of new information about the soil, which can be used as an additional factor in soil research.

***Keywords:*** *spectral and integrated coefficients, soil, carbonates, humus, sizes of particles*

**Əli Cəfərov**
Lənkəran Dövlət Universiteti
aqrar elmlər üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0002-3698-7711
alicafarov1959@mail.ru

**Turan İsmayıllı**
Lənkəran Dövlət Universiteti
magistrant
https://orcid.org/0009-0005-8831-4251
ismayillituran99@gmail.com

# Salyan düzü torpaqlarının spektrofotometrik xassələri

## Xülasə

Təqdim olunan məqalədə spektral əksetmə haqqında məlumat verilir. İşığın torpaqda əks olunması bir sıra kimyəvi elementlərdən və torpağın fiziki xüsusiyyətlərindən asılıdır. Lakin bu amillərin qruntların spektral əmsallarına eyni vaxtda təsirinin çoxparametrli təhlili hələ də aparılmamışdır. Ümumiyyətlə, bütün torpaq növlərinin spektral əyriləri elektromaqnit dalğalarının müəyyən hissələrində ana süxurlardan, humusun miqdarından və onun formalarının nisbətindən, mexaniki tərkibindən, minerallardan, karbonatlardan, dəmir oksidlərindən və s. asılıdır. Məqalədə Salyan düzü torpaqlarının humusdan, karbonatlardan, rütubətdən, sıxlıqdan, duzlardan və s. asılı olaraq spektrofotometrik xüsusiyyətlərinin öyrənilməsinin nəticələri təqdim olunur. Bu göstəricilər torpaqların inteqral əksetmə qabiliyyətinə əhəmiyyətli dərəcədə təsir göstərir. Belə ki, torpaqlarda humusun miqdarı nə qədər çox olarsa, spektral əksetmə qabiliyyəti bir o qədər azdır, karbonat və duzların miqdarı nə qədər çox olarsa, spektral əksetmə qabiliyyəti bir o qədər yüksəkdir.

Torpağın əks etdirmə əmsallarının intensivliyinin və spektral tərkibinin rütubətdən asılılığı və onların fraksiyalarının ölçülərinin dəyişməsi onu göstərir ki, müəyyən şərtlər daxilində qruntların rəngini və spektral əks etdirməsini öyrənmək lazımdır.

Bu istiqamətdə aparılan işlərin əksəriyyətində ölçüləri 1,0-0,01 mm arasında olan havada qurudulmuş torpaq nümunələrində qruntların rəng və spektral əks etdirilməsinin aparılması tövsiyə olunur.

Spektrofotometrik xassələrin müxtəlif amillərdən asılılığının qanunauyğunluğunun öyrənilməsi bəzi çatışmazlıqları aradan qaldırmağa imkan verir. Görülən işlərin səmərəliliyini artırmaq üçün əks əmsalların təsir edən amillərə reaksiyasını kəmiyyətcə qiymətləndirmək lazımdır.

Torpaqların optik xassələrinin qanunauyğunluğunun müəyyən edilməsi torpaq haqqında yeni məlumatların öyrənilməsinə gətirib çıxarır ki, bu da torpaq tədqiqatında əlavə amil kimi istifadə oluna bilər.

***Açar sözlər:*** *spektral və inteqral əmsallar, torpaq, karbonatlar, humus, hissəciklərin ölçüləri*

## Giriş

Salyan düzü Kür-Araz ovalığının cənub-şərq hissəsində yerləşən və əsasən allüvial-akkumulyativ mənşəli düzənlikdən ibarət olan bir ərazidir. Bu düzənlik Xəzər dənizi, Kür çayı və onun qolları ilə sərhədlənir. Sahəsi 149 min hektara qədər olan bu ərazinin relyefi əsasən düzənlik xarakterlidir, lakin bəzi çökəkliklər müşahidə olunur.

İqlim xüsusiyyətlərinə görə Salyan düzü yayı quraq keçən mülayim-isti yarımsəhra və quru çöl iqlim tipinə aiddir. Orta illik temperatur 14,5°C, yağıntının illik miqdarı isə 250-350 mm arasında dəyişir. Torpaq səthində buxarlanma yüksəkdir və illik göstərici 900-1100 mm-ə çatır. Bu amillər Salyan düzü torpaqlarının xüsusiyyətlərinə və onların spektral xassələrinə ciddi təsir göstərir (Gulaliyev, Kocharli, Jafarov, 2022).

**Tədqiqat**

Torpaqəmələgəlmə prosesinə təsir edən əsas amillər arasında ərazinin geomorfoloji quruluşu, iqlim şəraiti, bitki örtüyü və qrunt sularının səviyyəsi mühüm rol oynayır. Bu amillər torpaq örtüyünün müxtəlifliyinə səbəb olmuş və Salyan düzündə boz-çəmən, boz, çəmən-bataqlıq və şoran torpaq tiplərinin formalaşmasına gətirib çıxarmışdır.

Son illərdə spektral tədqiqatlar torpaq xassələrinin məsafədən öyrənilməsinə geniş imkanlar yaradır. Torpağın spektral əksetmə qabiliyyəti onun fiziki və kimyəvi xassələri, o cümlədən humus,

karbonat və duzların miqdarı ilə sıx əlaqədardır. Bu məqalədə Salyan düzü torpaqlarının spektral xüsusiyyətləri tədqiq ediləcək, onların əsas amillərlə əlaqəsi öyrəniləcəkdir (Gülalıyev, Köçərli, Cəfərov, 2022).

Torpaqların spektral əksetmə qabiliyyəti onların optik xüsusiyyətləri ilə sıx bağlıdır. Salyan düzü torpaqlarının spektral xassələrinin tədqiqi göstərmişdir ki, torpaq tipindən, humus və karbonat miqdarından asılı olaraq spektral əksetmə əmsalları fərqlənir.

Humus torpağın spektral əksetmə qabiliyyətinə mühüm təsir göstərir. Salyan düzü torpaqlarında humusun miqdarı 1,5-4,8% arasında dəyişir. Müəyyən edilmişdir ki, torpaqda humus miqdarı artdıqca spektral əksetmə azalır. Xüsusilə 4,5%-ə qədər humus artımı inteqral əksetmənin azalmasına səbəb olur. 4,5%-dən sonra isə humus miqdarının artımı spektral əksetməyə çox az təsir göstərir.

Bu azalma üzvi maddələrin işığı udma qabiliyyəti ilə izah edilir (Gerayzadeh, Jafarov, 2013).

Torpaqda $CaCO_3$ (kalsium karbonat) miqdarının artması spektral əksetməni artıran amillərdən biridir. Salyan düzü torpaqlarında karbonatın miqdarı 6-10% arasında dəyişir. Boz-çəmən torpaqlarda karbonatlıq artdıqca spektral əksetmə qabiliyyəti də artır. Məsələn, 5,7% $CaCO_3$ olan üst qatda spektral əksetmə 29,9% təşkil edirsə, karbonatlıq 11,0%-ə çatdıqda bu göstərici 34,6%-ə yüksəlir.

Karbonatlıq artdıqca boz-çəmən torpaqlarda inteqral əksetmə qabiliyyəti də artır. Boz-çəmən torpaqda yuxarı qatda $CaCO_3$ 5,6 % olduqda inteqral əksetmə 34,2 % olur. 16-48 sm-də isə karbonatlıq 12,1 %-ə qədər artdıqda, inteqral əksetmə 34,5 % qədər dəyişir. Başqa kəsimdə üst qatda karbonatlıq 11,8 % olduğu halda, $R_{\sum}$ -39,5 %-dir. Aşağıya doğru getdikcə, yəni (76-115 sm) karbonatlıq 20,3 %-ə qədər artdıqda inteqral əksetmə qabiliyyəti 42,5 %-yə qədər dəyişir (Kocharli, Gulaliyev, Jafarov, 2022).

Karbonatlığın artması ilə əlaqədar olaraq inteqral əksetmənin artması boz-çəmən torpaqlarda da müşahidə olunur. Bu isə aşağıdakı intervalda dəyişir. Bir kəsimdə üst qatda karbonatlıq 11,1 % olduqda $R_{\sum}$ -33,8 %-dir. Aşağı horizontda karbonatlıq 15,5 % qədər artdıqda $R_{\sum}$ -37,9 % kimi dəyişir. Bu dəyişmə başqa kəsimlərdə də öz əksini tapır.

Apardığımız tədqiqatlar göstərmişdir ki, inteqral əksetmənin karbonatlıqdan asılılığı çəmən bataqlıq torpaqlarda da özünü göstərir. Çəmən bataqlıq torpaqlarda üst qatda (0-30 sm) $CaCO_3$-ın miqdarı 7,3 % olduqda inteqral əksetmə 28,0 % olur. 30-45 sm-də $CaCO_3$-ın miqdarı 12,6-ə qədər dəyişdikdə $R_{\sum}$-37,5 %-ə kimi dəyişir. 45-90 sm-də karbonatlıq 14,2 % olduqda $R_{\sum}$ -41,8 % olur. Belə aydın olur ki, çəmən bataqlıq torpaqda karbonatlıq 21 dəfə artdıqda 1,5 dəfə artır (Jafarov, 2010).

Şoran torpaqlarda isə inteqral əksetmənin karbonatlıqdan asılığı özünü göstərir üst qatda (0-25 sm) karbonatlıq 11,0 % olduğu halda inteqral əksetmə 39,3 % olur. Aşağı qatda isə $CaCO_3$ 11,2 %-ə qədər artdıqda $R_{\sum}$ -46,2 % qədər artır.

Alınan nəticələrdən aydın olunmuşdur ki, torpaqlarda humus, aqreqatlar, karbonatlıq onların inteqral əksetmə qabiliyyətinə əhəmiyyətli dərəcədə təsir göstərirlər. Digər təsir edən amillərdən biri də torpaqda quru duz qalığının miqdarıdır. Eyni zamanda Cl %-in və Na+K miqdarı da əksetmə əmsalına öz təsirlərini göstərirlər. Belə ki, torpaqda duzların miqdarı artdıqca inteqral əksetmə artır. Torpağın inteqral əksetmə qabiliyyəti duzların miqdarından asılıdır (Belyayev, Kazyak, Khrushcheva, 2016).

Salyan düzü torpaqlarında duzlaşma geniş yayılmışdır. Torpaqda duzların ($Na^+$, $K^+$, $Cl^-$ və s.) miqdarının artması spektral əksetmə qabiliyyətini artırır. Belə ki, torpaqda quru duz qalığının miqdarı 1% artdıqda spektral əksetmə 4-6% artır. Xüsusilə şoran torpaqlarda spektral əksetmə qabiliyyəti daha yüksəkdir.

Torpağın rütubətliliyi spektral əksetmə qabiliyyətinə təsir göstərən mühüm amildir. Nəmlik artdıqca spektral əksetmə azalır. Hidroskopik nəmlik spektral tədqiqatlar zamanı nəzərə alınmalı olan vacib parametrlərdən biridir. Digər mühüm amillərdən biri də torpaq aqreqatlarının ölçüsüdür. Kiçik ölçülü aqreqatlar daha yüksək spektral əksetmə qabiliyyətinə malikdir (Orlov, Sukhanova, Rozanova, 2001).

Torpaqların spektral xüsusiyyətlərinə əsasən Salyan düzündə 3 əsas qrup müəyyən edilmişdir:

1. İnteqral əksetmə əmsalı 35%-dən aşağı olan torpaqlar – ərazinin 45,6%-ni təşkil edir.
2. İnteqral əksetmə əmsalı 35-40% olan torpaqlar – 47% ərazini əhatə edir.

3. İnteqral əksetmə əmsalı 40%-dən çox olan torpaqlar – əsasən şoran torpaqları əhatə edir və ərazinin yalnız 3,1%-ni təşkil edir.

Bu qruplaşdırma torpaqların məsafədən öyrənilməsi və spektral diaqnostikası üçün vacibdir.




**Şəkil. Salyan düzü torpaqların üst qatlarının spektral əyriləri**

Torpağın rütubətliyi spektral əksetməyə təsir edən əsas amillərdən biridir. Belə ki, rütubət artdıqca spektral əksetmə azalır. Quru torpaq daha çox işıq əks etdirir, yaş torpaq isə daha çox udur.Quru torpaq (5% nəm) – spektral əksetmə 40%, rütubətli torpaq (15% nəm) – spektral əksetmə 30%. Bu məlumatlar torpağın nəmlik səviyyəsinin məsafədən qiymətləndirilməsi üçün istifadə edilə bilər (Karmanov, 1974).

## Nəticə

Aparılan tədqiqatlar göstərir ki, Salyan düzü torpaqlarının spektral xassələri onların fiziki və kimyəvi göstəricilərindən asılıdır. Torpaqda humus miqdarının artması spektral əksetməni azaldır, karbonat və duzların miqdarı isə əksinə, spektral əksetmə qabiliyyətini artırır. Torpağın rütubətliyi və aqreqatların ölçüsü də bu göstəriciyə təsir göstərən əsas amillərdir.

Torpaq spektral xassələrinin xəritələşdirilməsi və məsafədən öyrənilməsi kənd təsərrüfatında və torpaq idarəçiliyində mühüm rol oynayır. Bu tədqiqatlar torpaq resurslarının səmərəli istifadəsinə və onların münbitliyinin qorunmasına töhfə verir.

## Ədəbiyyat

1. Belyayev, B. I., Kazyak, Ye. O., Khrushcheva, Ye. O. (2016). *Issledovaniye sezonnoy dinamiki spektral'nootrazhatel'nykh svoystv agrokul'tur Belarusi na osnove polevogo spektrometrirovaniya i materialov distantsionnogo zondirovaniya Zemli.* Zemlya Belarusi. №2, 42-46.
2. Gulaliyev, Ch. G., Kocharli, S. A., Jafarov, A. M. (2022, june 04-06). The possibility of using spectral reflectance in soil surveys. *Agro international conference on agriculture.* Proceedings book, Azerbaijan State Agrar University, 446.
3. Gülalıyev, Ç. G., Köçərli, S. Ə., Cəfərov, Ə. M. (2022, noyabr 20-30). Torpaq müxtəlifliyinin öyrənilməsində optik xassədən istifadə. Coğraf. müasir.prob. *Beynəl. elmi-prakt. konf. Mat. I c.* Bakı, 122-128.

4. Gerayzadeh, A. P., Jafarov, A. M. et al. (2013). Soil Spektrophotometric characteristics use possililities in Control Conditions. *Soil Water Jurnal*, v2, N2(1), 1119-1126.
5. Kocharli, S. A., Gulaliyev, Ch. G., Jafarov, A. M. et al. (2022). Light reflection properties of Salyan plain soils. *News Bulletin "Natural and Technical Sciences" series*, N3 (86). Ganja, 101-107.
6. Jafarov, A. M. (2010). *Spectrophotometric methods of soil analysis*. Avstraliya, 178.
7. Karmanov, I. I. (1974). *Spektral'naya otrazhatel'naya sposobnost' i tsvet pochv na pokazateli ikh svoystva*. M., 351.
8. Orlov, D. S., Sukhanova, N. I., Rozanova, M. S (2001). *Spektral'naya otrazhatel'naya sposobnost' pochv i ikh komponentov*. M.: Izdatel'stvo MGU, 176.

DOI: https://doi.org/10.36719/2663-4619/113/228-232

**Şəbnəm Abbasova**
ADPU-nun Ağcabədi filialı
https://orcid.org/0009-0005-0603-6340
abbasova.shabnam@hotmail.com

# Neyroplastikliyin beyin yaşlanmasını önləmədə rolu

**Xülasə**

Beyin, həyat boyu dəyişkən bir orqan olub, müxtəlif faktorların təsiri altında funksional və struktur dəyişikliklərə məruz qalır. Yaşlanma prosesi də bu dəyişiklikləri gücləndirir, amma beynin neyroplastik qabiliyyəti, bu dəyişiklikləri qarşısını almağa və ya yavaşlatmağa kömək edə bilər. Beynin yaşlanmasına qarşı neyroplastiklik, müxtəlif beyin funksiyalarının qorunmasında və bərpasında həlledici rol oynayır. Bu məqalədə, yaşlanma prosesinin beyinə təsiri, neyroplastikliyin qoruyucu funksiyaları və beyində yaşlanmaya qarşı bu təbii mexanizmin təkmilləşdirilməsi yolları araşdırılacaqdır.

Sinir plastikliyi beyin və ya sinir sistemindəki strukturlarda funksional və quruluş baxımından dəyişilə bilməsi, daxili və xarici stimullara cavab vermək qabiliyyəti kimi müəyyən edilir. Ən sadə formada sinir sistemi hüceyrələrinin sayı artmadan dəyişmə qabiliyyətidir. Xaricdən və ya daxildən bir stimul verilən neyron, ətrafındakı digər neyronları stimullaşdırır və onların neyroplastik dəyişikliklərə məruz qalmasına səbəb olur. Beləliklə, plastiklik hüceyrə səviyyəsi ilə məhdudlaşmır, molekulyar quruluşdan sistemlərə və hətta davranışa qədər bir çox sahəyə təsir göstərir

***Açar sözlər*:** *neyroplastiklik, sinir plastikliyi, beyin yaşlanması, yeni neyronların əmələ gəlməsi, yaşla bağlı sinir hüceyrələrinin inkişafı*

**Shabnam Abbasova**
ADPU Aghjabadi Branch
https://orcid.org/0009-0005-0603-6340
abbasova.shabnam@hotmail.com

# The Role of Neuroplasticity in Preventing Brain Aging

**Abstract**

The brain is a dynamic organ that undergoes functional and structural changes throughout life under the influence of various factors. The aging process also enhances these changes, but the brain's neuroplasticity can help prevent or slow down these changes. Neuroplasticity plays a crucial role in protecting and restoring various brain functions against brain aging. This article will examine the effects of the aging process on the brain, the protective functions of neuroplasticity, and ways to improve this natural mechanism against aging in the brain.

Neural plasticity is defined as the ability of structures in the brain or nervous system to change functionally and structurally, and to respond to internal and external stimuli. In its simplest form, it is the ability of the nervous system to change without increasing the number of cells. A neuron that is stimulated from the outside or inside stimulates other neurons around it and causes them to undergo neuroplastic changes. Thus, plasticity is not limited to the cellular level, but affects many areas, from molecular structure to systems and even behavior.

***Keywords:*** *neuroplasticity, neural plasticity, brain aging, formation of new neurons, age-related development of nerve cells*

## Giriş

Plastikliklə bağlı bir çox tədqiqatlar aparılır və onların ümumi məqsədi beyin zədələrini bərpa etmək, bəzi nevroloji xəstəliklərin müalicəsi, öyrənmə qabiliyyətini artırmaq və itirilmiş beyin

funksiyalarını bərpa etməkdir. Depressiya və şizofreniya kimi psixi pozğunluqlarda; mərkəzi sinir sisteminin zədələnməsi və insult kimi neyrodegenerativ xəstəliklərdə; serebral iflic kimi uşaq inkişaf pozğunluqlarında istifadə edilən nevroloji reabilitasiya; Sinir plastikliyinin təsir mexanizmləri sayəsində xəstələrdə funksiya itkisini azaldır və xəstələrin sağalmasını təmin edir. Yaşlanmanın beyin funksiyalarına təsiri müxtəlif Ali psixi funksiyalarınləngiməsi və geriləməsi kimi təzahür edir.

**Tədqiqat**

1970-ci illərdə beyində yalnız doğuş zamanı və ondan sonrakı qısa müddət ərzində sinir plastikliyinin olduğu qəbul edilirdi. Lakin sonrakı tədqiqatlar çox maraqlı nəticələr verdi (Bener, Bonhoeffer, Planck, 2014). Meymunlar üzərində aparılan bu araşdırmalarda meymunların barmaqlarından necə istifadə etdiyi və beyin bölgəsindəki təsir sahələri araşdırılıb. Bir araşdırmada, bir meymunun barmağı kəsildi və təsirli beyin sahəsi qiymətləndirildi. Bir müddət sonra, qonşu barmaqlardan gələn sensor girişlərin amputasiya edilmiş barmağın sahəsinə işləndiyi görüldü. Daha sonra, bu araşdırmaya əlavə olaraq, başqa bir araşdırmada meymunun iki barmağı bir-birinə tikilib və barmaq ucları eyni anda stimullaşdırılıb. Nəticədə, bir müddət sonra iki barmağı təmsil edən beyin hissəsinin tək bir barmağın təsir sahəsinə çevrildiyi görüldü.

Ümumiyyətlə sinir plastikliyi; inkişaf plastikliyi (öyrənmə və yaddaş), reaktiv plastiklik (qısamüddətli təcrübədən sonra), degenerativ plastiklik (uzunmüddətli təcrübədən sonra) və bərpa plastikliyi (zədələnmiş neyronun bərpası) kimi təsnif edilə bilər (Noble, Houston, Brito, 2015).

İnkişafın plastikliyi: İnkişaf zamanı ətraf mühitin qarşılıqlı təsiri nəticəsində baş verən sinir əlaqələrindəki dəyişikliklərə, həmçinin öyrənmə prosesi zamanı yaranan sinir dəyişikliklərinə aiddir. Başlanğıcda genetik olaraq idarə olunsa da, sonrakı dövrlərdə ətraf mühit stimulları da təsirli olur. Buraya hüceyrə çoxalması, miqrasiyası, sinaps əmələ gəlməsi, budama və miyelinləşmə daxildir (Özcan, Arpacıoğlu, Turan, 2000; Noble, Houston, Brito, 2015).

Reaktiv plastiklik: təkrarlanan neyron fəaliyyəti ilə artdıqda neyrotransmitterin artması baş verir. Daha çox məşq və təkrarlar artdıqca depressiya və narahatlığın bu prosesi azaltdığı ifadə edilir.

Degenerativ plastiklik: Uzun müddətli postsinaptik tətbiqlərlə gen səviyyəsində dəyişikliklərlə baş verir. Transkripsiya faktorlarının aktivləşdirilməsi yeni böyümə faktorlarının, ion kanallarının, struktur molekulların və neyronların birləşməsini dəyişdirmək üçün zəruri olan digər zülalların genetik diferensiallaşması ilə nəticələnir (Özcan, Arpacıoğlu, Turan, 2000; Noble, Houston, Brito, 2015; Gibb, Gonzalez, Kolb, 2014).

Bərpa plastikliyi: zədələnmiş beyin toxumasında degenerasiya, regenerasiya, yenidən təşkil və nəticədə funksiyanın bərpası bu növ sinir plastikliyi vasitəsilə baş verir (Gibb, Gonzalez, Kolb, 2014).

Sinir plastikliyi sayəsində beyində yeni neyronların əmələ gəlməsi və sinaptik əlaqələrin sayının artması ətraf mühitdəki dəyişikliklərə və mümkün zərərlərə neyrofiziki və neyrokimyəvi uyğunlaşmanı inkişaf etdirmək qabiliyyətini təmin edir. Bu vəziyyətdə öyrənmə və yaddaş kimi mühüm funksiyaların əldə edilməsində təsirli olan sinir plastikliyinin iki şəkildə meydana gəldiyi irəli sürülüb. Bunlar:

1. Neyron strukturunda və sayındakı artım.
2. Neyronlararası sinapslarda artım.

Neyroplastiklik 1-2 yaşda görmə-məkan, görmə-hissi və motor bacarıqları, xüsusən də korpus kallozumda liflərin və beyin yarımkürələri arasında digər əlaqələrin artması ilə baş verir. Sonrakı yaşlarda (2-12 yaş arası) nitq mərkəzlərində plastiklik daha çox nəzərə çarpır (Ming, Hongjun, 2011).

Sinir plastikliyinin çox təsirli olduğu öyrənmədə yeni sinaptik əlaqələrin qurulması çox vacibdir. Öyrənilməsi lazım olan yeni məlumatın qalıcılığını təmin etmək üçün gündə 400 dəfə təkrarlanması lazım olduğunu göstərən araşdırmalar var. Tədqiqatlar göstərmişdir ki, təkcə təkrar deyil, həm də təkrarın diversifikasiyası və modifikasiyası daha çox sinaptik əlaqələr yaradır (Gürpınar, Erol, Mete, 2007).

Öyrənmək, yadda saxlamaq və unutmaq qabiliyyətini idarə edən neyroplastikliyin ən çox müşahidə olunduğu beyin bölgələri hipokampus, amigdala, qoxubilmə mərkəzi və frontal korteksdir. Bundan əlavə, hipokampusdakı subqranulyar zona (SGZ) və subventrikulyar zona (SVZ) sinir kök hüceyrələrinin əmələ gəldiyi və neyroplastikliyin intensiv olduğu bölgələrdir (Gürpınar, Erol, Mete, 2007). Hər növ zehni məşqlə hipokampusun həcminin və sinir plastikliyinin artması müşahidə olunur.

Bundan əlavə, tədqiqatlar erkən uşaqlıqda frontal korteksdəki əlaqələrin sayının böyüklərdən daha çox olduğunu müəyyən etmişlər.

Sinir plastikliyinin formalaşması bir sıra reaksiyalardan sonra baş verir və hər növ üçün müxtəlif formalarda və müddətlərdə baş verir. Bu reaksiyaların əsas elementi sinir kök hüceyrələridir. Əvvəlcə, sinir kök hüceyrələri əmələ gəlir və hüceyrə uzantıları inkişaf edir. Sonra qütbləşmə baş verir və ətrafdakı neyronlarla afferent və efferent əlaqələr qurulur. Əlaqələrin sayı artdıqca sinir plastikliyi artır. Bu dövrdə neyronlarda səth reseptorları da inkişaf etməyə başlayır. Bu formalaşmada rol oynayan ən əhəmiyyətli neyrotransmitter bədənimizdəki digər zülalların quruluşunda da iştirak edən bir amin turşusu olan glutamatdır. Qlutamat beyində ən çox yayılmış neyrotransmitterdir və neyronlara stimullaşdırıcı təsir göstərir. Kimyəvi sinapslarda glutamat vakuollarda saxlanılan və fəaliyyət potensialı meydana gəldiyi zaman neyrondan sinaptik boşluğa buraxılan mühüm protein strukturudur (Marsden, 2016).

Yaşlanma prosesi beyində bir sıra funksional və struktur dəyişikliyə səbəb olur. Beyinin müəyyən hissələrində, xüsusən də hipokampus (yaddaş və öyrənmə mərkəzi) və prefrontal korteks (qərar vermə və planlaşdırma ilə bağlı sahə) funksiyalarında azalmalar baş verir. Bu dəyişikliklərdən ən çox rast gəlinən aşağıdakılardır:

Yaddaşın zəifləməsi halı baş verir. Yaşlanma ilə əlaqədar olaraq neyronlararası sinaptik əlaqələr zəifləyir. Bu da öz növbəsində məlumatın ötürülməsinin ləngiməsinə, yaddaşın azalmasına və öyrən-mə sürətinin yavaşlamasına səbəb olur. Beyin həcminin kiçilməsi baş verir. Bu hal sinir hüceyrələri arasında əlaqələrin itməsi və sinaptik plastikliyin azalması nəticəsində olur. İntellektual funksiyaların azalması, qərar vermə, diqqət və anlamada çətinliklər yaşanır. Neyroplastikliyin yaşlanmaya qarşı müdafiə mexanizmi kimi çox əhəmiyyətli rolu ola bilər. Beyin yaşlandıqca, onun plastiklik qabiliyyəti azalır. Lakin, müasir tədqiqatlar göstərir ki, neyroplastiklik, beyinin yaşlanmasına qarşı bir müdafiə mexanizmi kimi fəaliyyət göstərə bilər. Beynin müxtəlif bölgələrində sinaptik əlaqələrin dəyişməsi, sinir hüceyrələrinin bərpası və yeni əlaqələrin formalaşması yaşlı insanlarda belə mümkündür.

Bu qabiliyyətlər, yaşlanmanın təsirlərini yavaşlatmaq və ya geri çevirmək potensialına malikdir. Yaşlanmaya qarşı neyroplastikliyi aktivləşdirmənin bir sıra yolları vardır.Sadə dillə desək, stimul sinir sisteminə çatdıqda bir sıra biokimyəvi və fizioloji reaksiyalar baş verir. DNT transkripsiyası, bəzi zülalların və böyümə faktorlarının sintezi, neyron sinapsların təşkili, reseptorların stimullaş-dırılması və hüceyrədaxili dəyişikliklər kimi çoxsaylı mexanizmlər işə düşür. Genetik faktorlar, yaş, fəaliyyət tezliyi, cins, fəaliyyət növü və müvafiq beyin bölgəsi sinir plastikliyinə birbaşa təsir edən amillərdəndir.

Tanış və rutin fəaliyyətlərdən kənara çıxan müxtəlif davranışlarla məşğul olmaq sinir plastikliyi baxımından çox vacibdir. Sınaq edilməmiş fəaliyyətlərlə məşğul olmaq və ya monoton həyatdan çıxmaq, neyronlarda müxtəlif əlaqələr yaratdığından sinir plastikliyini tətikləyən ən mühüm amillərdən biridir.

Bəzi fəaliyyətlərin erkən yaşlarda mənimsənilməsi göstərir ki, bu yaşlarda plastiklik daha çoxdur. Beynin daha həssas və stimullara açıq olduğu dövrlər kritik dövrlər və ya həssas dövrlər olaraq təyin olunur. Erkən uşaqlıq və körpəlik dövrləri nevroplastikliyin ən yüksək olduğu dövrlərdir. Bu dövrlərdə müəyyən bir hədəfi hədəfləyən daha çox tədqiqat olduğu üçün bu, müxtəlif sahələrdə də mühüm nəticələr verir (Hyde, Lerch, Norton, Forgeard, Winner, Evans, Schlaug, 2009).

Erkən uşaqlıq dövründə beyində bir çox istiqamətdə inkişaf baş verir. Beynin görmə, eşitmə, motor bacarıqları və dil bacarıqları ilə əlaqəli bölgələrində sinir plastikliyinin xüsusilə intensiv olduğu müşahidə edilmişdir. Məsələn, müəyyən edilmişdir ki, uşaqlarda musiqi ilə bağlı məşq xüsusilə beynin fronto-parietal bölgəsində sinir plastikliyini artırır. Bəzi tədqiqatlar uşaqlıq dövründə frontal lobda sinaptik əlaqələrin və neyronların fəaliyyətinin yetkin bir fərddən təxminən iki dəfə çox olduğunu müəyyən etmişdir.

Fiziki məşq, təhsil, sosial qarşılıqlı əlaqə və bütün növ idrak fəaliyyətləri sinir plastikliyini artırır. Fiziki məşqlər, beyin funksiyalarını yaxşılaşdırmaq və neyroplastikliyi təşviq etmək üçün effektiv bir vasitədir. Aerobik məşqlər, məsələn, qaçış və velosiped sürmə, hipokampusda neyrogenesisi artırır və yaddaşın qorunmasına kömək edir. Yaddaş oyunları, təhlil və problem həll etmə fəaliyyətləri

beyində sinaptik əlaqələrin güclənməsinə kömək edə bilər. Zehni fəaliyyətlər beyinin adaptiv qabiliyyətlərini artırmağa və yaşlanmanın mənfi təsirlərinə qarşı müqavimət yaratmağa imkan verir. Sosial əlaqələr və stimulativ fəaliyyətlər beyin funksiyalarını qorumaqda mühüm rol oynayır. İnsanlar, yeni bacarıqlar öyrənmək, musiqi ifa etmək və ya yeni dillər öyrənmək kimi fəaliyyətlərlə beyin fəaliyyətini artırmalıdırlar. Düzgün Qidalanma, Omega-3 yağ turşuları, antioksidantlar və vitaminlər beyinin sağlamlığını qorumaq və neyroplastikliyi artırmaq üçün vacibdir. Qidalanmada zəngin bir pəhriz beyinin yaşlanma prosesini ləngidə bilər.

Əksinə, beyində mənfi morfoloji dəyişikliklərə və dendritik əlaqələrin azalmasına səbəb olan keyfiyyətsiz yuxu, pis qidalanma, asılılıq yaradan maddələrdən istifadə, narahatlıq və depressiya sinir plastikliyinin formalaşmasına mənfi təsir göstərir. Bundan əlavə, uzunmüddətli stressə məruz qalan insanlarda beyindəki hipokampusun həcminin və neyronlarının azalması müşahidə edilmişdir. Xroniki stress yaşayan fərdlərdə hipokampusda zədələnmə baş verir və stress hormonlarının artması nəticəsində yaranan qlükokortikoidlərin artması səbəbindən beyində ötürülməni təmin edən strukturlar zədələnir və nəticədə hüceyrə ölümü baş verir. Dendrit strukturlarını pozan və onların sayını azaldan stress faktorları neyronların çoxalma qabiliyyətini pozur və sinir plastikliyinə mənfi təsir göstərir (Coskun, Wu, Blanchi, 2008; Drapeau, Montaron, Aguerre, 2007; Taştan, 2020). Yoga, meditasiya və digər rahatlama texnikaları stressin idarə edilməsinə kömək edir, bu da beyin sağlamlığını qoruya bilər.

## Nəticə

Sinir plastikliyi son illərdə ən çox müzakirə olunan mövzulardan biridir. Neyrologiya sahəsində aparılan araşdırmalar sübut etmişdir ki, beyin inkişafı müəyyən bir nöqtədə dayanmayan, xarici stimullar və bədəndəki inkişafla dəyişən və təkmilləşən bir orqandır və hətta qocalıqda da inkişaf etmək qabiliyyətinə malikdir.

Sinir plastikliyi üçün həssas bir dövr hesab edilən erkən uşaqlıq dövrü bir çox inkişaf və dəyişiklik baxımından daha diqqətlə qiymətləndirilməlidir. Bu dövrdə öyrənmə və yaddaş kimi fizioloji proseslərdə sinir plastikliyinin daha çox olduğunun fərqində olmaqla, normal inkişaf edən uşaqlarda beyin inkişafını istiqamətləndirmək mümkün ola bilər. Daha da önəmlisi, uşaqlıqda neyro-degenerativ xəstəliklər, inkişaf geriliyi, əqli gerilik kimi hallarda müalicə və reabilitasiya prosesinin erkən başlaması sinir plastikliyinin inkişafı üçün çox vacibdir. Bundan əlavə, Unutmaq olmaz ki yaşlı xəstələr üçün də sinir plastikliyi davam edir və müalicə üçün hər zaman şans var.

Keyfiyyətsiz yuxu, pis qidalanma, maddə istifadəsi, narahatlıq, depressiya və stress sinir plastic-liyinə mənfi təsir göstərir. Xüsusilə güclü stressə məruz qalan fərdlərdə beyindəki neyronların və sinaptik əlaqələrin sayı azalır və beynin plastiklik qabiliyyəti pozulur.

Həm neyrodegenerativ xəstəliklərin müalicəsində müxtəlif müalicələr istehsal etmək, həm də struktur və funksional olaraq normal beyin inkişafını dəstəkləmək üçün sinir plastikliyini inkişaf etdirə bilmək çox vacibdir.

## Ədəbiyyat

1. Bener, H., Bonhoeffer, T., Planck, M. (2014). *Neuronal Plasticity: Beyond the Critical PeriodMark Institute of Neurobiology*, 4: 10-35.
2. Coskun, V., Wu, H., Blanchi, B. (2008). Neural Stem Cells in The Ependyma Of Mammalian Postnatal Forebrain. *Natl. Acad. Sci*, 105:1026-1031.
3. Drapeau, E., Montaron, M. F., Aguerre, S. (2007). Learninginduced Survival of New Neurons Depends on The Cognitive Status of Aged Rat. *J. Neurosci*. 27: 6037- 6044.
4. Özcan, O., Arpacıoğlu, O., Turan, B. (2000). *Nörorehabilitasyon*, 7-25.
5. Noble, K. G., Houston, S. M., Brito, N. H., et al. (2015). *Family income, parental education and brain structure in children and adolescents. Nat Neurosci*, 18: 773–8.
6. Gibb, R., Gonzalez, C., Kolb, B. (2014). Prenatal enrichment and recovery from perinatal cortical damage: effects of maternal complex housing. *Front Behav Neurosci*, 8: 223.
7. Ming, G., Hongjun, S. (2011). Adult Neurogenesis in The Mammalian Brain: Significant Answers and Significant Questions. *J Neuron*, 70: 687-702.

8. Gürpınar, D., Erol, A., Mete, L. (2007). Depresyon ve Nöroplastisite. *Klinik Psikofarmakoloji Bülteni*, 17, 100-110.
9. Marsden, W. N. (2016). Synaptic plasticity in depression: Molecular, cellular and functional correlates. *Molecular, cellular and functional correlates, Progress in Neuro Psychopharmacology & Biological Psychiatry*, http://dx.doi.org/10.1016/j.pnpbp.2012.12.012.
10. Hyde, K. L., Lerch, J., Norton, A., Forgeard, M., Winner, E., Evans, A. C., Schlaug, G. (2009). The effects of musical training on structural brain development. *Annals of the New York Academy of Sciences*, 1169(1), 182-186.
11. Taştan, N. S. (2020). Neyroplastikliyin Təsirləri üzrə Təhsil Proqramı və Yeni Texnika Təklifi: Süpürmə Texnikası. *OTU Sosial Elmlər Jurnalı*, 10 (1), 228-251.

DOI: https://doi.org/10.36719/2663-4619/113/233-236

**Alimə Musayeva**
Əziz Əliyev adına Azərbaycan Dövlət Həkimləri
Təkmilləşdirmə İnstitutu
https://orcid.org/0009-0001-9121-0833
dr.alimaphd@mail.ru

# Ortodontiyada sinif anomaliyaları: etiologiya, diaqnostika, tədqiqat və müalicə metodları

**Xülasə**

Sinif anomaliyaları ortodontiyada ən çox rast gəlinən anomaliya növlərindəndir və müxtəlif skelet, diş və funksional amillər nəticəsində yaranır. Bu məqalədə Angle təsnifatına əsasən I, II və III sinif anomaliyalar araşdırılır, onların etiologiyası, diaqnostikası və müalicə metodları izah edilir. Bundan əlavə, 50 pasiyent üzərində aparılmış klinik tədqiqatın nəticələri təqdim olunur. Tədqiqatlar sinif anomaliyalarının genetik və ətraf mühit faktorlarının təsirini daha dərindən araşdırmalı, müalicə üsullarının uzunmüddətli effektivliyini qiymətləndirməlidir. Ortodontik anomaliyaların qarşısının alınması və erkən mərhələdə aşkarlanması üçün daha genişmiqyaslı tədqiqatlara ehtiyac vardır.

***Açar sözlər:*** *sinif anomaliyaları, anomaliya, ortodontik müalicə, Angle təsnifatı, diş, çənə*

**Alima Musayeva**
Aziz Aliyev Azerbaijan State Institute of Advanced
Training of Doctors
https://orcid.org/0009-0001-9121-0833
dr.alimaphd@mail.ru

# Class Anomalies in Orthodontics: Etiology, Diagnosis, Research and Treatment Methods

**Abstract**

Class malocclusions are among the most common types of anomalies encountered in orthodontics and result from various skeletal, dental, and functional factors. This article investigates Class I, II, and III malocclusions based on Angle's classification, explaining their etiology, diagnosis, and treatment methods. Additionally, the results of a clinical study conducted on 50 patients are presented. Further research should explore the impact of genetic and environmental factors on class malocclusions in greater depth and evaluate the long-term effectiveness of treatment methods. Broader studies are needed to improve the prevention and early detection of orthodontic anomalies.

***Keywords:*** *class malocclusions, anomaly, orthodontic treatment, Angle classification, teeth, jaw*

## Giriş

Ortodontiya, diş və çənə problemlərinin diaqnozu, qarşısının alınması və müalicəsi ilə məşğul olan stomatologiyanın bir sahəsidir. Diş və çənə strukturlarının düzgün yerləşməməsi həm estetik, həm də funksional problemlərə səbəb ola bilər. Ortodontik anomaliyalar təkcə dişlərin nizamsız düzülüşü ilə məhdudlaşmır, eyni zamanda çənə sümüyünün inkişaf pozğunluqları, dişlərin düzgün bağlanmaması və çeynəmə sistemindəki uyğunsuzluqlar kimi daha ciddi problemləri də əhatə edir.

**Tədqiqat**

Ortodontiyada sinif anomaliyaları dişlərin və çənənin düzgün əlaqəsinin pozulması nəticəsində yaranan patologiyalardır. Bu anomaliyalar pasiyentlərin gündəlik həyatına təsir edərək çeynəmə, nitq və həzm problemlərinə səbəb ola bilər. Bundan əlavə, dişlərin düzülüşündəki pozğunluqlar diş çürüməsinə və diş əti xəstəliklərinə gətirib çıxara bilər. Edward Angle tərəfindən təqdim olunan təsnifata əsasən, anomaliyalar üç əsas sinifə bölünür (Proffit, & Fields, 2018):

• I Sinif anomaliya: Normal molar əlaqə saxlanılsa da, ön dişlərdə sıxlıq və ya digər nizamsızlıqlar mövcuddur.

• II Sinif anomaliya: Üst çənənin alt çənəyə nisbətən irəlidə yerləşməsi ilə xarakterizə olunur (overjet artımı).

• III Sinif anomaliya: Alt çənənin üst çənəyə nisbətən irəlidə yerləşməsi (proqnatizm) ilə müşahidə edilir.

Bu tədqiqatın məqsədi sinif anomaliyalarının yaranma səbəblərini araşdırmaq, diaqnostika üsullarını və effektiv müalicə metodlarını təhlil etməkdir. Xüsusilə, ortodontiyada tətbiq olunan müasir texnologiyalar, rəqəmsal diaqnostika və innovativ müalicə üsulları ətraflı şəkildə müzakirə olunacaqdır (McNamara, 2001).

**2. Material və Metod**

Bu tədqiqat 2022-2024-cü illər arasında Bakı şəhərində yerləşən ortodontiya klinikasında aparılmışdır. 50 pasiyent (30 qadın, 20 kişi, yaş aralığı: 12-35) tədqiqata cəlb edilmişdir (Graber, & Vanarsdall, 2012).

| Kriteriya | Məlumat |
|---|---|
| Pasiyent sayı | 50 |
| Cins bölgüsü | 30 qadın, 20 kişi |
| Yaş aralığı | 12-35 |
| Malokluziya növü | I sinif (40%), II sinif (35%), III sinif (25%) |
| Diaqnostika metodları | Klinik müayinə, sefalometrik analiz, panoramik rentgen |
| Müalicə üsulları | Ortodontik aparatlarla müalicə, cərrahi müdaxilə, kombinə edilmiş yanaşmalar |

Pasiyentlər üç qrup üzrə bölünmüşdür (Bishara, 2001):

• 1-ci qrup (I Sinif anomaliya): 20 xəstə – ortodontik müalicə ilə korreksiya edilə bilən hallar.

• 2-ci qrup (II Sinif anomaliya): 15 xəstə – funksional aparatlarla və ortodontik müalicə ilə düzəldilən hallar.

• 3-cü qrup (III Sinif anomaliya): 15 xəstə – ortodontik və ya cərrahi müdaxilə tələb edən hallar.

**3. Etiologiya**

Sinif anomaliyalarının yaranmasına genetik, skelet və funksional amillər təsir edir (Angle, 1899).

| Etioloji Faktorlar | Səbəblər |
|---|---|
| **Genetik faktorlar** | Ailəvi anomaliya halları, çənə sümüyünün inkişaf anomaliyaları |
| **Skelet faktorları** | Çənələrin qeyri-proporsional inkişafı, travmalar |
| **Funksional faktorlar** | Ağız nəfəsi, barmaq əmmə, anormal dil vərdişləri |

Genetik faktorlar anomaliyanın əsas səbəblərindən biridir. McNamara (2001) tədqiqatına görə, II və III sinif anomaliyaların 60%-i irsi xarakter daşıyır.

Funksional faktorlar arasında barmaq əmmə, ağız nəfəsi və dil vərdişləri çənə inkişafına təsir edən əsas amillərdir (Moyers, 1988).

**4. Diaqnostika**

Diaqnostika üçün klinik və radioloji müayinə metodları istifadə olunur.

| Diaqnostik Metod | İstifadə Sahəsi |
|---|---|
| **Klinik müayinə** | Dişlərin və çənə mövqeyinin qiymətləndirilməsi |
| **Panoramik rentgen** | Dişlərin və çənə sümüyünün vəziyyətinin təhlili |
| **Sefalometrik analiz** | Çənələrin qarşılıqlı mövqeyinin təyin edilməsi |
| **3D tomoqrafiya** | Çənə sümüyünün həcmli strukturunu öyrənmək üçün |

Sefalometrik analiz nəticəsində SNA və SNB bucaqları II və III sinif anomaliyalar üçün diaqnostik əhəmiyyət daşıyır.

**5. Müalicə Metodları**

Müalicə anomaliyanın ağırlıq dərəcəsinə uyğun fərdi olaraq aparılır.

**5.1.** I Sinif Anomaliya

- Ortodontik müalicə (çıxan və çıxmayan ortodontik aparatlar, şəffaf kappalar)
- Diş çəkimi (bəzən yer açmaq üçün tələb olunur)

**5.2.** II Sinif Anomaliya

- Funksional aparatlarla müalicə (Herbst, Twin-Block, Frenkel 2)
- Ortodontik breket sistemləri (elastik çəkmə ilə)
- Ortoqnatik cərrahiyyə (Skelet anomaliyaları olan xəstələrdə)

**5.3.** III Sinif Anomaliya

- Breketlər və Class III elastikləri
- Çənənin irəlidə yerləşməsinə qarşı çıxan və çıxmayan ortodontik aparatlarla müalicə
- Cərrahi müdaxilə (Yetkin yaşda skelet problemləri olan xəstələr üçün ortoqnatik cərrahiyyə)

| **Anomaliya Növü** | **Müalicə Metodu** | **Uğur Faizi** |
|---|---|---|
| **I sinif** | Ortodontik müalicə | 90% |
| **II sinif** | Funksional və ortodontik müalicə | 80% |
| **III sinif** | Ortodontik və cərrahi müalicə | 75% |

Müasir texnologiyaların inkişafı ortodontik müalicə metodlarını daha effektiv və komfortlu hala gətirmişdir. Ən son müalicə yanaşmaları aşağıdakılardır (Burstone, & Kiyak, 2000):

- **Şəffaf kappalar (alignerlər)** – Estetik baxımdan daha cəlb edici olan bu metod yetkin pasiyentlər arasında populyarlıq qazanır. Metal breketlərdən fərqli olaraq, şəffaf kappalar daha rahat istifadə edilir və estetik görünüşə daha az təsir edir. Aligner müalicəsi xüsusilə yüngül və orta dərəcəli anomaliyalar üçün uyğun hesab edilir.
- **Mini-implantlar** – Ortodontik çəkmə prosesini asanlaşdırmaq üçün istifadə edilir. Mini-implantlar dişlərin düzgün istiqamətə yönləndirilməsində müvəqqəti dayaq nöqtəsi kimi xidmət göstərir. Onların istifadəsi müalicə müddətini qısaltmağa və daha dəqiq nəticələr əldə etməyə imkan yaradır.
- **3D texnologiyalar və rəqəmsal planlaşdırma** – Ortodontik müalicənin planlaşdırılması və icrasında 3D skanerlər və rəqəmsal modellərdən istifadə olunur. Bu texnologiyalar pasiyentin dişlərinin virtual modelini yaratmağa və müalicə prosesini əvvəlcədən simulyasiya etməyə imkan verir. 3D çap texnologiyası ilə xüsusi fərdi aparatların hazırlanması daha dəqiq nəticələrə gətirib çıxarır.
- **Sürətli ortodontiya texnikaları** – Son illərdə müəyyən texnikalar inkişaf etdirilmişdir ki, bunlar ortodontik müalicə müddətini qısaltmağa kömək edir. Məsələn, diş hərəkətini sürətləndirən mikroinvaziv prosedurlar (piezo-cərrahiyyə, kortikotomiya) istifadə edilə bilər.

Bu yeni müalicə metodları həm müalicə müddətini qısaldır, həm də pasiyentlər üçün daha komfortlu ortodontik həllər təqdim edir.

**6. Sinif Anomaliyalarının Sosial və Psixoloji Təsiri**

Sinif anomaliyaları yalnız funksional deyil, eyni zamanda sosial və psixoloji fəsadlara da səbəb olur. Estetik problemlərə görə pasiyentlər sosial fəaliyyətlərdə çəkingənlik hiss edə bilər. Aparılan araşdırmalar göstərir ki, anomaliyaları olan insanlarda özünə inam dərəcəsi daha aşağı olur.

Bundan əlavə, uşaqlarda və yeniyetmələrdə bu anomaliyalar özgüvən əskikliyinə, psixososial adaptasiya çətinliklərinə və emosional problemlərə yol aça bilər. Xüsusilə, ağır sinif anomaliyaları olan şəxslər üz cizgilərində ki balanssızlıq səbəbindən məktəb və iş mühitində bulinqə və psixoloji təzyiqə məruz qala bilərlər. Müasir ortodontik müalicə metodları bu cür problemlərin qarşısını almağa və pasiyentin həyat keyfiyyətini artırmağa kömək edir (Kapila, 2011).

## Nəticə

Tədqiqat göstərdi ki:

• I sinif anomaliya ən yüksək müalicə uğur faizinə malikdir.

• II sinif hallarda erkən müalicə funksional aparatlarla daha effektlidir.

• III sinif anomaliya yetkin yaşda ortodontik və cərrahi yanaşma tələb edir.

Sinif anomaliyalarının müalicəsində erkən diaqnostika və fərdi yanaşmalar mühüm əhəmiyyət daşıyır. Xüsusilə, uşaqlıq və yeniyetməlik dövründə aparılan ortodontik müdaxilələr skelet və diş quruluşlarının daha təbii şəkildə inkişaf etməsinə kömək edir. Yetkin pasiyentlərdə isə kombinə edilmiş metodların tətbiqi daha yaxşı nəticələr verir.

Ortodontiyada texnologiyanın inkişafı müalicə metodlarının daha effektiv və komfortlu olmasına imkan yaratmışdır. Şəffaf kappalar, mini-implantlar və 3D planlaşdırma kimi innovativ üsullar müalicə müddətini qısaltmağa və nəticələrin keyfiyyətini artırmağa kömək edir.

Gələcək tədqiqatlar sinif anomaliyalarının genetik və ətraf mühit faktorlarının təsirini daha dərindən araşdırmalı, müalicə üsullarının uzunmüddətli effektivliyini qiymətləndirməlidir. Ortodontik anomaliyaların qarşısının alınması və erkən mərhələdə aşkarlanması üçün daha genişmiqyaslı tədqiqatlara ehtiyac vardır.

## Ədəbiyyat

1. Angle, E. H. (1899). Classification of malocclusion. *Dental Cosmos*, 41, 248–264.
2. Burstone, C. J., & Kiyak, H. A. (2000). *Modern developments in orthodontics*. Wiley.
3. Bishara, S. E. (2001). *Textbook of orthodontics*. Saunders.
4. Proffit, W. R., & Fields, H. W. (2018). *Contemporary orthodontics*. Elsevier.
5. McNamara, J. A. (2001). *Orthodontic and dentofacial orthopedics*. Needham Press.
6. Moyers, R. E. (1988). *Handbook of orthodontics*. Year Book Medical Publishers.
7. Graber, T. M., & Vanarsdall, R. L. (2012). *Orthodontics: Current principles and techniques*. Elsevier.
8. Kapila, S. (2011). *Cone beam computed tomography in orthodontics*. Wiley-Blackwell.

DOI: https://doi.org/10.36719/2663-4619/113/237-243

**Tahir Gözəlov**
Bakı, Azərbaycan
https://orcid.org/0009-0004-2137-4420
tahir.g380@gmail.com

# SARS-CoV-2 (Covid 19) virusuna yoluxmuş şəxslərdə ağız boşluğunda baş verən dəyişikliklər

**Xülasə**

2019cu ildən başlayan və hələ də davam edən Covid 19 (Sars-Cov-2) pandemiyası indiyə qədər 7 milyona yaxın insanın həyatına son qoyub. Ümumilikdə isə virusa yoluxanların sayı 650 milyondan çoxdur. Qısa müddətdə sürətlə yayılan virus Ümumdünya Səhiyyə Təşkilatı tərəfindən 12 mart 2020 ci ildən etibarən pandemiya elan edilib. Xəstəliyin müxtəlif insan papulyasiyaları arasında fərqli-fərqli simptomlarına rastlanılıb. Bu məqalədə biz güncəl istinadlara əsasən Covid 19 (Sars-Cov-2) virusuna yoluxmuş şəxslərdə ağız boşluğunda müşahidə olunan simptomları araşdırdıq. Məqalədə PubMed kitabxanası və Google Scholardakı jurnallar da daxil olmaqla 25-dən çox akademik məqalədən, güncəl statistik məlumatlardan və müayinə etdiyimiz xəstələr arasında keçirdiyimiz sorğu məlumatlarından istifadə olunub.

***Açar sözlər:*** *Covid 19 pandemiyası, oral mukoza, disgevziya, xora, qlossit*

**Tahir Gozalov**
Baku, Azerbaijan
https://orcid.org/0009-0004-2137-4420
tahir.g380@gmail.com

# Changes in the Oral Cavity in People Infected With the SARS-CoV-2 (Covid 19) virus

**Abstract**

The Covid 19 (Sars-Cov-2) pandemic, which began in 2019 and is still ongoing, has claimed the lives of nearly 7 million people so far. In total, more than 650 million people have been infected with the virus (23). The virus, which has spread rapidly in a short period of time, was declared a pandemic by the World Health Organization on March 12, 2020. The disease has different symptoms among different human populations. In this article, we examined the symptoms observed in the oral cavity of people infected with the Covid 19 (Sars-Cov-2) virus based on current references. The article used more than 25 academic articles, including journals in the PubMed library and Google Scholar, current statistical data, and survey data among the patients we examined.

***Keywords:*** *Covid 19 pandemic, oral mucosa, dysgeusia, ulcer, glossitis*

## Giriş

Covid 19 (Sars-Cov-2) Coronoviridae ailəsinin Betacoronaviruslar cinsinə mənsub RNT tərkibli virusdur (Şəkil1) .Hava damcı yoluyla yoluxur,əsasən tənəffüs sistemi orqanlarında, həmçinin həzm sistemi orqanlarında müxtəlif dərəcəli simptomlara səbəb olur. Virus hüceyrəyə S1N terminal domeni ilə AÇF-2 reseptoru vasitəsilə adgeziya olunur .Daha sonra Serin proteaza 2 fermenti vasitəsilə bağlayıcı proteyin S kəsilir və virus hüceyrəyə daxil olur. Simptomlar əsasən virusa yoluxduqdan 2-14 gün sonra özünü biruzə verməyə başlayır. Allergen olaraq orqanizmdə immun reaksiyalara səbəb olur, nəticədə neytrofillərin və makrofaqların toxumaya infiltrasiyasından sonra “sitokin fırtınası” adlı fenomen baş verir.İnterleykinlər və başqa sitokinlərin külli miqdarda istehsalı baş verir. Nəticədə orqanizmdə immun sisteminin vəziyyətindən aslı olaraq müxtəlif dərəcəli dəyişikliklərə və simptomlara rastlanır. AÇF-2 reseptoru tənəffüs yolu və ağciyərlər, ağız boşluğu selikli qişası, xüsusilə ağız

suyu vəziləri və dil, eləcə də testislər,damar divarları, böyrək və bağırsaqlar (əsasən 12 barmaq bağırsaq və düz bağırsağın selikli qişası) başda olmaqla digər orqanlarda da geniş rast gəlinir. Dolayısıyla orqanizmdə yaranan simptomlara da əsasən bu hədəf oraqnlarda rast gəlinir (Herrera, Serrano, Roldán, & Sanz, 2020; Xu, H., Zhong, L., Deng, J., Peng, Dan, Zeng, et al., 2020; Santosh, & Muddana, 2020).




**Şəkil 1**.Sars-Cov-2-nin quruluşu. (National Institutes of Health, 2020).

Ağız boşluğu və burun boşluğu virusun orqanizmə əsas giriş qapılarıdır (Şəkil 2). Ağız boşluğunda ağız suyu vəziləri, dil, yanaq və diş ətlərinin epitel hüceyrələrində, xüsusilə keratinizə olmayan ağız boşluğu epitelisinin bazal qatı AÇF 2 reseptorları ilə zəngindir və bu hüceyrələrin hər biri virus üçün hədəf hüceyrələr sayılır (Roeltzsch, Berndt, & Troeltzsch, 2020; Brandão, Gueiros, Melo, Prado-Ribeiro, Nesrallah, Prado, et al., 2020). Daha çox zədələnməyə məruz qalanlar isə dil, dodaqların selikli qişası, damaq və ağız suyu vəzilərinin selikli qişalarıdır (Iranmanesh, Khalili, Amiri, Zartab, & Aflatoonian, 2020; Amorim Dos Santos, Normando, Carvalho da Silva, De Paula, Cembranel, Santos-Silva, et al., 2020). Ağızsuyu özü də birbaşa virus mənbəyi hesab olunur. Nümunələrdən götürülmüş PCR testlərin 97% də pozitiv nəticə alınıb (Lanese, 2020).



**Şəkil 2**. SARS-CoV-2-nin giriş nöqtələrinin yerini göstərən və ağız mukozasının müxtəlif sahələrini göstərən şəkil. Ağız boşluğunun ön görünüşü. (A) Mavi oxlar virusun burun və ağızdan girişini göstərir. (TB)Qoxu epitelinin və dad tumurcuqlarının yeri. (B) Ağız boşluğunda çoxqatlı skuamoz keratinləşmiş epitelin (SSKE) və çoxqatlı skuamoz keratinləşməyən epitelinin (SSNKE) xüsusi yeri. (https://www.informedhealth.org/how-do-the-tonsils-work.html, Institute for Quality and Efficiency in Health Care (IQWiG, Germany), 17 Jan 2019.)

**Tədqiqat**

Ağız boşluğunda baş verən dəyişikliklər və simptomlara müaxtəlif dərəcəli iltihablaşmalar, ödemləşmələr, ağımtıl ləkələr, çatlamış dil, xoralar, dad hissinin itməsi və ya təhrif olunması halları, piqmentasiya, petexiyal şəkilli qansızma ocaqları, spontan qanaxmalar, ağız qoxusu və digər təzahürləri misal göstərmək olar. Əlamətlərin əsas lokalizasiya yerləri labial selikli qişa, dil və damaq nahiyələridir (Worldometer 2023).

**Kserostomiya**. Ağız quruluğu rast gələnən əlamətlərdən biridir. Buna səbəb ağız suyu vəzilərinin epitelial hüceyrələrinin funksional çatışmazlığı, xəstəliyin müalicəsi üçün istifadə olunan dərmanların yan təsiri, maskadan istifadə nəticəsində ağızdan nəfəs alma, həmçinin dad bilmə hissinin itməsi nəticəsində ağız suyu vəzilərinin reflektor olaraq ifrazının azalması və digər səbəblər ola bilər (Zhang, Cheng, Li, Zhang, Yi, Xu, et al., 2016; Thomson, Chalmers, Spencer, & Williams, 1999; Lanese, 2020).

**Disgevziya və agevziya**. Dad hissinin itməsi və təhrif olunması rast gələnən simptomlardandır. Ümumdünya səhiyyə təşkilatının hesabatlarına əsasən xəstələrin 47 %-də dad hissinin itməsi və ya təhrif olması halı baş verir. Buna səbəb həm dad tumurcuqlarının birbaşa zədələnməsi, həm də müvafiq sinirlərin sinir ucluqlarının zədələnməsidir (7.9.10. kəllə sinirləri). Dad itkisinə 20-39 yaş arasında gənclərdə,xüsusilə qadınlarda daha çox rastlanır. Bunun əsas səbəbi reseptorların sayının və aktivliyinin X xromosomu ilə tənzimlənməsi və estrogen hormonunun bu reseptorların sayını artırmasıdır (Okada, 2015; de Araujo, & Simon, 2009).

**Xoralar**. Bəzi xəstələrdə ağız boşluğunda, xüsusilə dilaltı və yanaq nahiyələrində xoralara təsadüf olunur. Buna səbəb immun sisteminin kəskin zəifləməsi və AÇF 2 ingibitorlarının damar divarlarını zədələməsidir (Iranmanesh, Khalili, Amiri, Zartab, & Aflatoonian, 2020; Carreras-Presas, Sanchez, Lopez-Sanchez, Jane-Salas, & Perez, 2020; Sampson, Kamona, & Sampson, 2020).



**Şəkil 3**. Covid 19 pozitiv xəstənin sol dilaltı nahiyəsində xora (27).

**Kovid dili**. Rastlanan klinik simptomlardan biridir. Dildə ödemləşmə və dil məməciklərinin atrofiyası hesabına ləkələr yaranır (Brandão, Gueiros, Melo, Prado-Ribeiro, Nesrallah, Prado, et al., 2020; Iranmanesh, Khalili, Amiri, Zartab, & Aflatoonian, 2020).



**Şəkil 4**. "Covid dili"nin əlamətlərinə dilin səthindəki məməciklərinin iltihabı, şişmiş və iltihablı dil və dişlərin dilin yan tərələrində yaratdıqı izlər daxildir. (British Dermatologists Association / John Wiley and Sons)

**Dişətlərinin iltihabı**. Virusun birbaşa zədələyici təsiri, eləcə də immun sisteminin zəifləməsi nəticəsində bəzi fürsətcil infeksiyaların inkişafı fonunda İL 1, İL 6 və digər sitokinlər hesabına aktiv iltihablaşmalara rastlanır. Həmçinin gigyenik qulluğun qənaətbəxş olmaması səbəbilə də iltihabi əlamətlər yarana və daha da kəskinləşə bilər (Tanaka, Narazaki, Kishimoto, 2016).

**Kavasakiyə bənzər əlamətlər.** Oral mukozada qızarıqlıqlar yaranır. Damar divarlarının zədələnməsi hesabına bu tip dəyişikliklər baş verir (Iranmanesh, Khalili, Amiri, Zartab, & Aflatoonian, 2020; Carreras-Presas, Sanchez, Lopez-Sanchez, Jane-Salas, & Perez, 2020; Cruz Tapia, Peraza Labrador, Guimaraes, & Matos Valdez, 2020).

**Petexiyalar.** Laxtalanma sistemi pozulduğu üçün trombosit miqadarında azalmalar müşahidə oluna bilər. Daha çox udlaq nahiyəsində rastlanır (Brandão, Gueiros, Melo, Prado-Ribeiro, Nesrallah, Prado, et al., 2020; Iranmanesh, Khalili, Amiri, Zartab, & Aflatoonian, 2020).




**Şəkil 6**. A, Dilin sağ yan sərhədində ağrılı xora. B, Fokal eritema/petexiya və üzərində dayaz nekrotik sahə olan sərt damağın ön hissəsi (Brandão, Gueiros, Melo, Prado-Ribeiro, Nesrallah, Prado, et al., 2021).



**Şəkil 7**.Covid 19 əleyhinə peyvənd olunmuş şəxsin damağında yaranmış petexiyal lezyonlar (The Egyptian Journal of Otolaryngology, 37(1), 2021).

**Opportunistik infeksiyaların inkişafı.** Ağız boşluğu ekologiyası pozulduğu üçün Candida albicans və digər fürsətcil patogen orqanizmlərin inkişafı üçün zəmin yaranır. Belə hallar ağız boşluğunun müxtəlif nahiyələrində başqa infeksiya ocaqlarının yaranmasına səbəb olur və müalicə müddətinin uzanmasına gətirib çıxarır.

**Rombvari qlossit və deskvamativ qlossitin ("coğrafi" dil) inkişafı** (Díaz Rodríguez, Jimenez Romera, & Villarroel, 2020; Hathway, 2021).




Şəkil 7. Deskvamativ qlossit (Rəhimova, 2020)

## Nəticə

Covid 19 (Sars-Cov-2) virusuna yoluxmuş şəxslərdə ağız boşluğundakı təzahür formalarından daha çox dad hissinin itikisi və ya təhrifi, immun sisteminin zəifləməsi fonunda fürsətcil infeksiyaların inkişafı, stress və bəzən gigyenik qulluğun zəif olması səbəbilə yaranan iltihablaşmalar, halitoz, xoralar, eritemalar, yayılmış vezikulo-bulyoz dəyişikliklər və nekrotik dəyişiklər rastlanır. Yaşlı şəxslərdə və immundefisiti olan şəxslərdə əlamətlər uzun müddətli,ancaq nisbətən sönük keçir.

Covid 19 (Sars-Cov-2) virusuna yoluxmuş şəxlər arasında apardığımız müayinə və keçirdiyimiz sorğulara əsasən qadınlarla kişilər arasında əlamətlərin rastlanma nisbəti arasında ciddi bir fərq

müşahidə olunmadı. Daha çox rastlanan simptomlar dad itkisi,diş əti iltihablaşmaları və ağız quruluğudur.

## Ədəbiyyat

1. Amorim Dos Santos, J., Normando, A. G. C., Carvalho da Silva, R. L., De Paula, R. M., Cembranel, A. C., Santos-Silva, A. R., et al. (2020). Oral mucosal lesions in a COVID-19 patient: New signs or secondary manifestations? *International Journal of Infectious Diseases*, 97, 326–328. https://doi.org/10.1016/j.ijid.2020.06.012
2. Brandão, T. B., Gueiros, L. A., Melo, T. S., Prado-Ribeiro, A. C. A., Nesrallah, C. F. A., Prado, G. V. B., et al. (2020). Oral lesions in patients with SARS-CoV-2 infection: Could the oral cavity be a target organ? *Oral Surgery, Oral Medicine, Oral Pathology and Oral Radiology*, 131(2), e45–e51. https://doi.org/10.1016/j.oooo.2020.07.014
3. Brandão, T. B., Gueiros, L. A., Melo, T. S., Prado-Ribeiro, A. C. A., Nesrallah, C. F. A., Prado, G. V. B., et al. (2021). Oral lesions in patients with SARS-CoV-2 infection: Could the oral cavity be a target organ? *Oral Surgery, Oral Medicine, Oral Pathology and Oral Radiology*, 131(2), e45–e51. https://www.oooojournal.net/article/S2212-4403(20)31119-6/pdf
4. Carreras-Presas, C. M., Sanchez, J. A., Lopez-Sanchez, A. F., Jane-Salas, E., & Perez, M. L. S. (2020). Oral vesiculobullous lesions associated with SARS-CoV-2 infection. *Oral Diseases*. https://doi.org/10.1111/odi.13382
5. Cruz Tapia, R. O., Peraza Labrador, A. J., Guimaraes, D. M., & Matos Valdez, L. H. (2020). Oral mucosal lesions in patients with SARS-CoV-2 infection. Report of four cases. Are they a true sign of COVID-19 disease? *Special Care in Dentistry*, 40(6), 555–560. https://doi.org/10.1111/scd.12520
6. Díaz Rodríguez, M., Jimenez Romera, A., & Villarroel, M. (2020). Oral manifestations associated with COVID-19. *Oral Diseases*, 26(7), 10. https://doi.org/10.1111/odi.13382
7. Department of Oral Biology, Dr. Gerald Niznick College of Dentistry, Rady Faculty of Health Sciences, University of Manitoba, Winnipeg, MB, Canada.
8. Herrera, D., Serrano, J., Roldán, S., & Sanz, M. (2020). Is the oral cavity relevant in SARS-CoV-2 pandemic? *Clinical Oral Investigations*, 24(9), 2925–2930. https://doi.org/10.1007/s00784-020-03413-2
9. Xu, H., Zhong, L., Deng, J., Peng, J., Dan, H., Zeng, X., et al. (2020). High expression of ACE2 receptor of 2019-nCoV on the epithelial cells of oral mucosa. *International Journal of Oral Science*, 12(1), 8. https://doi.org/10.1038/s41368-020-0074-x
10. Santosh, A. B. R., & Muddana, K. (2020). Viral infections of oral cavity. *Journal of Family Medicine and Primary Care*, 9(1), 36–42. https://doi.org/10.4103/jfmpc.jfmpc_807_19
11. Roeltzsch, M., Berndt, R., & Troeltzsch, M. (2020). Is the oral cavity a reservoir for prolonged SARS-CoV-2 shedding? *Medical Hypotheses*, 146, 110419. https://doi.org/10.1016/j.mehy.2020.110419
12. Iranmanesh, B., Khalili, M., Amiri, R., Zartab, H., & Aflatoonian, M. (2020). Oral manifestations of COVID-19 disease: A review article. *Dermatologic Therapy*, 34(1), e14578. https://doi.org/10.1111/dth.14578
13. Okada, S. (2015). The taste system of small fish species. *Bioscience, Biotechnology and Biochemistry*, 79(6), 1039–1043. https://doi.org/10.1080/09168451.2015.1023251
14. de Araujo, I. E., & Simon, S. A. (2009). The gustatory cortex and multisensory integration. *International Journal of Obesity*, 33(Suppl 2), S34–S43. https://doi.org/10.1038/ijo.2009.70
15. Zhang, C. Z., Cheng, X. Q., Li, J. Y., Zhang, P., Yi, P., Xu, X., et al. (2016). Saliva in the diagnosis of diseases. *International Journal of Oral Science*, 8(3), 133–137. https://doi.org/10.1038/ijos.2016.38
16. Thomson, W. M., Chalmers, J. M., Spencer, A. J., & Williams, S. M. (1999). The Xerostomia Inventory: A multi-item approach to measuring dry mouth. *Community Dental Health*, 16(1), 12–17. http://scholar.google.com/scholar_lookup?author=WM+Thomson&author=JM+Chalmers&auth

or=AJ+Spencer&author=SM+Williams+&publication_year=1999&title=The+Xerostomia+Inventory%3A+a+multi-item+approach+to+measuring+dry+mouth&journal=Community+Dent+Health.&volume=16&pages=12-7
17. Lanese, N. (2020, November 2). COVID-19 infects the mouth. Could that explain patients' taste loss? *Live Science*. https://www.livescience.com/oral-infection-coronavirus-spread.html
18. Sampson, V., Kamona, N., & Sampson, A. (2020). Could there be a link between oral hygiene and the severity of SARS-CoV-2 infections? *British Dental Journal*, 228(12), 971–975. https://doi.org/10.1038/s41415-020-1747-8
19. Tanaka, T., Narazaki, M., & Kishimoto, T. (2016). Immunotherapeutic implications of IL-6 blockade for cytokine storm. *Immunotherapy*, 8(8), 959–970. https://doi.org/10.2217/imt-2016-0020
20. Hathway, R. W. (2021). COVID tongue. *British Dental Journal*, 230(2), 114. https://doi.org/10.1038/s41415-020-1747-8
21. The Egyptian Journal of Otolaryngology, 37(1), 99. (2021). https://doi.org/10.1186/s43163-021-00008-0
22. National Institutes of Health. (2020). *Oral manifestations of COVID-19* [Image]. https://www.ncbi.nlm.nih.gov/books/NBK554776/figure/article-52171.image.f3/
23. Worldometer. (2023, March 28). *COVID-19 coronavirus pandemic*. https://www.worldometers.info/coronavirus/
24. Rəhimova, İ. (2020). Dildə rastlanan deskvamativ qlossit. *ATU stomatoloji klinika*. Dr. Səlimə Məmmədova.

DOI: https://doi.org/10.36719/2663-4619/113/244-248

**Əlirza Fəttayev**
Bakı Dövlət Universiteti
https://orcid.org/0009-0002-2592-0033
a.fhd@mail.ru

# Masallı rayonunun torpaq istifadəçiliyinin təhlili

**Xülasə**

Torpaq ehtiyatlarından səmərəli istifadə hər bir regionun davamlı inkişafı üçün mühüm amildir. Xüsusilə kənd təsərrüfatı sahəsində torpaq resurslarının düzgün idarə olunması məhsuldarlığın artırılması və ekoloji tarazlığın qorunması baxımından əhəmiyyətlidir. Masallı rayonu münbit torpaq ehtiyatlarına və kənd təsərrüfatı üçün əlverişli iqlim şəraitinə malikdir. Məqalədə Masallı rayonunun ərazi bölgüsü, kənd təsərrüfatı torpaqlarının strukturu və istifadə formaları xəritələşdirilərək, əldə olunan nəticələr əsasında təhlil aparılmışdır.

***Açar sözlər:*** *Torpaq istifadəçiliyi, səmərəli istifadə, Masallı rayonu, xəritə,məhsuldarlıq*

**Alirza Fattayev**
Baku State University
https://orcid.org/0009-0002-2592-0033
a.fhd@mail.ru

# Analysis of Land Use in Masalli District

**Abstract**

Efficient use of land resources is a crucial factor for the sustainable development of any region. Proper management of land resources, especially in the agricultural sector, is essential for increasing productivity and maintaining ecological balance. Masalli district possesses fertile land resources and a favorable climate for agriculture. In this article, the territorial distribution, structure of agricultural lands, and forms of land use in Masalli district have been mapped and analyzed based on the obtained results.

***Keywords:*** *Land use, efficient use, Masalli district, map, productivity*

## Giriş

Masallı rayonu geomorfoloji quruluşuna görə 2 hissəyə bölünür. Dağlıq ərazilər və ovalıq ərazilər. Ərazinin böyük hissəsi düzənliklərdən ibarətdir. Rayonun relyef quruluşu torpaq örtüyünün müxtəlifliyinə, kənd təsərrüfatı fəaliyyətinin formalarına, birbaşa torpaq istifadəçiyinə təsir göstərir. Dağlıq və düzənlik ərazilərin fərqli geoloji-struktur xüsusiyyətləri kənd təsərrüfatı, yaşayış məskənləri və infrastrukturun inkişafına təsir edən əsas amillərdir. Bu səbəbdən Masallı rayonunda torpaq istifadəçiliyi hər bir kəndin yerləşmə şəraitinə uyğun olaraq fərqlənir. Dağlıq və təpəlik ərazilərdə torpaq sahələri daha çox yamaclarda yerləşdiyindən, burada iri əkin sahələri yaratmaq çətindir. Bu kəndlərdə əkinçilik əsasən ailə ehtiyaclarını qarşılamaq məqsədilə kiçik fərdi təsərrüfatlar şəklində aparılır. Torpaq sahələri parça-parça kiçildiyi, adda-buddalığın yayılması səbəbindən məhsuldarlıq aşağı düşür.

## Tədqiqat

Torpaq istifadəçiliyinin müasir vəziyyətini təhlil etmək üçün ilk öncə tədqiqat ərazisində torpaqların mülkiyyətə və kateqoriyaya görə bölgüsünü analiz etmək lazıımdır. Belə ki, 1996-cı il torpaq islahatlarının aparılması ilə birlikdə Respublikanın digər əraziləri kimi Masallı rayonunun torpaq fondu da 3 mülkiyyət arasında bölündü. Torpaq fondunun 31,6%-i və ya 22783 ha dövlət mülkiyyətinə, 26,3%-i və ya 18954 ha bələdiyyə mülkiyyətinə, 42,1% və ya 30357 ha isə xüsusi mülkiyyətə

verilməklə bölündü. Masallı rayonunda da ümumilikdə 27996 ha torpaq özəlləşdirilərək yerli xalqa verildi. Adambaşına düşən torpaq sahəsi 0,19 ha olmuşdur (Məmmədova, 2006; Məmmədov, 2002).

**Bölgənin vahid torpaq fondunun mülkiyyət növləri üzrə istifadəçilik strukturu (ha)**

| | Dövlət mülkiyyəti | Bələdiyyə mülkiyyəti | Xüsusi mülkiyyət |
|---|---|---|---|
| Ümumi sahə | 22783 | 18954 | 30356 |
| Əkin | 20 | 1364 | 23603 |
| Çoxillik əkmə | - | 113 | 1290 |
| Biçənək | 177 | 143 | 1828 |
| Örüş | 1049 | 2843 | - |
| Həyətyanı sahə | - | 95 | 3632 |
| Digər torpaqlar | 5314 | 13956 | - |
| Meşə sahələri | 16223 | 440 | - |

Rayonda ayrılmış olan dövlət mülkiyyətində olan torpaqlara dövlət idarələri və müəssisələrinin yerləşdiyi torpaqlar, su fondu torpaqları, meşə fondu torpaqları, dövlətə məxsus kənd təsərrüfatı əraziləri, örüş, biçənək sahələri və s. aiddir. Mülkiyyət bölgüsünün əks olunduğu cədvələ nəzər saldıqda aydın görünür ki, dövlət mülkiyyətinə verilən torpaqların əsasını dövlət meşə fondu torpaqları və otlaq sahələri təşkil edir. Onların xüsusi çəkisi digər kateqoriyalardan daha çoxdur. Meşə fondu torpaqları rayonun qərbində Talış sıra dağlarının yamacı boyunca yayılmışdır. Burada dağətəyi qurşağın sərhəddi 50 m-dən keçir. Ş.F.Mehdiyev öz əsərində Talış dağ sisteminin nəhəng antikloridən ibarət olduğunu qeyd etmişdir. Bu torpaqların qorunması, bərpası və idarə olunması mühüm əhəmiyyət daşıyır. Masallının meşələrində şabalıdyarpaq palıd, palıd, fıstıq, vələs, dəmirağac, şümşad, əzgil, gavalı kimi ağac növləri yayılmışdır. Rayonda örüş sahələrinin ümumi sahəsi 3892 ha-dır və ümumi ərazinin 5,4%-i təşkil edir. Bu torpaq sahələrinin 1049 ha-ı dövlət mülkiyyətinə məxsusdur. Həmçinin Qızılağac Milli Parkının Masallı rayonuna düşən hissəsi də dövlətin ehtiyyat fondu torpaqlarına aiddir. Dövlətin mülkiyyətində olan örüş sahələri hərrac və müsabiqələr vasitəsilə fiziki və hüquqi şəxslərə verilir. Əfsus ki, örüş-otlaq sahələri əsasən rayonda iri şirkətlərə verilir və bu sahələr şirkətlər tərəfindən başqa məqsədlər - əkinçilik, bağçılıq üçün istifadə olunur (Məmmədov, 2007; Mekhtiyev, 1952).

Bələdiyyə mülkiyyətində olan torpaqlara şəhərlərin, qəsəbələrin, kəndlərinin küçələrinin, təsərrüfatdaxili və yerli yolların, idman meydançaların, stadionların, parkların, tarlaqoruyucu meşə zolaqlarının, hidrotexniki qurğuların yerləşdiyi ümumi istifadədə olan torpaqlar və əhalinin mal-qara otarmaq məqsədi ilə istifadə etdiyi örüş sahələrinin torpaqları, fiziki və hüquqi şəxlərin istifadəsində olan torpaqlar və bələdiyyənin ehtiyyat fondu torpaqları aiddir. Bu torpaqların 7,2%-i və ya 1364 hektar sahəsini əkinaltı, 0,6% və ya 113 hektar sahəsini çoxillik əkmələr, 0,75%-i və ya 143 hektar sahəsini biçənəklər, 17,52%-i və ya 3322 hektar sahəsini örüşlər, 19,16%-i və ya 3632 hektar sahəsini həyətyanı sahələr, 2,32% və ya 440 hektar sahəsini isə meşə və ya kollar altındakı torpaqlar aiddir. Əkin, biçənək, çoxillik əkmələrin torpaqlarının böyük qisminin özəlləştirilməsi səbəbindən bu təsərrüfat sahələrinin bələdiyyə mülkiyyətinə ayrılmış hissəsi azdır. Bələdiyyə mülkiyyətində olan əkinaltı sahələr sahibkarlara istifadəyə və ya icarəyə verilmişdir. Bu sahələrdə əsasən dənli bitkilər – buğda, arpa vələmir çəltik və s., günəbaxan, tütün və bir sıra tərəvəzlər yetişdirilir. Bələdiyyə mülkiyyətinə biçənək sahələrinin çəkisi olduqca azdır. Qeyd olunduğu kimi bələdiyyə mülkiyyətinə verilmiş sahələrin sadecə 0,75%-i biçənəkdir. Bələdiyyə mülkiyyəti torpaqlarının əsas hissəsi örüş torpaqlarından ibarətdir. Lakin Masallıda da Respublikanın digər rayonlarında olduğu kimi son illərdə örüş sahələrinin sayı azaldılmışdır. Məhz bu səbəbdən yerli əhali heyvanlarını otarmaq üçün sahə tapma-

dığından əkin və ya biçənək sahələrində otarırlar. Hazırki dövrdə bu Respublika miqyaslı böyük bir problemdir.

Xüsusi mülkiyyətə verilmiş torpaqların böyük bir qismini əkinaltı torpaqlar təşkil edir. Xüsusi mülkiyyətə ayrılmış torpaqların 77,7%- əkin sahələrinə verilmişdir. Yerli əhali öz həyətyanı sahələrində və dövlət tərəfindən verilmiş payıbəlli torpaqlarda əkin sahələrində əsasən dənli bitkilər – buğda, arpa, çəltik və s. yetişdirir. Təsadüfi deyildir ki, hər il rayonda şumlanmış 18 min hektar sahəsnin 12 min hektara yaxın sahəsində taxıl əkilir. Belə ki, 2023-cü ilin statistik göstəricilərinə görə ümumilikdə əkilmiş 11392 hektar dənli və paxlalı bitkilərin 7720 hektarı buğda, 2800 hektarı arpa, 160 hektarı çovdar, 148 hektarı isə çəltik altındadır. Qeyd etdiyimiz kimi rayonda kənd təsərrüfatı istehsalının əsasını çoxillik əkmələr təşkil edir. Xüsusi mülkiyyətdə olan payıbəlli sahələrdə çoxluqda müxtəlif növ sitrus bitkiləri, çay plantasiyaları, meyvə bağları və s. salınmışdır. Yerli əhalinin məşğuliyyətinin əsasını meyvəçilik təşkil edir. Həmçinin qeyd olunmuş payıbəlli torpaqlarda əhalinin istifadəsi üçün biçənək sahələri də ayrılmışdır. Masallının dağlıq kəndlərində biçənəklər mühüm kənd təsərrüfatı resurslarındandır. Çünkü burada heyvandarlıq əhəmiyyətli yer tutur. Rayonda 2167 hektar biçənək sahəsi mövcuddur. Dövlət və bələdiyyələrin biçənək sahələrilə yanaşı yerli əhali pay torpaqlarının bir qismini ot biçimi məqsədilə işlədir. Biçənək sahələri ümumi xüsusi mülkiyyətə verilmiş ərazinin 6,02%-i təşkil edir. Respublikanın digər rayonlarında olduğu kimi Masallı rayonunda da ildən-ilə bələdiyyə torpaqlarının özəlləşdirilməsi hesabına xüsusi mülkiyyətə verilmiş torpaqların çəkisi artmağa davam edir.

Masallı rayonunun torpaq fondunun mülkiyyət formalarına bölgüsü, ərazidə torpaq ehtiyatlarının müxtəlif məqsədlərlə istifadəsini müəyyənləşdirir. Bu bölgü rayonun bütün kənd və qəsəbələrində özünü göstərir və yerli torpaq istifadəsi sisteminin ümumi strukturunu formalaşdırır. Ümimiyyətcə Masallı rayonunda relyefin müxtəlifliyi ilə əlaqədar olaraq hər bir kənddə torpaq istifadəçiliyi fərqli istiqamətdə inkişaf etmişdir. Dağlıq və təpəlik ərazilərdə torpaq sahələri daha çox yamaclarda yerləşdiyindən, burada iri əkin sahələri yaratmaq çətindir. Bu kəndlərdə əkinçilik əsasən ailə ehtiyaclarını qarşılamaq məqsədilə kiçik fərdi təsərrüfatlar şəklində aparılır. Rayonun dağlıq bölgələrində örüş və otlaq sahələri daha geniş yayılmışdır. Əkinçilik üçün yararlı torpaqlar məhdud olduğundan maldarlıq və qoyunçuluq bu ərazilərdə yaşayan əhali üçün əsas təsərrüfat sahələrindəndir. Rayonun torpaq istifadəçiliyini analiz etmək üçün ən əlverişli kənd Miyankü kəndidir. Kənd dağ ətəyində yerləşdiyindən öz tərkibində həm dağ həm də nisbətən daha düzən əraziləri birləşdirir. Kənd bir növ rayonun kiçik bir təsviridir. Dağ ətəyində mürəkkəb relyef quruluşuna malik olan torpaq sahələrində əhali mal-qarasını otarır, əkinə yararlı sahələrdə isə müxtəlif kənd təsərrüfatı məhsulları yetiştirilir. Müstəqilliyin bərpa edilməyi dövrdə kənddə olan çay plantasiyaları və sitrus bağları ləğv edilmişdir. Ondan öncə kəndlilərin əsas qazanc yeri məhz çayçılıq və sitrus meyvəçilik sahələri idi. Hazırki dövrdə kənd təsərrüfatını inkişaf etdirmək üçün çalışılır. Belə ki, kələm, tütün əkilir, çayçılığı dirçəltmək üçün tədbirlər görülür.

Miyankü inzibati ərazi dairəsi mərkəz Miyankü kəndi olmaqla Miyankü, Kubin və Nəzəroba kəndlərini birləşdirir. Miyankü inzibati ərazi dairəsinin ümumi sahəsi 703 hektardır. 2023-ün statistik göstəricilərinə görə bölgədə təsərrüfatların sayı qeyd edilən ildə 627 olmuşdur. Kənd ərazisindən quni, istusu və dərindərə çayları axır. Bu çaylar gursulu olmadığından onların qarşısında kənd təsərrüfatında suvarma məqsədi ilə istifadə etməkdən ötrü bəndlər tikilmişdir. Dərindərə çayının üstündə beş ədəd su bəndi inşa edilmişdir. Keçmişdən bəri kənd camaatı kəndin çaylarında balıq tutmuşlar. Bölgənin torpaq istifadəçiliyi xəritəsinə nəzər salsaq bölgənin kənd sərhədlərindən kənarda 2 ayrı hissəsinin də olduğunu görərik. Bu sahələr Miyankü kəndinin sərhədlərinə aid edilir. Qeyd edilən sahələr kəndlilər tərəfindən örüş məqsədilə heyvanları otarmaq üçün istifadə olunur. Rayonun ümumi ərazinin 29 hektarı dövlət, 261 hektarı bələdiyyə, 413 hektarı isə xüsusi mülkiyyətdədir.




Xüsusi mülkiyyətdə olan torpaqları əhalinin yaşayış yerləri və pay torpaqları təşkil edir. Statistik göstəricilərə görə rayonda 2023-cü idlə Əhalinin xüsusi mülkiyyətində 983 baş iri buynuzlu, 561 baş xırda buynuzlu mal-qara qeydə alınmışdır. Ərazidə 4 ədəd ferma mövcuddur. Fermalar örüş sahələrinin daxilində yaradılmışdır (Məmmədov, 2012 Rüstəmov, 1960).

Miyankü inzibati ərazi dairəsi mərkəz Miyankü kəndi olmaqla Miyankü, Kubin və Nəzəroba kəndlərini birləşdirir. Miyankü inzibati ərazi dairəsinin ümumi sahəsi 703 hektardır. 2023-ün statistik göstəricilərinə görə bölgədə təsərrüfatların sayı qeyd edilən ildə 627 olmuşdur. Kənd ərazisindən quni, istusu və dərindərə çayları axır. Bu çaylar gursulu olmadığından onların qarşısında kənd təsərrüfatında suvarma məqsədi ilə istifadə etməkdən ötrü bəndlər tikilmişdir. Dərindərə çayının üstündə beş ədəd su bəndi inşa edilmişdir (Məmmədov, 2002). Keçmişdən bəri kənd camaatı kəndin çaylarında balıq tutmuşlar. Bölgənin torpaq istifadəçiliyi xəritəsinə nəzər salsaq bölgənin kənd sərhədlərindən kənarda 2 ayrı hissəsinin də olduğunu görərik. Bu sahələr Miyankü kəndinin sərhədlərinə aid edilir. Onlardan biri kəndin hüdudlarından xeyli uzaqda Mahmudavar kəndinn sərhəddindədir. Qeyd edilən sahələr kəndlilər tərəfindən örüş məqsədilə heyvanları otarmaq üçün istifadə olunur. Rayonun ümumi ərazinin 29 hektarı dövlət, 261 hektarı bələdiyyə, 413 hektarı isə xüsusi mülkiyyətdədir. Xüsusi mülkiyyətdə olan torpaqları əhalinin yaşayış yerləri və pay torpaqları təşkil edir. Statistik göstəricilərə görə rayonda 2023-cü idlə Əhalinin xüsusi mülkiyyətində 983 baş iri buynuzlu, 561 baş xırda buynuzlu mal-qara qeydə alınmışdır. Ərazidə 4 ədəd ferma mövcuddur. Fermalar örüş sahələrinin daxilində yaradılmışdır (Məmmədov, Xəlilov, Məmmədova, 2009).

Xəritədən aydın seçilir ki, kəndin torpaq örtüyünün böyük hissəsini kənd sakinlərinə verilən pay torpaqları təşkil edir. Lakin bu torpaq sahələrindən kifayət qədər intensiv istifadə olunmur. Bu torpaq sahələrində durğunluq aydın şəkildə müşahidə olunur. Belə ki, kəndlilər torpaqdan düzgün istifadə etmir, əkin-biçin işlərini aparmır və bu səbəbdən bu sahələr şumlanmır. Torpaqların böyük əksəriyyəti baxımsızlıqdan kollarla örtülmüşdür. Bununla yanaşı bu sahələrdən heyvanları otarmaq üçün də istifadə olunur ki, bu zaman torpağın üst qatı tamamilə məhv olaraq münbitliyini itirir. Kənd təsərrüfatı məhsullarının istehsalı əsaəsn kəndlilərin həyətyanı sahələrində yetiştirilirdi. İstifadə olunan pay torpaqlarında əsasən buğda və çəltik isə sadecə əkilirdi. Lakin son illərdə pay torpaqlarıının da intensiv istifadəsinə başlannılmışdır. 2019-2020-ci illərdə kənddə pay torpaqlarında yenidən çay əkininə, subtropik bitkilər olan apelsin və mandarin ağaclarının əkiminə başlanılmışdır. İlkin olaraq

5 hektar sahə çay əkini üçün ayrılmışdır. Gələcəkdə bu sahənin 15 hektara qədər artırılması nəzərdə tutulur. Bundan başqa rayon ərazisində əhalinin ənənəvi əkin sahələrindən biri olan tütünçülük müxtəlif səbəblərdən 2001-ci ildən etibarən dayandırılmışdı. Rayon səviyyəsində 2016-cı ildə yenidən bərpa edilərək 14 hektar sahədə yenidən tütün istehsalına başlamışdır. Miyanku kəndində də 1 hektar tütün plantasiyası salınmışdır ("Azərbaycanın kənd təsərrüfatı" Statistik məcmuə, 2024).

## Nəticə

Masallı rayonunda torpaq istifadəçiliyinin müasir vəziyyəti göstərir ki, mövcud torpaq resurslarının idarə olunması və istifadəsi bir sıra problemlərlə qarşılaşır. Bir çox sahələrdə düzgün, səmərəli formada istifadə olunmadığından torpaqların deqredasiyası və məhsuldarlığın azalması müşahidə olunur. Dağlıq ərazilərdə heyvandarlıq və kiçik təsərrüfatların üstünlük təşkil etməsi, düzənlik ərazilərdə isə əkinçiliyin intensivləşməsi rayonun iqtisadi strukturuna təsir edir. Bununla belə, torpaq resurslarının davamlı səmərəli istifadəsi üçün müasir aqrotexniki tədbirlərin geniş tətbiqi, eroziya və deqredasiya risklərinin azaldılması əsas prioritetlərdən biri olmalıdır. Gələcəkdə Masallı rayonunda torpaq istifadəsinin səmərəliliyini artırmaq üçün ekoloji balansı qoruyan yanaşmalar və müasir kənd təsərrüfatı texnologiyalarının tətbiqi əsaslı şəkildə genişləndirilməlidir. Bu, həm məhsuldarlığın artırılmasına, həm də uzunmüddətli dayanıqlı inkişafını təmin edəcək.

## Ədəbiyyat

1. "Azərbaycanın kənd təsərrüfatı" Statistik məcmuə. (2024). Bakı. Məmmədova, S. Z. (2006). *Azərbaycanın Lənkəran vilayəti torpaqlarının ekoloji qiymətləndirilməsi və monitorinqi*. Bakı: Elm, 372.
2. Məmmədov, Q. Ş. (2002). *Azərbaycanın torpaq ehtiyatları*. Bakı: "Elm".
3. Məmmədov, Q. Ş. (2007). *Azərbaycanın torpaq ehtiyatlarından səmərəli istifadənin social-iqtisadi və ekoloji əsasları*. Bakı: "Elm".
4. Məmmədov, M. Ə. (2012). *Azərbaycanın Hidroqrafiyası.* Bakı: "Təhsil» NPM, 254.
5. Rüstəmov, S. H. (1960). *Azərbaycan SSR-in çayları və onların hidroloji xüsusiyyətləri*. Bakı: Elm, 196.
6. Mekhtiyev, Sh. F. (1952). *Geologiya Azerbaydzhana*. CH. l. Geomorfologiya. Gl. 3. Izd-vo an CCR.
7. Məmmədov, Q. Ş., Xəlilov, M. Y., Məmmədova, S. Z. (2009). *Azərbaycan Respublikasının Ekoloji Atlası*. Bakı: Kartoqrafiya Fabriki, 156.
8. Məmmədov, Q. Ş. (2002). *Azərbaycanda torpaq islahatı: hüquqi və elmi-ekoloji məsələlər*. Bakı: Elm, 412.

DOI: https://doi.org/10.36719/2663-4619/113/249-252

**Madina Rustamzadeh**
Bakı State University
https://orcid.org/0009-0004-9713-292X
medine.rustemzade021@gmail.com

# Influence of Single Nucleotide Polymorphisms on Expression of Human Genes

## Abstract

The article is devoted to the study of the influence of single nucleotide polymorphisms on gene expression in humans using two families (alpha and beta) of globin genes as an example. The presence of numerous SNPs and indel in potential promoter elements in the 4 studied globin genes shows that some genetic causes of clinical complications are associated with mutations in non-coding regions of the genes, which suggest that some results obtained in this work can be used to assess the functional role of some SNP. Currently, the widespread development of high-performance techniques makes it possible to measure the parameters of the whole genome, transcriptome, and proteome in one experiment. Highly organized DNA chip and transcriptome technologies allow simultaneous study of the dynamics of expression of tens of thousands of genes.

***Keywords:*** *gene expression, single nucleotide polymorphisms, DNA, transversions, RNA*

**Mədinə Rüstəmzadə**
Bakı Dövlət Universiteti
https://orcid.org/0009-0004-9713-292X
medine.rustemzade021@gmail.com

# Tək nukleotid polimorfizmlərinin təsiri insan genlərinin ifadəsi

## Xülasə

Genom miqyaslı yüksək texnologiyaların müasir tibbdə tətbiqi və fərdiləşdirilmiş yanaşmanın əsasları.

Müasir biologiya və tibb elmlərində yüksək məhsuldarlığa malik texnologiyaların sürətli inkişafı, tək bir eksperiment çərçivəsində bütöv genomun, transkriptomun və proteomanın parametrlərinin eyni vaxtda öyrənilməsinə imkan yaratmışdır. Yüksək təşkilatlanmış DNT-çip (microarray) və transkriptom analiz texnologiyaları on minlərlə genin ekspressiya dinamikasını paralel şəkildə araşdırmağa şərait yaradır. Bu isə hüceyrə və toxuma səviyyəsində genetik aktivliyin sistemli şəkildə izlənilməsinə imkan verir.

Bununla yanaşı, yüksək ayırdetmə qabiliyyətinə malik kütləvi spektrometriya metodları RNT və zülalların konsentrasiyalarında baş verən dəyişiklikləri dəqiq müəyyən etməyə, eləcə də aşağı molekullu metabolitlərin axınını (metabolik flux) tədqiq etməyə imkan verir. Bu cür kompleks yanaşmalar hüceyrəvi sistemlərin vəziyyətini tam və dinamik şəkildə qiymətləndirmək üçün əlverişli mühit yaradır.

***Açar sözlər:*** *gen ifadəsi, tək nükleotid polimorfizmləri DNT, transversiyalar, RNT*

## Introduction

Modern methods of high-resolution mass spectrometry make it possible to observe changes in the concentrations of RNA and proteins, and study the flow of low-molecular compounds. Modern genome sequencing technologies (new generation sequencing technologies) provide an inexpensive and effective way to resequence human genomic DNA, and their values are constantly decreasing. Such technologies allow for the transition to so-called "personalized medicine", which takes into

account the genomic characteristics of each patient during treatment (genetic predisposition to various diseases, effects of various drugs, etc.

**Research**

20 years ago, when the human genome was read and presented to the scientific community, it was assumed that the content of the genome (organization and expression) would soon be clarified and lead to great advances in medicine. However, this "euphoria" soon disappeared - scientists realized that it would take decades to identify the functional elements of the human genome. There are a huge number of variations of alleles of various genes in the human genome, most of which are single nucleotide polymorphisms (SNPs, snips, or SNP- Single Nucleotide Polymorphism). Approximately 1 SNP per 1,000 bp, which means that one person's genome differs from another in 3 million positions. Depending on whether SNPs are found in SCPs (synonymous and non-synonymous) or in introns, they alter the expression of many genes and can be a source of changes in gene functions, and can increase the likelihood of developing various complex diseases. The definition of SNP is a powerful tool in the implementation of programs for the genetic screening of large human populations (Baranov, Kiselev, 2005).

Nowadays, more than 324 million single nucleotide polymorphisms (SNPs; Single nucleotide polymorphism, Single Nucleotide Polymorphism, SNP) and short (no longer than 50 bp) inertia/index (indel) polymorphism data have been collected. In the last 15 years, the study of the relationship of such variations with certain functions, genetic diseases, and clinical symptoms has become widespread and has yielded a number of important and interesting results. Such association studies can be performed on individual genes, a family of genes, or on the genome as a whole (Puzyrev, 2003).

On the other hand, it is known that the first and in most cases a crucial step in the expression of genetic information is transcription. The key "players" in transcription management include (1) promoters and (2) DNA binding Sites for transcription Factors (TFBS). TFBS are usually short DNA regions of 5-15 nucleotides, and the mutations occurring in them significantly affect their activity. Thus, the identification of possible associations between SNPs and promoter elements may be one of the most effective approaches in identifying the regulators of transcription related to genetic information (Kolchanov, Goncharov).

The purpose of this work is to study the effect of single nucleotide polymorphisms on human gene expression using the example of two families (alpha and beta) of globin genes. To achieve this goal, it was planned to study the following issues: 1. Comparative statistical analysis of the content of the sets SNP/indel according to the selected globin gene in humans available in dbSNP. 2.The search for motifs is known as TFBS in the 5' regions of globin genes and search for the association between SNP/indel and found TFBS motifs (linking variation to TFBS sequences). 3. Search for promoters in the 5' regions of globin genes and the association between potential promoters and known as SNPs/indel (Shakhmuradov, Likhoshva, Ivanisenko, 2008).

Scientific novelty of the research. Based on the use of software components: -mutations occurring in the promoter regions of HBA1, HBA2, HBB and HBD genes (polypeptides of alpha and beta globin genes) have been identified. -shows variations of SNP/indel collected from dbSNP resources -it was found that out of 5,454 SNP/indel variations of HBA1, HBA2, HBB and HBD genes, only 310 (24, 55, 221 and 10) mutations have some pathological effect and 183 (28, 22, 132 and 1) mutations are neutral -it is shown that out of 5,454 variations, 4,961 (approximately 91%) are not functional -it was found that out of 262 variations having a pathological effect are represented in DNA coding sequences, 25 represent 5' NTO , 23 represent introns -22 statistically nonrandom motifs and TFBS were identified in the 5' regions of each of the HBA1, HBA2, HBB and HBD genes (El-Maarri, Herbiniaux, Graw, 2005). At least 1 SNP is observed in 26 and 16 motifs (respectively)/ indel -potential promoters have been found in the 5' region. Including the HBA1, HBA2 genes have 2 bidirectional promoters, and the HBB and HBD genes have 1 unidirectional promoter. -using theoretical SNP/indel data, transitions and transversions occurring in introns and TFBS associated with functional changes in coding and non-coding regions of globin genes have been identified. Among the practical applications, we note the research of human gene expression (Bagchi, Iyer,

